# QURAN VƏ QİYAMƏT

(Tur surəsinin təfsiri)

Ayətullah Seyyid
Əbdülhüseyn Dəstğeyb

# Mündəricat

## TUR surəsinin təfsiri

### KİTAB HAQQINDA

BİSMİLLAHİR–RƏHMANİR–RƏHİM

QURAN

VƏ QİYAMƏT

Tur” surəsinin təfsiri“

ŞƏHİD AYƏTULLAH SEYYİD ƏBDÜLHÜSEYN DƏSTĞEYB

səh:۱

### GİRİŞ

Müasir dövrün ən mühüm ictimai və fərdi problemləri dinsizlikdən, əqidə zəifliyindən qaynaqlanır. Çünki Allah haqqında heç bir anlayışımız yoxdur, qəlblərimiz şeytan .yuvasına çevrilib, günlərimizi dünyanın aldadıcı, yalançı əyləncələri ilə keçiririk

Dünyanı iki əlli tutub axirət aləmindən üz çevirməyin nəticəsində kəskin, həlakedici xəstəliklər yaranır hərislik, həsəd, kin və s. kimi mənfi xislətlərin hamısı maddi mənfəət əldə etmək naminə baş verir. Allahı unutduğumuz üçün mənfur çəkişmələr, rəqabətlər bizi fitnə-fəsada, hətta ölümə, fənaya doğru sürükləyir. Buna görə də həyat tərzi çətinləşir, öz mahiyyətini itirir. Bu dərdlərin dərmanı Allaha və Qiyamət gününə iman gətirməkdən ibarətdir. Əgər insan Qiyamət günündə rəftarı, danışığı, əqidəsi haqqında soruşulacağına, dediyi sözlərin hamısının yazılmasına, yaxşı və pis işlərinin ən kiçiyinin belə qeyd elilməsinə inanırsa, necə ola bilər ki, öz əqidəsində, hərəkətində, danışığında e"tinasızlıq etsin?! Şübhəsiz ki, belə bir iddiaya malik olan şəxs, hətta qarışqanı da incitməz, əlindən ancaq xeyir iş gələr, təcrübəli tacir kimi öz zərər və mənfəətini yaxşı ayırd edər. Nəticədə öz xeyrinə olan işlərə doğru hərəkət edib, ziyanlı işlərdən .uzaqlaşar

Başqa bir məsələni xatırlatmaq istəyirəm. Elm və texnika inkişaf etmiş müasir dünyamızda xalqlar ürəksıxıcı maddiyyatdan təngə gəlib, yavaş-yavaş başa düşürlər ki, əgər mənəviyyata əhəmiyyət verməsələr əzab-əziyyətlə dolu olan heyvani, həyatın daha dəqiq desək, mənasız və puç yaşayışın heç bir nəticəsi olmayacaq. Məhz buna görə də dini təbliğatlar layiqincə yerinə yetirilib şəxsi qərəzlər yaddan .çıxarılmayınca insanlar mənəviyyata can atmayacaqlar

İnsanların qəlblərinə iman nurunu salmaq, Qiyamətin haqq olmasını inandırmaq üçün yalnız kamil mənəviyyət yollarından istifadə etmək lazımdır. Çünki maddi maneələrin, məşğuliyyətlərin həddindən artıq çox olmasına görə pis əməllərdən, çirkinliklərdən uzaqlaşmaqda sadə və adi təbliğatlar çox da böyük rol oynamır. Əlbəttə böyük əmanət olan Qurani-Məciddən, İslam Peyğəmbəri səlləllahu əleyhi və alihi və səlləm-in özündən sonra əbədi mö"cüzəsi

olan bu kitabdan lazımınca bəhrələnsək, onun nurlu ayələri saf və teşnə qəlbləri hidayət edər. Tarixdə bu cür nümunələrlə çox rastlaşmaq olur. Bəzən elə olur ki, insan Qurani-Kərimin hətta bir ayəsini oxumaqla öz şəxsi yaşayışı üçün seçdiyi üslubu .tamamilə dəyişir və ömrünün axırına qədər düz yolda addımlayır

Buna əsasən qərara alındı ki, Quranın bəzi surələrində bəhs olunmuş ilahi dünyagörüşü, məbdə və məad haqqında Həzrəti Ayətullah Dəstğeybin tədris etdiyi təfsirlər çap olunsun. Onlardan biri də əlinizdəki kitabdır. Kitabı oxuduğunuza görə, siz də bu ciddi və məs"uliyyət doğuran işdə şəriksiniz. Bu mövzuda hazırlanmış kitabları mümkün qədər öz dost-tanşlarınıza təqdim edin, onları Qiyamətin haqq olduğuna .inandırıb pis əməllərdən çəkindirin

şə"ban, ۱۳۹۶-cı il (hicri qəməri), Şiraz, Seyyid Məhəmmədhaşim Dəstğeyb ۲۰

## TUR" SURƏSİNİN TƏFSİRİ"

### TUR" SURƏSİNİN AXİRƏT VƏ DÜNYA HAQQINDAKI XÜSUSİYYƏTLƏRİ"

Peyğəmbəri Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm)-dən "Tur" surəsi barədə belə rəvayət olunur: "Hər kəs bu surəni oxusa

Allah-Taala onu Cəhənnəm odundan qoruyar və Cənnəti ona qismət edər.” İmam Baqir əleyhis-salamdan da aşağıdakı hədis nəql olunur: “Hər kəs “Tur” surəsini oxusa Allah-Taala ona dünya və axirət xeyrini nəsib edər. Dünya xeyri sağlamlıq, axirət xeyri ”.isə bağışlanmaqdan ibarətdir

Ey Rəbbimiz! Dünya və axirətdə bizə yaxşılıq əta et və bizi Cəhənnəm odunun“ ”!əzabından qoru

Bu surənin xüsusiyyətlərindən biri də budur ki, əgər həbsdə olan bir kəs bu surəni lazımı mərifətlə oxusa, zindandan xilas olar. Həmçinin bu surəni oxumaq insanı səfərdəki bəlalardan qurtarar. Əlbəttə sadalanan bu xüsusiyyətlər insanın zahiri üçündür. Amma bu surənin həqiqi təsiri qəlbin cəhalət, qəflət və s. kimi ruhi xəstəliklərdən şəfa tapması, sağalmasıdır. Elə bil ki, əkinçi buğda əkir, amma buğdanın arasında arpa da bitir. Bu ayənin dünyəvi faydası həmin arpaya bənzəyir, lakin buğda onun axirət faydasıdır. Müasir xalqların əksəriyyətinin bədbəxtçiliyi Qurandan uzaq düşmələridir. İmam Riza əleyhis-salam buyurur: Mən üç gün ərzində bir dəfə Quranı xətm edirəm. Üç gündən də tez xətm edə bilərəm, amma onun ayələrində təfəkkür etdiyimə görə bu cür oxuyuram. Quran oxuyanlar Qiyamət günündə Quranı sağ əllərində tutarlar; necə ki, şərab içənlər Qiyamət günündə şərab şüşəsini əllərində tutarlar, tənbur (musiqi aləti) çalanlar da bu cür olarlar. Əfsuslar olsun ki, insan .faydasız sözləri dilinə gətirir

.Bu müqəddimədən sonra “Tur” surəsinin təfsirinə başlayırıq

Quranın ən əzəmətli ayələrindən biri də “bismillahir-rəhmanir-rəhim”dir və bu ayə Qurani-Məcidin “Tövbə surəsi istisna olmaqla bütün surələrinin tərkibinə daxildir. Xüsusilə namazda bunu nəzərə almaq vacibdir. Bədbəxtçilikdən bəziləri “bismillah” ayəsini surənin tərkib hissəsindən saymır, namazda da onu demirlər. Şeytan onların qəlblərinə elə nüfuz edibdir ki, onsuz da puç olan əməllərini daha da puç edirlər. Amma həqiqi Mömin bütün hallarda, hər vaxtda, hər yerdə, işə gedəndə, evə qayıdanda və hətta cinsi əlaqəyə başlayanda belə “bismillah” deyir. Məhz buna görə də şeytan onun .işlərinə nüfuz edə bilmir

.º kəlməsindəki “vav” and içmək üçündür

Yəni and olsun “Tur” dağına. Fəsahət və bəlağət elminə aid olan qaydalardan biri odur ki, danışan şəxs dinləyicilərin onun sözünü eşidib qəbul etməsi üçün ürəkdən and içsin. And içmək hər hansı məsələnin əhəmiyyətini daha da təkidləndirir. Məsələn, ata övladını tərbiyə etmək üçün əvvəl onunla mülayim danışır, sonra ciddi və təkidlə, daha ”!sonra isə and içərək deyir: “Vallah, bu iş pis işdir

Tur” surəsində də Allah-Taala bir neçə dəfə and içir, təkid edərək and içdiyi şeyin “ böyük əhəmiyyətə malik olduğunu başa salmaq istəyir. Burada and həmin şeyin .əzəmətli olması üçündür ki, insan mövcudatın Xaliqinin əzəmətini tanıyıb dərk etsin

## TUR”–DAĞ MƏNASINI DAŞIYIR“

Bu surədə Allah-Taalanın and içdiyi şeylərdən biri “tur”dur. “Tur” nə deməkdir? Bu haqda bir neçə ehtimal vardır ki, biri də dağ mənasındadır. Bu məna şerlərdə də işlənibdir. Allah-Taalanın dağa and içməsinin səbəbi, onun zahiri əzəmətidir. Bəşər dərindən fikirləşsə, dağın necə də əzəmətli məxluq olmasını başa düşər. Məsələn, bu möhkəm daşların arasında müxtəlif otların, bitkilərin bitməsi, meyvələrin yetişməsi bu qəbil işlərdəndir. Müşahidə etdiyimiz saysız-hesabsız dağ meyvələrinin toxumunu daşın arasında kim əkib, kim onu cücərdibdir? Bahar fəslində bəzi dağlarda necə də gözəl güllər bitir və bəşər onun ətrindən bəhrələnir. Həmçinin başqa faydalı qazıntılar dağdan hasil olur. Dağların başqa əzəməti onun ətəyindən axan sulardır, bəzi .dağlardan göz yaşı kimi ayna bulaqlar axır

## DAĞLAR MİSMAR nbsp;KİMİ YER KÜRƏSİNİ SAXLAYIR

Mövla Əliyyibni Əbu Talib əleyhis-salam buyurur: “Dağlar mıx kimi yer kürəsini ”.saxlayır. Əgər dağlar olmasaydı yer kürəsi parça-parça olardı

Yer kürəsi günəş ətrafında olan hərəkətində hər saniyədə dörd fərsəx (٣٠ km) yol gedir. Əgər dağlar olmasaydı belə bir sürətlə hərəkət edən yer kürəsi parça-parça .olar, torpağı fəzaya dağılar və məhv olardı

Yer kürəsinin öz ətrafında fırlanması da çox təəccüblüdür. Bunların hamısını, yer kürəsinin müxtəlif hərəkətləri ilə yanaşı nəzərə alsaq görərik ki, dağlar olmasaydı yer .kürəsində heç bir əmin-amanlıq, aramlıq olmazdı

Dağ”, “Tur” kəlməsinin mənalarından biridir və biz bunu eşidəndə bütün dağları“ nəzərdə tuta bilərik. Tur kəlməsinin başqa bir mənası yalnız Həzrəti Musa əleyhis-salamın ibadət üçün getdiyi “Tur” dağına aiddir. Bu dağ Şamla (indiki Suriya) Mədyən arasında yerləşir. Bəzi müfəssirlər buyururlar ki, “Tur” kəlməsi böyük dağ deməkdir. .Bəziləri isə buyurur ki, “Tur” “tarə” kəlməsindən alınıbdır

## HƏQİQİ TUR İMAM əleyhis–salamdır

Tur” kəlməsinin batini mənası hər zamanın İmamı deməkdir. Bizim zamanımızda“ onun həqiqi və batini mənası on ikinci imamımız Həzrət Höccət ibnil Əsgəri Sahibəz-zəman əleyhis-salamdır (١١-ci İmamımız İmam Həsən Əsgəri əleyhis-salamın oğlu və on ikinci imamımız İmam Məhdi zəmanəmizin sahibidir.) Yəni necə ki, dağ olmasaydı yer kürəsi parça-parça olardı, eləcə də əgər bir anlıq imam olmasa bütün aləm bir-birinə dəyər. “Nüdbə duasında Allahdan əsrimizin imamının tezliklə zühur etməsini diləyir, ona xitabən deyirik: “Yəbnə Yasinə vəz-Zariyat, yəbnət-Turi vəl-Adiyat” yəni “ey Əliyyibni Əbi Talibin oğlu! Sən elə bir mövcudsan ki, dağ olmasa yer məhv olduğu kimi, sən də olmasan dünya dağılıb məhv olar.” Allah-Taala burada əzəmətli və böyük .bir mövcuda and içir

## BAŞQA BİR BÖYÜK MÖVCUD

Kitabun məsturun”un mənası əvvəldən axıra qədər səliqə ilə tənzimlənmiş, sətir-sətir“ tərtibə salınmış, yazılmış kitabdır. Yəni, and olsun tərtiblə yazılmış kitaba! Buradakı kitab müxtəlif kitablara işarə ola bilər. O cümlədən Tövrat, Qurani-Məcid və dünyanın əvvəlindən Qiyamətə qədər bütün hadisələrin toplusu olan Lövhi-məhfuzdur. Lövhi-məhfuzdan söz düşdüyünə görə yaxşı olardı ki, bu lövhdə yazılmış cümləni qeyd edək. Orada Allah tərəfindən yazılıb: “Qüdrətli qələmlə yazılmış bu

lövh dəyişilməzdir. Hər kəs “La ilahə illəllah, Mühəmmədun Rəsulullah” şəhadətini ”.desə, onu Cənnət əhlindən etməyi özümə vacib bilirəm

Hafizə qüvvəsi də “kitabi məsturdur.” “Kitabi məstur”un başqa mənası insanın nəfsinin lövhüdür. Bu lövh ilahi bir “kitabi məstur”dur (yazılmış kitab). İnsanın bütün eşitdikləri, öyrəndikləri və əməllərinin hamısı həmin lövhdə qeydə alınır. Hətta keçmişdə baş verib unudulan hadisələr də lövhi-məhfuzda qeydə alınıbdır. Mən bilmirəm bu lövh nə qədər .böyükdür ki, hər şey orada yazılır, qeydə alınır

**(ƏN MÜHÜM KİTAB–NAMEYİ–ƏMALDIR (ƏMƏLLƏRİN YAZILDIĞI KİTAB**

Kitabi məstur”un mənalarından biri də nameyi-əməldir. Bədəninin hər hansı bir üzvü“ ilə yerinə yetirdiyin iş, gördüklərinin və eşitdiklərinin hamısı, hətta haqqında fikirləşdiyin şeylərin hamısı nameyi-əməldə yazılır. Nameyi-əməl böyük əhəmiyyətə malikdir. Çünki, “kitabi məstur”un ən yaxın mənası Qurani-Kərimdən sonra nameyi-əməldir. Bu lövhə (nameyi-əməl) necə lövhdür?! Hansı qüdrətli əllə yazılır?! Təəccüblüdür ki, namənin sahibi öləndən sonra ona baxan kimi gördüyü işlərin hamısı yadına düşür. Ora başqa bir aləmdir, maddi dünyanı tərk edəndən sonra yaxşı başa düşərsən. Nameyi-əməldə əvvəldən axıra qədər nə iş görübsənsə qeyd olunubdur. Hər adamın naməsini öz əlinə verərək, deyərlər: “İqrə” kitabəkə”, yəni, “indi oxu öz kitabını!” Elə buna görə də İmam Əli əleyhis-salam buyurur: “Elə iş gör ki, sabah Qiyamət günü nameyi-əməlində onu oxuya biləsən.” Yəni gördüyün işin cavabını verə .biləsən

Amma Mömin adamın əlinə nameyi-əməlini verəndə çox sevinir. Uşaqlar uzun müddət məktəbə gedirlər, bu müddət ərzində onlar hətta qorxu hissi də keçirirlər. Amma elə ki, qəbul kağızını alırlar, hər kəsə çatsalar, deyirlər: “Bax! Bu mənim qəbul kağızımdır, mən imtahanlardan qəbul olmuşam.” Mömin adam da bu cürdür. Həmişə qorxu içində özündən soruşur ki, görəsən mən də əshabi-yəmindənəm, yoxsa yox? Nameyi-əməlimi sağ əlimə verəcəklər, ya

sol əlimə? ölüm saatında birinci ona müqdə verirlər. Qiyamət günündə də nameyi-əməlini sağ əlinə verirlər. Amma vay olsun o adamların halına ki, imtahanda onlara “siz qəbul olmamısınız” deyələr. ölümün ilk anlarında əzabın əlamətlərini də sol əllərinə .verərlər

Üstündə yazı yazmaq mümkün olan hər bir şeyə “rəqq” deyilir. Rəqqdən məqsəd ümumiyyətlə səhifədir. Yəni, hər hansı bir şeyə yazı yazmaq mümkün olarsa, istər kağız, istərsə də insanın sinəsi, qəlbi olsun (ey insan, bütün hadisələr orada yazılır)– .ona rəqq deyirlər

Qurani-Məcid, yaxud sinə, məsələn Xatəmül-Ənbiya Mühəmməd səlləllahu əleyhi və .alihi və səlləmin sinəsi, həmçinin iman əhlinin sinəsi incə bir rəqqdir

Möminin qəlbi ağdır, açıqdır, kafirin qəlbi isə qaradır, bağlıdır. Möminin qəlbi mənşur, yəni açıqdır. ömrü qurtarıb əcəli çatanda nameyi-əmalı bağlanar. İnsan öləndən sonra yaxşılıqları artmır, günahları da aradan getmir. Əgər Allah rəhm etsə daha ona .sözümüz yoxdur

Ola bilər ki, rəqqi mənşur elə nameyi-əməl olsun. Qurani-Məcidin əzəmətlərindən biri .də budur ki, onun sözlərini bir neçə cür təfsir etmək olur

cümləsi də qabaqkı cümlələr kimi

çoxlu mənaya malikdir. Beyt sözünün mənası ev, məmur sözünün mənası isə abadlaşmış deməkdir. Kəbə Allah Evidir. Allahın evində əmin-amanlıq, abadlıq olduğuna görə Kəbə Evinə də Beytül-məmur deyilir. Allah-Taala Kəbənin ziyarətini hamıya bütün istəyənlərə qismət etsin. Kəbə Evi də abadlıqdır. İslam dini zühur edəndən sonra “la ilahə illəllah” bayrağı bu evin üstündə dalğalandı, bütlər məhv oldu və bu ev Mömin insanlarla doldu. Elə onun abadlığı da bu mənadadır. Məlum olur ki, hər hansı bir məsciddə namaz qılınarsa, oraya abad məscid demək olar. Yeri gəlmişkən qeyd edək ki, Qiyamət günü xalqdan şikayət edənlərdən biri də dünyada abad olmayan məscidlərdir. Məsciddə nə qədər çox ibadət olunsa, o qədər də abadlaşar. Sözün qısası “Vəl-beytil-məmur” cümləsinin mənası, yəni “And olsun Kəbə .(Evinə ki, həmişə abaddır” (xüsusilə həcc mövsümündə

BEYTÜL–MƏMUR” MƏLƏKLƏRİN MƏSCİDİDİR“

.Beytül-məmurun mənalarından biri də yeddinci göydə olan bir məsciddir

Rəvayət olunur ki, Allah-Taala bəşərin atası Adəm Peyğəmbəri xəlq etmək istəyəndə mələklər e”tiraz edərək dedilər: “Ey Allah, sən orada (yer üzündə) fəsad törədib qan axıdan bir mövcud xəlq etmək istəyirsənmi? Allah-Taala onları inkar edib buyurdu: “Mənim insan haqqında bildiklərimi siz bilmirsiniz”. Yəni siz tikanı görürsünüzsə, gülü də nəzərə alın! Aləmlərin Allahına üz tutmuş cavanları görmürsünüz. Yalnız insanların pis əməllərini görürsünüz. Məlumdur ki, yaxşı və qiymətli şeylər tapılmır, azdır. Qızıl çoxdur, yoxsa daş? Əlbəttə Möminlər həmişə fasiqlərdən sayca az olur. Allah-Taala mələkləri, e”tiraz etdiklərinə görə yeddi min il məhrum etdi. Sonra isə mələklər Allahdan bağışlanmaq istədilər. Allah-Taala yeddinci göydə bir məscid icad edərək onlara əmr etdi ki, yeddi min il bu məscidin ətrafında təvaf edib istiğfar etsinlər. Rəvayət olunur ki, əgər həmin məscidin yanından bir daş atsan, düz Kəbənin damının .üstünə düşər. Yəni, o məscid Kəbə Evi ilə bir ox üzərindədir

Əgər insan yeddi dəfə Kəbə Evinin ətrafına fırlansa, onun savabı, mələklərin yeddi min il etdiyi təvafın savabına bərabərdir. Allah-Taalanın hər gün yetmiş min mələk xəlq etməsi Beytül-məmurun başqa əzəmətinə dəlalət edir. Çünki həmin mələklər Beytül-məmura daxil olur, zikr etməklə məşğul olurlar. Onlar beytül-məmurdan çıxandan sonra ikinci dəfə oraya daxil ola bilmirlər. Çünki, Qiyamət gününədək onlara növbə .çatmır

Seyyid ibni Tavus Beytül-məmurun xüsusiyyətlərindən birini aşağıdakı kimi bəyan :edir

Beytül-məmurda çoxlu mələk vardır. Onların bir dəstəsi sağ, başqa bir dəstəsi isə sol“ tərəfdə olurlar. “Kiramül-katibəyn” insanın sağ və sol çiynindəki iki mələk axşam olan kimi, Möminin nameyi-əməlini asimanda olan bu məscidə aparırlar. Məscidin sağ ”.tərəfindəki mələklər ehtiramla həmin naməni alıb üzünü köçürürlər

Əgər nameyi-əməl pis əməllərlə qaralmış olsa məscidin sol tərəfindəki mələklər onu alıb üzünü köçürürlər. Belə olan halda bütün insanların əməllərinin nüsxəsi həmin

.vardır. Bu nüsxələrə əsasən Qiyamət günündə heç kəs öz əməllərini inkar edə bilməz

## BƏDƏN ÜZVLƏRİ VƏ YERİN ŞƏHADƏTİ

Bundan əlavə bədən üzvləri də görülən işlər haqqında şəhadət verir. Elə buna görə də müstəhəbdir ki, insan müxtəlif məkanlarda namaz qılıb dua etsin. Hədisdə var ki, Möminin əməlləri ölçülər və günahları çox olanda bəzən azacıq təfavütün hesabına onun yaxşılıqları azalır, buna görə əmr olur ki, onu oda tərəf aparsınlar. Elə bu zaman kipriklərindən biri şəhadət verərək deyər: "Ey Rəbbim! Mənim sahibim bir gün Səni ".yadına salıb ağladı

Bu əməl onun xoşbəxt və nicat tapmasına səbəb olur. Mən bilmirəm bizim taleyimiz ?necə olacaq

## OĞUL ÖZ İŞLƏRİNİ ATASINA DANIŞARAQ XƏCALƏT ÇƏKİR

Böyük şəxsiyyətlərdən birinin bir oğlu var idi. Bir gün öz oğluna buyurdu:–Mənim bir ?istəyim vardır, əgər onu desəm yerinə yetirərsənmi

!Oğul dedi:–Bəli, ata yerinə yetirərəm

Ata dedi:–Hər axşam evə gələndə gündəlik gördüyün işlər haqqında mənə dəqiq .məlumat ver

Axşam oldu. Oğlu evə gəldi. O, öz sözünə vəfa etmək üçün etdiyi işlərin bir hissəsini atasına danışdı. Amma bəzilərini deməkdən çəkindi. Elə bu zaman atası ona dedi:–Oğul! Mən Allah bəndələrinin içində zəif bir bəndəyəm. Əgər sən öz əməllərini mənə deyə bilmirsənsə, bəs Qiyamət günündə Allaha necə deyərsən? Məxluqatın qarşısında ?öz əməllərini necə oxuyarsan

.And olsun ucalmış (hündür) yük-sək tavana, yəni and olsun asimana

.And olsun dolu olan dəryaya, başqa məna ilə desək, and olsun od tutmuş dəryaya

Elə ki, təndirin içində od qalayırlar və onun içindən alov şöləleri qalxır, ona məscur deyirlər. Amma bu ayədə bəhri-məscurdan məqsəd Qiyamət günüdür. Onun birinci

mənasını nəzərə alsaq aşağıdakı kimi təfsir olunar. Elə ki, Qiyamət olar və zəlzələ .başlar, dağlar dəryaya tökülər, dəryalar dolar

Əlyyibni Əbu Talib əleyhis-salam "bəhri məscuru" başqa cür təfsir edərək buyurur: yeddinci asimanda ucsuz-bucaqsız bir dərya var ki, dərinliyi yerlə göy arasındakı məsafə qədərdir. Qiyamət günündə qırx gecə-gündüz yağış yağır. Çürümüş bədənlər .torpağa dönər, yenidən canlanarlar, cəsədlər dirilər

## DƏRYALAR OD TUTUB YANAR

Amma dəryaların od tutub yanması haqqında olan başqa bir mənanı hədislərdə görmək olar. Hədislər göstərir ki, Qiyamət günündə şəksiz-şübhəsiz baş verən hadisələrdən biri də dəryaların od tutub yanmasıdır. Hal-hazırda dəryaların altında od vardır. Qiyamətdə bütün dəryalar birləşər, od tutub yanar və şölələnər, elə bu zaman !sular oda çevrilər. Xülasə, and olsun Allahın qəhr odundan od tutub yanan dəryalara

Misirli müfəssir Təntavi son məlumatlara əsasən deyir: "Bu ayə Qurani-Məcidin mö"cüzələrindən biridir. Bizim zamanımıza qədər onun haqqında heç kəsin xəbəri yox ".idi

Müasir elmə əsasən yer kürəsinin iç hissəsini (nüvəsini) kəşf ediblər. Hətta əgər dəmiri onun içinə atsalar əriyib mayeyə dönər. Əgər oradan yer kürəsinin üst qabığına kiçik bir deşik açılsa yüzlərlə metr ətrafı yandırar. Dağlardan çıxan vulkanlar elə buna görədir. Allah Taala bu odun ətrafında qalınlığı orta hesabla ٣٠ km olan qabıq yaradıbdır. Bu qabığın yer kürəsinin içindəki odla müqayisədə qarpızın qabığının onun içinə olan nisbəti kimidir. Başqa sözlə desək, yer kürəsinin dərinliyi həddindən artıqdır. Əgər yer kürəsini əhatə edən qabıq olmasaydı, hər yer külə dönərdi. Yer kürəsinin bəzi hissələrində şiddətli zəlzələlərin nəticəsində onun qabığı parçalanır və od şölələnir. .Bəzi yerlərdə dağı yerindən qoparır

Bu məsələ müasir elmlə sübuta yetirilibdir ki, Qiyamətdə dəryalar birləşərlər, dəryaların suyu odların üstünə tökülərək şölələnər; bu ona oxşayır ki, bir yer od tutub .yananda onun üstünə su tökərkən daha da şölələnir

Çünki, yer kürəsində olan maddə dəryaların suyuna çatır, bütün dəryalar şölələnir (od tutub yanır). Çünki, suyun tərkibi iki ədəd hidrogen və bir ədəd oksigen atomundan təşkil olunubdur. Hər ikisi

yəni hidrogen və oksigen maddələri alışma qabiliyyətinə malikdirlər. Lakin Allah-Taalanın qüdrəti ilə atəş və odun ziddinə olan su bu iki maddənin tərkibi ilə yaranmışdır. Amma Qiyamət günündə yandırıcı maddələr qələbə çalmaqla su parçalanacaq və ikinci dəfə onun ilkin maddələri olan hidrogen və oksigen (təşkil tapdığı maddələr) ayrı-ayrılıqda malik olduğu həmin yandırıcı xasiyyətini yenidən kəsb !edəcəklər. Doğrudan da Qiyamət günü təəccüblüdür

## BU ANDLAR VƏ MÖMİN

.Mənhəc təfsirində bəzi tədqiqatçılarin etiqadına əsasən bu altı and iman əhlinə aiddir

.Yəni Möminin qəlbi möhkəm dağ kimidir

Möminin qəlbidir ki, onun üstündə Allahın qüdrətli qələmi ilə “la ilahə illəllah” yazılıbdır və heç vaxt silinməz, məhv olmaz. Allahdan istəyirəm insan elə məqama çatsın ki, .Allah-Taala onun qəlbində tovhid kəlməsini həkk etsin

Rəqq, yəni cild, yəni Möminin qəlbidir. Möminin qəlbi həmişə açıqdır. Onun qəlbi heç .vaxt Allahın lütfündən məhrum olmaz

.İman əhlinin qəlbidir

Möminin qəlbi həmişə

Rəhman Allahın ərşidir. Allahın zikri ilə və Allahı yad etməklə abaddır, onun qəlbi qəflət .yuxusuna getmir

And olsun Möminin ruhuna ki, ta-van evə hakim kəsilən kimi, Mömin də öz qəlbinə .hakim kəsilir

.Bu ayə Allahın məhəbbəti ilə alışmış iman əhlinin qəlbinə işarə edərək, ona and içir

## İSA əleyhis-salam VƏ XAİFİNİN SÖZLƏRİ

Həzrəti İsa ibni Məryəm əleyhis-salam üç nəfəri qəmgin halda gördü. Bədənləri zəif və üzləri saralmışdı. İsa əleyhis-salam buyurdu: Hansı səbəb sizi bu günə salıbdır? Dedilər: Allahın qorxusu. İsa əleyhis-salam başqa üç nəfəri gördü ki, onlardan çox bu üç nəfər qəmgindir. Qəmginliyinin səbəbini onlardan soruşdu. Dedilər: Allahın rəhmətinin şövqü bizi bu hala salıbdır. İsa əleyhis-salam daha başqa üç nəfəri gördü. Onlardan soruşdu: siz nə üçün qəmginsiniz? Dedilər: Allahı istəməkdən və Onun fəraqına görə bu cür olmuşuq. İsa əleyhis-salam üç dəfə təkrar edərək onlara :buyurdu

.Allahın dərgahına yaxın olanlar, sizsiniz

Şüeyb Peyğəmbər o qədər ağladı ki, axırda gözləri tutuldu. Allah-Taala onun gözlərinə şəfa verdi. Yenə də o ağlamağın nəticəsində kor oldu. Allah-Taala buyurdu:–Şüeyb, biz ki, səni savaba çatdırırıq, bəs niyə belə edirsən? Şüeyb ərz etdi:–Münacatı çox .istəyirəm

Allah-Taala da dünyada Musanı onun üçün xidmətçi seçdi.Allah-Taala hər insanı xəlq etdiyi gündən bəri, gör nə qədər onunla mehribancasına rəftar edir. Ona nə qədər ləzzətli xörəklər, nə qədər paltarlar qismət edir, nə qədər onun eyblərini örtür, nə !qədər onu bağışlayır

İnnə əzabə rəbbikə lə vaqiun

Yəni, həqiqətən sənin Allahının əzabı hökmən vaqe olacaq. Yəni, Quranda yazılmış .bütün əzablar baş verəcək

Ma ləhu min dafiin

.Yəni o əzabın qarşısını alan yoxdur. Heç kəs Allahın əzabının qarşısını ala bilməz

.Orada rüşvətə yer yoxdur. Yaltaqlıq fayda verməz

## HANSI ŞƏRAİTDƏ ALLAHIN ƏZABI BAŞ VERİR

.Yəvmə təmurus-səmau məvrən

Bütün təlatüm şeylərə məvr deyirlər. Yəni, bir gün olar ki, bütün kürələr və başqa yaranmışlar bir-birinə dəyərlər. Göylərin zahiri forması dəhşətli olar, Qiyamət .səhrasının ətrafından vəhşət yağar

Ulduzlar öz nəzmlərini itirməklə bir-birinə dəyərlər. Yer titrəyər, xarabaya dönər, dağlar bütün möhkəmliyi ilə, əzəməti ilə hərəkətə gələr. Bütün dağlar zəlzələnin nəticəsində dağılıb yumşalar, parçalanıb tikə-tikə olar. Qiyamət Allah-Taalanın mütləq səltənət və hakimiyyətinin nişanəsidir. Sinəsini döyüb mənəm-mənəm deyən insan öz səhvini başa düşəcək ki, qüdrət yalnız Allaha məxsusdur. Qüdrətli Odur, qadir Odur, .vəssalam

„Bir dəstə iman əhli bu dünyada başa düşürlər ki: la məlikə illa huvə” yəni

mülk yalnız Allah üçündür. “La əzizə illa huvə”, yəni qüdrətli yalnız Allahdır. Bunlar öz elmləri ilə başa düşürlər, başqalarının başa salmasına ehtiyacları yoxdur. Lakin insanların çoxu bunu Qiyamət günü başa düşürlər. Amma Qiyamətdə başa düşməyin .artıq faydası yoxdur

Aləmlərin Allahına layiq olan sifətləri Qiyamətdə başa düşməyin əsla xeyri yoxdur. Bu zəif bəşər bəzi vaxt öz ailəsində, əhli-əyalı üçün Allahlıq edir, başqası şagirdi üçün, Fir”on isə Misir diyarına görə Allahçılıq iddiası edir. Hamı məxluqdur, hamı bir olan Allahın xəlq etdikləridir. Hamı bir olan Allahın ruzisini yeyir. Bir damcı nütfədən yaranmış və axırı iylənmiş leşə dönən insan hansı üzlə, hansı əsasla mənəm-mənəm deyə bilər? “Mən etdim”, “mən edəcəyəm” və s. Əgər bəşər düz deyirsə, onda tükünü ağarmağa, qulağını ağır eşitməyə, gözünü kor olmağa, dişlərin tökülməyə qoymasın. Qurban olsun o ağıllı adama ki, Allahın əzəmətinin nişanələri zahir olmamışdan qabaq (Qiyamət gününə işarədir) başa düşə və bilə ki, mənim kimi zəif bəndənin əlindən heç bir iş gəlmir: bilə ki, hər şey Allah tərəfindəndir. Bir damcı suyu heykəl şəklinə salan məhz Allahdır. O, cansız maddə olan çörəyi insanın bədəninə bədəninə daxil edərək orqanizmə döndərir. Kim insana can verir? Bəşəriyyətin çoxu cəhl və nadanlıq .qaranlıqlarında qərq olubdur, qeyb aləminə diqqət etməyə ləyaqətləri yoxdur

Elə buna görə də Qiyamət günündə bəşərə həqiqətlər başa salınar və Allahın əzəməti .məlum olar

Allah-Taalanın əzəmətini bu dünyada başa düşənlərin və bütün qüdrətlərin Allah üçün olduğunu başa düşənlərin xoş halına! Xoş onların halına ki, Allah-Taalanın qüdrətinin möcudların arasında paylaşdırmasını bilirlər. Xülasə, Qiyamət ilahi qüdrət və əzəmətin .zahir olduğu bir gündür

## QİYAMƏT ƏCAİBLƏRİ QORXU DOĞURUR

Qiyamətdə qorxu və vəhşətin səbəblərindən biri, onun misilsiz mənzərələridir. Yəni bəşər yenidən dirilib torpaqdan baş qaldırdığı zaman elə şeylər görür ki, onu heç vaxt dünyada görməyibdir. Dünyada baş verən zəlzələlər nə qədər şiddətli olsa da Qiyamətdəki zəlzələ ilə müqayisə olunası deyil. Qiyamət zəlzələsi elə bir zəlzələdir ki, .dağları xarabaya çevirir

.Hamı həyəcanlanar, yalnız öz haylarında olar və özlərini fikirləşərlər

:Hədisdə nəql olunur ki, Rəsuli Əkrəm buyurdu

".Camaat Qiyamətdə ayaqyalın, başı açıq məhşur olacaq“

"?Ümmü Sələmə Həzrətdən soruşdu: “Qadınlar nə halda olacaqlar

Rəsuli Əkrəm buyurdu: “O gündə, hər kəsin başı öz nameyi-əməlinə elə qarışacaq ki, (.başqasına diqqət edə bilməyəcək.” (Başqası ilə maraqlana bilməyəcək

## GƏMİNİN QƏRQ OLMASI QİYAMƏTİN KİÇİK BİR NÜMUNƏSİDİR

Yelkənli gəmilərdə dəryaya səfərə çıxanlar bilirlər ki, dəryada tufan olanda, bəzən dəryanın dibindəki çirkab da suyun üzünə qalxır, dəryadan elə bir dalğa gəlir ki, hətta gəminin içini su basır. Belə olan halda gəmidəki sərnişinlərin yadına heç kəs və heç nə düşmür, elə öz haylarında elə olurlar ki, heç nəyə diqqət yetirə bilmirlər. Qiyamətdə də .qadın və kişilər yalnız öz haylarında olarlar

## XƏDİCƏ QİYAMƏTİN ÇILPAQ VƏZİYYƏTİNDƏN QORXURDU

Rəsuli Əkrəm bir neçə qadına zamin durdu ki, məhşərə çılpaq vəziyyətdə gəlməyəcəklər. Onlardan biri Fatimeyi-Zəhra əleyha salam, o birisi isə Möminlərin anası olan Xədiceyi Kübra idi. Həmin Xədicə idi ki, Allah-Taala Cəbrailin vasitəsilə ona salam göndərdi. Xədicə o qədər Qiyamətdən qorxurdu ki, Fatimədən xahiş etdi, Allahın Rəsuluna desin, Xədicə öləndə Peyğəmbərin köynəyini onun üçün kəfən etsin. Həmin .qadınlardan biri də Əli ibni Əbitalibin anası Fatimə binti Əsəd idi

## CÜBEYRİ ÖZ BAŞINA ÇARƏ QILMAĞA VADAR EDİR

Cübeyr Peyğəmbərin əshablarından biridir. O, “Bədr” müharibəsindən sonra əsir olmuş müşriklər haqqında Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm ilə söhbət etmək üçün Məkkədən Mədinəyə səfər etdi. Cübeyr həmin vaxt kafir idi. Cübeyr əsirləri azad etdirmək istəyirdi. Buna görə də Mədinə şəhərinə, Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləmin hüzuruna gəldi. O, sübh azanı vaxtı Peyğəmbər məscidinin qapısının ağzına yetişdi. Həmin vaxt

Xatəmül-Ənbiya səlləllahu əleyhi və alihi və səlləm sübh namazını qılırdı. Birinci rəkətdə "Həmd" surəsindən sonra mübarək "Tur" surəsini oxudu. Cübeyr deyir ki, müşriklərə məscidə daxil olmaq üçün icazə verilmədiyinə görə bu surəyə bayrdan qulaq asırdım. Həzrəti Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm Ï; ayəsini qiraətinə çatan zaman

bədənimə titrətmə düşdü. Ayəni eşidən kimi oturdum. özümə əlac qılmaq üçün fikirləşdim. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm namazı qurtarandan sonra, Allahın əzabından canımı qurtarmaq üçün icazə alaraq məscidə girdim və müsəlman .oldum

Bu cür hadisələr Allahın, bəndəsinə olan mehribançılığından irəli gəlir. Nəhayət, Cübeyr .müsəlman oldu

## QURAN AYƏSİNİN PAK FİTRƏTDƏ QOYDUĞU TƏSİR

:Mərhum Hacı Şeyx Əliəkbər Nəhavəndi yazır

Bir kişi öz oğlunu dərs oxumaq üçün məktəbə göndərmişdi. Məktəbdə həm fars dili," həm də Quran dərsi tədris olunurdu. Bir gün günorta çağı uşaq məktəbdən evə qayıtdı. Atası gördü ki, oğlunun rəngi saralıb, deyəsən qızdırması var. Ona dedi: Oğul sənə nə olubdur! Uşaq ağlaya-ağlaya cavab verdi ki, müəllim bu gün bizə aşağıdakı ayəni :öyrətdi

.Vəttəqu yövmən yəc"əlül vildanə şəybən" Yəni qorxun o gündən ki, uşaqları qocaldır"

Ata fikrə getdi. Xülasə, uşağın qızdırması çoxaldı və dünya ilə vidalaşdı. Həddi buluğa çatmamışdan qabaq onun cənazəsini dəfn etdilər. Atası oğlunun qəbri üstə gəlib, "!deyərdi: "Kaş ki, sən günahsızın yerinə mən öz napaklığımdan öləydim

.Yövmə təmurus-səma"u məvrən

Məvr" iztirab və yerindən qopmaq deməkdir. Təfsirçilərin bəzisi buyurubdur ki, məvr," dövri hərəkətdir. Yer o cür möhkəmliyi ilə parça-parça olacağı halda, görəsən zərif insan nə hala düşəcək? Qiyamətin vəziyyəti o qədər qəribə və təəccüblüdür ki, insanın

gözü, heyrətdə qaldığı üçün ۴۰ il hərəkətsiz olar. İnsan ölüm vaxtı gözünü bir yerə .dikdiyi kimi Qiyamətdə də o cür olar

”Və təsirül cibalu səyrən“

səh:۱۷

.Yəni dağlar Qiyamətdə bir-birinə dəyib darmadağın olacaq, toza dönəcəklər

!?Onda Qiyamətdə nə olacaq

-Fə vəylün yəvməizin lil“

mükəzzibinə” “Vəyl” sözünün mənası şiddətli əzab və ya Cəhənnəmdə olan quyu deməkdir. “Lil mükəzzibin, yəni Qiyaməti inkar edənlər üçün şiddətli əzab vardır, o .adamlar üçün ki, bu gün “axı kim o dünyadan gəlibdir ki, xəbər də gətirə?” deyirlər

Həzrəti Loğman buyurur: “Bəzi insanlara təəccüb edirəm ki hər gecə-gündüz ölür, yenə də dirilir və bununla belə, Qiyaməti danır. Burada ölməkdən məqsəd yatmaqdır. İnsan yatdığı vaxt ruhun rabitəsi onun cismi ilə bir az azalır, amma yenə də ruh cisimlə əlaqədə olur. Lakin, bəzi vaxt ruh tamamilə cisimdən ayrılır, əlaqəsi kəsilir, yəni insan yatdığı yerdə də ölür. Belə isə, Mömin yatarkən vəsiyyətnamə və kəfənini öz yanında .qoymalıdır

:Əgər ölməsə yuxudan ayılsa gərək desin

Həmd olsun O Allaha ki, məni öldürdükdən sonra diriltdi. Yalnız ona tərəfdir dirilib“ ”.qalxmaq

## QİYAMƏT ƏQLİN HÖKMÜ İLƏ

Əql və təhqiq əhlinin nəzərində, Qiyamətdən açıq-aydın nə ola bilər? Əgər peyğəmbərlər də Qiyamətdən xəbər verməsəydilər, ağıllı adam başa düşərdi ki, bu dünyadan sonra başqa bir dünya da vardır. Əgər yalnız bu dünya olsaydı yaşayış əbəs və mənasız olardı. Həkim olan Allah da əbəs iş görmür. Bu dünya oyuncaqdır. Bu dünyanın büsatı yığışdırılacaq, hökmən bundan yaxşı büsat qurulacaq. Allah-Taala elə bir ev hazırlayıbdır ki, onun içindən çıxmaq mümkün deyil. Bu dünyanın paltarları istər .istəməz köhnəlir amma o dünyanın paltarları dəyişilməz qalır

## GÜNAHKAR MÖMİNİN ƏZABI AZDIR

Müfəssirlərdən bəzisi deyirlər ki, mükəzzibin mənası Qiyaməti inkar edən deməkdir. Amma iman əhlinin içində günah edənlər necə? Bunlar mükəzzib deyil, günahkardırlar.

Qiyaməti inkar edən şəxs üçündür. Amma günahkar Möminin əzabı yüngül olacaq. Rəvayətdə vardır ki, Cəhənnəm yeddi mərtəbədir. Onun əzabı az olan birinci mərtəbəsi, günahkar Möminlər üçündür, iman nuru öz sahibini çox da alçalmağa .qoymur üstəlik onu hər iki dünyada paklaşdırır

Əlləzinə hum fi xəvzin yəl"əbunə" "Xəvz", batmaq, qərq olmaq mənasındadır, batilin" içində batmaq deməkdir, həmişə bu mənada işlənir. Və hətta batil kəlməsindən ayrı da işlənsə həmin mənanı itirmir. Batil kəlməsini işlətməyə də ehtiyac yoxdur. "Xaiz", yəni hər kəs ki, batilin içinə batar, batildə qərq olur. "Əlləzinə hum fi xəvzin yəl"əbunə", yəni .o kəslər ki, batilin içində qərq olublar

.Əxlaq elmində zikr olduğu kimi, batildə qərq olmaq üç hissəyə bölünür

**BATİLDƏ QƏRQ OLMAĞIN ÜÇ QİSMİ**

Batildə qərq olmağın birinci qismi kafir və mürtəd olmaq, ikinci qismi haram, üçüncü .(qismi isə məkruhdur (xoşa gəlməz işlər

Birinci qisim, küfr və mürtədlik üsulid-dinə aiddir. Məsələn Qiyaməti ələ salıb onu danmaq, məada, İslamın əziz Peyğəmbərinə, on iki İmam əleyhis-salamın imamətinə aid olan məsələləri inkar etmək birinci qismə misal ola bilər. Bir sözlə batildə qərq olmaq (birinci qismə əsasən) yəni tovhidi, nübüvvəti, imaməti və məadı inkar etmək .deməkdir

Yuxarıdakı ayə də birinci qisim barəsindədir. İkinci qisim haramdır. Bu da günah əhlinin əməlini təkrarlamaq və danışmaqdır. Məsələn, iki nəfər bir-birinin yanında oturan kimi günah əhlinin əməlini, günah məclislərini, o cümlədən rəqs, qeyri-şər"i kino, üzdəniraq .teatr və s. kimi məclislər haqqında söhbət etməyə, başlayırlar ki, bu iş haramdır

İkinci qism məkruhdur. Məkruh odur ki, bir yerdə otururlar və varlıların eyş-işrəti .haqqında söhbət edirlər, əlbəttə bu şərtlə ki, içində qeybət olmasın

".Yövmə yuddəunə ila nari Cəhənnəmə də"ən"

.Yəvm" yəni gün, "yud"əvnə", hər hansı bir şeyin şiddətlə bir yerə atılmağına deyirlər"

.O kəslər ki, batilin içində qərq olublar, onları şiddətlə Cəhənnəmə atacaqlar

Rəvayət olunur ki, əvvəl Cəhənnəm əhlinin əllərini boyunlarına bağlayar, sonra onların tüklərini ayaqlarına dolayıb üzü üstə Cəhənnəmə atan zaman Cəhənnəm məmurları ”!onlara deyəcəklər: “Bu həmin Cəhənnəmdir ki, dünyada onu inkar edirdiniz

Doğrudan da bəşər necə iddialara, necə inkarlara əl atır! Bəşər hansı cür”ətlə məadı danır? Heç olmasa gərək Cəhənnəmin və Cənnətin haqq olmasını ehtimal versin! Məgər Cəhənnəm və Cənnətin yoxluğuna yəqinliyi vardır? Rəvayətdə vardır ki, Cəhənnəm əhlinin əl- ayaqlarını bağlayan zaman nə”rə çəkirlər. Mələk onlara deyir ki, !bu hələ əzab deyil, Cəhənnəmə gedəndən sonra əzabı görəcəksən

”Hazihin-narul-ləti kuntum biha tukəzzibun“

.Bu həmin oddur ki, siz bunu inkar edirdiniz

## ?CƏHƏNNƏM DƏ SEHRDİR

Kafirlər və müşriklər peyğəmbərlərin qarşısında iki söz deyirdilər; deyirdilər ki, o ya sehrkardır, ya da şair. O cümlədən müşriklərdən biri olan Ütbə başqa müşriklərin təzyiqi ilə Peyğəmbərin yanına getdi və dedi: Ey Mühəmməd! Şerlərindən bir az mənim üçün oxu! Peyğəmbər buyurdu: Quran şer deyil. Həzrət onun üçün bir ayəni tilavət etdi. Ütbənin canına lərzə düşdü, öz-özünə əsməyə başladı və dedi: Ey Mühəmməd! !Daha bəsdir, oxuma

O evə qayıtdı, içəri girib qapını bağladı. Bu hadisədən sonra müşriklər onun ətrafına :toplaşıb dedilər

Sən bizi rüsvay etdin. Nə isə, onlar sonra da sehr töhmətini peyğəmbərin adına çıxararaq deyirdilər: peyğəmbər bizi sehr edibdir. Cəhənnəmin məmuru Qiyamətdə .buyuracaq: Bu sehrdir? Bu ilahi vəhyin Qurandan bariz nümunəsidir

Peyğəmbərə və İlahi kitaba bu cür nahaq töhmət vuranlar çox həyasız idilər. Quranın nəyi sehrə oxşayır? Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm-in hansı işi sehrkarların işinə oxşayır? Sehrkar xalqın içində ən alçaq və tamahkar insandır. Sehr əməli də ən çirkin və alçaq işdir. Belə olan halda Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm bütün paklığı və mö"cüzə olan Quranı ilə sehr edirdi?! Bəşər övladı çoxlu iftira, böhtan atır, töhmət vurur, üstəlik e"tinasızlıq da edir. Buna görə də Qiyamətdə onlara ?deyərlər: Bu Cəhənnəm də sehrdir? Ya siz görmürsüz

"Hazihi Cəhənnəmul-ləti kuntum tu"ədun

"!?Sözün qısası "Məgər bu sehrdir, yoxsa siz görmürsünüz

:Sonra onları daha da çox danlamaq üçün deyirlər

Yəni, sizin üçün fərqi yoxdur, istər səbr edin, istərsə də səbr etməyin. Hər iki halda .gərək Cəhənnəm odunu dadasınız

Siz yalnız etdiyiniz çirkin əməllərin qarşısında cəzalanırsınız. Qışqırsanız da, !qışqırmasanız da Cəhənnəmin odunu dadacaqsınız

Səbrin o dünyada yox, bu dünyada qiyməti vardır. Cəhənnəmdə Cəhənnəm əhli səbr etsələr də, etməsələr də, (hər iki halda) əzabları azalmayacaq.

Dünya ilə Cəhənnəmin fərqi budur ki, əgər Cəhənnəmdə qışqırsalar, səbirsizlik etsələr şeytanın danlağı, məzəmməti ilə üzbəüz olacaqlar.

Cəhənnəmin hər şeyi əzabdır. O cümlədən, əzaba görə səbirsizlik etsələr də onların fəryadına e"tina etməyəcəklər. Əgər səbr etsələr də bağışlanmayacaqlar. Amma bu dünyada insan bir an səbr etsə Allah-Taalanın həmişəlik lütfünə nail olması mümkündür. Başqasını vura bilər, amma vurmur, naməhrəm qadına baxa bilər, amma baxmır və ya sübh tezdən, ya gecə yarısı həddindən artıq yuxuya meyli vardır, amma ayağa qalxır namaz qılır, oruc tutur və aclığa dözür. Sözün qısası səbr etmək yaxşıdır. Baş vermiş müsibətdə Allaha xatir səbr edir, dözür, ürəyi yanır, ağlasa da fəryad etmir. Bu cür səbr çox qiymətlidir.

"İnnəlllahə məəs-sabirinə".

Səadətin zəminəsi dünyada səbrdir Bu cür ayələr ki, (səbr haqqında) Quranda zikr olunur, iman və təqva əhli bu ayələri oxuyanda özlərini eybsiz bilmirlər. Həqiqətən, kim bilir ki, imanla dünyadan gedəcək? Mömin gərək həmişə diqqətli olsun, yadında olsun, elə ki, Quranda əzab ayələrinə çatır belə desin:

Ya Allah, Sən mənə nicat ver! Məni imanla dünyadan apar!

## ƏLİ əleyhis–salam CƏHƏNNƏM ODUNDAN QORXUR!

Ənbiya və böyük şəxsiyyətlər qorxurdular, əsirdilər. Möminin hər nə qədər yaxşı əməli olsa gərək öz canını əzabdan qurtarmış kimi bilməsin. Gərək özü ilə Cəhənnəmin arasında maneə olan Allahın fəzl pərdəsini görsün. Əli əleyhis-salamdan da yuxarı bir adam tanıyırsanmı? Əli əleyhis-salam özünü əzabdan qorxmağa vadar edir. Bir gün Həzrət bir yetimin evinə girir. Gəlib təndiri qalayır. Elə ki, od şölələnir başını təndirə yaxınlaş-dırıb öz özünə deyir: "Əli! Odun məzəsini dad!"

Əgər Əli əleyhis-salam bu cür edirsə, biz nə edək? Gərək başımıza vurub "va qəflətə!" deyək.

## QORXU Və ÜMİD–İNKİŞAFIN İKİ SÜTUNU

Əxlaq elmində qeyd olunur ki, nə qədər insan bu dünyadadır, onun kamilləşməyi üçün həm qorxu, həm də ümid lazımdır. Təki təklif yükünü axirət səfərinə qədər öz üstündən götürə bilsin. Əgər taziyanə qorxusu olmasa, ehtiraslara, nəfsani istəklərə tabeçilikdən başqa heç bir iş odan baş verməz. Eləcə də buyurur: Mömin iki nurun arasındadır, onların heç biri o birisinə qalib gəlmir və heç biri təklikdə səfər yükünü .mənzilə çatdırmır. Hər iki nur gərək bərabər olsunlar

Hədisdə var ki, əgər günahın ilk və sonuncu günah olsa da yenə Allahın əfvindən məyus olma. Çünki, əgər Allahın dərgahına gəlsən, səni bağışlayar. Nə olar ki Allah-Taala səni paklaşdıra? Buyurur, qorxu məqamında da əgər bütün Allahdan qorxan insanların əməli olsa, yenə də Allahdan qorx! Məgər qorxmursan ki, Allah-Taala bir anlığa sənin üstündən öz nəzərini çəkər, səni öz başına buraxar. Əgər Allah-Taala səni .öz başına buraxsa çirkin işlərə mürtəkib olarsan

## ?NİYƏ BƏL"ƏM Və OVURUN AQİBƏTİ ŞƏR OLDU

Bir nəfər Həzrəti Musəbni Cə"fər əleyhis-salamdan soruşdu: "Nə üçün Bəl"əm və Ovur "?o qədər elmləri ilə yanaşı aqibətləri itə döndü

".Həzrət buyurdu: "Çünki, Allah-Taala bir anlığa onları öz başına buraxdı

"?Həmin şəxs ərz etdi: "Nə üçün onları öz başına buraxdı

".Həzrət buyurdu: "Çünki, ne"mətin şükrünü yerinə yetirmədilər

Ağıllı Mömin gərək ənbiyanın çırağa oxşadılmış sifət və xüsusiyyətlərinə malik olsun. Gərək çırağın həm yağı, həm də alışqanı olsun. Əgər yağı olmasa, piltə yanar; əgər alışdırıcısı olmasa, ümumiyyətlə, yanmaz. Möminin qəlbi də çıraq kimidir. Məbadə şeytan onu aldatsın. Mömin bir tərəfdən bilməlidir ki, Allah bağışlayır, digər tərəfdən .də qorxu kibriti ilə yanmalıdır (işıqlanmamalıdır), təki öz sifətini başa çatdıra bilsin

## ÜSTÜN İŞLƏRİ GÖRMƏDİYİNƏ GÖRƏ DAVUD əleyhis–salam IN QORXUSU

Həzrəti Davudun qorxusu haqqında yazılıbdır ki, hər vaxt, üstün işləri yerinə yetirməməsi və Allahın qəzəbi yadına düşsəydi, oynaqları bir-birindən ayrılar, daha sonra Allah-Taalanın lütfünə diqqət yetirər, və yenidən oynaqları bir-biri ilə birləşərdi. Əli əleyhis-salam Allahın qorxusundan qəşş edərdi. Xülasə, bəyan olduğu kimi gərək Möminin qorxu və ümidi olsun. Allaha və onun lütfünə ümidi olsun. Aləmin Allahı qənidir, kərimdir. Bir adam otuz il, qırx il, yetmiş il, ya Allah deyəndən sonra Allah-Taalanın onu qəbul etməməsi ağlasığan bir iş deyil.

Başqa tərəfdən insan qorxmalıdır ki, məbadə əməlimin qəbul olmamasının səbəbi (belə olan halda) əməllərimdəki ücb və riya ola!

Qurani-Məciddə həm Cənnət , hə də Cəhənnəm haqqında söhbət olunması qorxu və ümidlə uyğunlaşır. Əvvəlki şərif ayələr insanın qəlbini titrədən ayələrdən idi.

Kimin dünyadan pak gedəcəyinə dəlili vardır? Deməli, bu şərif ayələrdə təqva əhli olanlar üçün müqdə verilir.

"İnnəl müttəqinə fi cənnatin və nəimin, fakihinə bima atahum rəbbuhum və vəqahum rəbbuhum ə"zabəl-cəhimi"

Təqva "viqayə" məsdərindən düzəlib, pəhrizkar mənasında işlənir. "Müttəqin", yəni o kəslər ki, Allahdan qorxurlar, Allah da onlara Cənnət və nəimdə (naz-ne"mətdə, xoş gündə) yer verdi. Fakihunə, yəni "mütələzzizinə" Dünya evində ləzzət üçün minlərlə zəminə hazırlansa da ləzzət olmayacaq, onun bir guşəsi xarab çıxacaq, qəm qüssəsi olacaq. Cənnətdə isə bunun əksinədir, heç qəm qüssəsi yoxdur, hamısı ləzzət, naz-ne"mətdir.

Dünyanın xoşluqları ləzzət deyil, dərd və ağrıları aradan aparmaqdır.

Məsələn, yemək aclığı, içməli su susuzluq xəstəliyini aradan aparmaq üçündür. Amma Cənnətdə bu cür deyil. Cənnətdə Möminlərə deyərlər: Allah sizin üçün qərar verdiyi hər şeyi yeyin və için. Cənnətin əcəb ləzzətli şeyləri vardır. Bu ayədən sonrakı ayələr Cənnət haqqındadır. Xatəmül-Ənbiya Mühəmməd səlləllahu əleyhi və alihi və

meyvələrinin hər birinin bir dadı var. Başqa meyvədə isə bu dad yoxdur. Hamısı şirindir .və xas ləzzəti var. Amma birinin xas ləzzəti o birisində yoxdur

Cənnətin bir meyvəsi bütün meyvələrin məzəsinə ləzzətinə malikdir. Rəsulullah səlləllahu əleyhi və alihi və səlləm buyurdu: "Cənnətin bir meyvəsində bütün başqa növ meyvələrin ləzzəti vardır. Bu dünyada eyni zamanda müxtəlif şirniləri bizim dilimiz dada bilməz. Məsələn, əgər bir neçə qarpızı dadmaq istəsək gərək hər birini ayrılıqda yeyək, bəzi vaxt olur ki, bir-birindən seçilmir. Amma Cənnətdə bütün meyvələrin dadı bir meyvədə dadılır, ləzzət alınır. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurdu ki, dünyada bəşərə ləzzət verən bütün iyləri, Cənnətdə bir anda iyləmək olur. Hər vaxt Mömin yemək istəsə, o saat onun üçün hazır olar. Təəccüblü məsələ odur ki, dünyada yemək-içməyin bir həddi vardır, bir müddətdən sonra meyl və iştaha aradan gedir. Lakin Cənnətdə bunun əksinədir. Rəsulullah səlləllahu əleyhi və alihi və səlləm buyurdu ki, Cənnətin meyvələrinin ləzzəti yeməyin axırında yeməyin əvvəlindəki kimi və onun iştahası yeməyin axırında da əvvəlindəki iştahası kimidir." Bir nəfər Həzrətdən "?soruşdu: "Siz buyurubsunuz cənnətdəkilər yeyib-içirlər

".Həzrət buyurdu: "Bəli, Cənnətin bir kişisinin iştahası yüz kişinin iştahası ilə bərabərdir

## ?NƏ ÜÇÜN TƏNBƏLLİK EDİRLƏR

Əli əleyhis-salam buyurdu: Cənnəti istəyənlər azdır, üstəlik həmin az bir dəstə də tənbəldirlər. Ey kaş o dünya üçün çox vaxt sərf edərdilər. Böyük şəxsiyyətlərdən biri buyurdu: Sübh çağı məni yuxu tutdu, gecə namazı qılmaq üçün ayağa qaxmadım, öz-özümə dedim ki, yatıram. Yatdım və gözəl sifətli bir nəfəri yuxuda gördüm. Ondan soruşdum: Sən kimsən? Dedi: Mən səhər çağı sənin bir damcı göz yaşınam, əgər mənim vüsalıma çatmaq istəyirsənsə tənbəllik etmə. Həmin böyük şəxsiyyət buyurdu: .Şiddətli sevinclə, yuxudan ayılıb, ayağa qalxdım

Dedik ki, Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm buyurdu: Bir nəfər Cənnət əhli yüz nəfərin iştahasına malikdir. Yeyəndən sonra onda ağırlıq və kəsalət baş vermir, ifrazatı da tər şəklində xaric olur. Oranı (Cənnəti) bu dünya ilə müqayisə etmək olmaz. Bu dünyanın o dünya ilə müqayisəsi, ana bətnindəki uşağın həyatını bu dünya ilə müqayisə etmək kimidir. İndi biz bu fasid dünyanın bətnindəyik. ölənlər başa düşürlər ki, bu dünyada hansı oyuncaqlarla məşğul idilər və hansı oyuncaqlara .şadlanırdılar

## ORUC VƏ CAMAAT NAMAZI

Dünya oyuncaqdır, uşaq xasiyyətlilər onunla şadlanırlar. Elə bil ki, uşaq bahar ətirli narınc ağacını yox, onun şəklini görür. Vərəqin üstündə çəkib uşağın əlinə verirsən, o, .nə qədərdə zövqə gəlir. Xalqın çoxu uşaq sifətindədirlər

Əsl məsələyə diqqət yetirmirlər. Canım qurban olsun o adama ki, bu dünyanın nişanələrini görməklə, onun əslini başa düşür. Başa düşür ki, bu qədər şirinliklərin hamısı onun əslinin bir zərrəsi deyil. Bəs onun əsli nədir? Əgər şövq və qorxu olsa, .insan bəzi vaxt şövqdən, bəzi vaxt isə qorxudan yata bilməz

## ...BEHİŞTİN ŞÖVQÜNDƏN ÖLÜR

Nəql olubdur ki, bir neçə il bundan qabaq sadə bir kişi var imiş. Bərzəx aləminin bir nümunəsini ona yuxuda göstərilməsini təmənna edirmiş. Bir gecə bərzəx Cənnətindən .bir qədər ona göstərirlər. O sevindiyindən iki ay ağladı, axırda da öldü

Nə əzaba səbr etmək mümkündür, nə də ki, rəhmətdən ayrılmağa səbr etmək. Ne”mətdən məhrum olanların vay halına! Zeynül-abidin

əleyhis-salam Allaha ərz edir: Mənə, axırda əzab verəcəksən? Bəs mənim ümidlərim necə oldu? Cənnətdə heç qəm qüssə yoxdur və darus-səlamdır (yəni salamatçılıq evidir.) Allah-Taala Mömin bəndəsini, öz lütfü ilə oddan qoruyur. Buyurur, əməlin təsiri olsa da əsas Allah-Taalanın lütfüdür. Əgər Allah-Taalanın lütfü olmasa əməlin də o .qədər faydası olmaz

.(Allahın lütfü əməli səmərəyə yetirir. (əmələ səmərə verir

Əkinçi əvvəl yeri belləyir, sonra toxumu səpir. Sonra isə tarlada olan tikan və alaq otunu və s çıxardıb kənara atır. Amma yağış və günəş də lazımdır. Lakin bunlar əkinçinin əlində deyil. O cümlədən, tarlanın səmərə verməsi, çoxalması və bərəkəti də .eynilə onun kimidir

Əgər insan qəsavət, ləcacətli (inadkar) ruhi xəstəliklərindən nicat tapsa, iman toxumu onun qəlbində əkilər. (Belə olan halda) Allahın lütfü günəş kimi onun qəlbinə saçaraq səmərə verər. Əkinçi gərək özü də çalışsın. Məsələn, tikan və alaq otunu özündən uzaqlaşdıra, ibadət yolundakı maneələri aradan apara, yəni bütün günahlardan pəhriz etsin. Həmçinin xeyir iş görəndən sonra, həmin xeyir işi batil edən başqa bir iş .görməsin

Rəvayət olunur ki, məsciddə oturmaq ibadətdir, xüsusən camaatı gözləmək məqsədi ilə. Lakin bu şərtlə ki, dünya söhbəti ilə onu batil etməsin. Elə ki, ibadət yolundakı maneələr aradan getdi, insan böyük dərəcələrə çatar, onu qoruyub saxlamaq xeyir iş .görməkdən də çətindir

".Külu vəşrəbu həni"-ən bima kuntum təməlun"

Tərifi mümkün olmayan meyvələr və xörəkləri yeyin, için. Təfsirdə yazılır ki, Mömin bir quşu görür, onu yemək istəyir, quş həmin saat onun qarşısında qol qanadı ayrılmış halda kabab olur. Mömin onu yeyir. Yeyəndən sonra "əlhəmdü lillahi rəbbil aləmin" deyir. Birdən həmin quş dirilir və uçur. "Kulu vəşrəbu həniən" dünyada olmayan .yeməkləri yeyin için

Onu hazırlamağın nə qədər zəhməti vardır. Bəzi vaxt yeyəndə boğazda qalır, əgər

xoşagəlməz bir hadisə baş versə yeməyin ləzzəti aradan gedir. Əgər heç bir hadisə .baş verməsə də bir neçə tikə yeyəndən sonra iştaha ölür və doyur, ləzzət qurtarır

Xörək odur ki zəhmətsiz, əziyyətsiz və istəyən kimi hazır olsun. Bu cür xörək yalnız behiştdədir. Məqsədim “həniən” kəlməsidir ki, əgər

Allah-Taala "həniən" buyurursa, gör nə qədər bunun əhəmiyyəti vardır. İstəyən kimi hazır olan yeməkdir. Hazır olandan sonra da doymaq olmur. Çirkinlik də yoxdur. Həzrəti Salmanın hədisini eşitmisiniz? Seyyid ibni Tavus "Minhacüd-də"vat" kitabında rəvayət edir ki, Salman buyurubdur: Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm vəfat edəndən sonra qəm qüssə içində olduğuma görə on günə qədər evdən çölə çıxmadım. Onuncu gün mövlam Əmirəl Möminin Əli ibni Əbi Talib əleyhis-salamı ziyarət etmək üçün evdən çıxdım. O, Həzrəti görən kimi mənə dedi: Bizə cəfa etmisən? Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm dünyadan gedəndən sonra bizi .yaddan çıxartmısan

.Dedim: Allahın Rəsulunun ayrılıq qəmi məni xanəneşin edibdir

Həzrət buyurdu: İndi get Fatimənin yanına, o səni istəyir və sənin üçün Cənnət töhvəsi hazırlayıbdır. Salman deyir, Fatimənin ziyarətinə sürətlə getdim. O mənə buyurdu: Atamdan sonra bizi yaddan çıxartmısan? Mən dedim: Allahın Rəsulunun ayrılığı məni xanəneşin etmişdir. Fatimə əleyha salam buyurdu: Otur! Sənə dediklərimi başa düş! Keçən gün həmin yerdə oturmuşdum. Evin qapısı bağlı idi. Atamdan ayrıldığıma və vəhyin kəsildiyinə görə qəm-qüssə içində idim. Birdən üç kənizi gördüm, onların qarşısında durdum və dedim: Sizə qurban olum, siz Məkkə əhlisiniz, yoxsa Mədinə əhli? Dedilər: Biz yer əhli deyilik, Cənnət hurilərindənik. Allah-Taala bizi sənin yanına göndərdi. Biz səni görməyə aşiqik. Fatimə əleyha salam buyurdu: Onların birindən (o iki nəfərdən böyük idi.) soruşdum: Sənin adın nədir? Dedi: Mənim adım Məqdudədir. Allah-Taala məni Miqdad ibni Əsvəd Kindi üçün yaradıbdır. O birisindən soruşdum: Sənin adın nədir? Dedi: Zərrədir. Allah-Taala məni Əbuzər Ğəffari üçün yaradıbdır. Üçüncüsündən soruşdum: Adın nədir? Dedi mənim adım Səlimdir. Allah Taala məni Salman Farsi üçün yaradıbdır. Sonra qardan sərin və müşkdən iyi yaxşı olan Cənnət xurmasını mənə verdi. Fatimə əleyha salam həmin xurmadan Salmana verdi və .buyurdu: Bu xurma ilə iftar et və dənəsini sabah mənim üçün gətir

Salman deyir, xurmanı aldım, yolda Allah Rəsulunun əshabı mənə çatanda soruşurdular: Səndə müşk vardır.? Dedim bəli! Xurmanı iftar edəndən sonra gördüm xurmanın tumu yoxdur. Sabahısı günü Fatimə əleyha salam-ın hüzuruna gəldim. Ona dedim ki, həmin xurmanın

dənəsi yox idi. Fatimə əleyha salam buyurdu: Düzdür, Cənnət xurmasının dənəsi olmur .((hədisin davamı vardır

Cənnətin başqa bir ne"məti Mömin üçün hazırlanmış səltənət taxtıdır. "Sürur" sərir kəlməsinin cəmidir. Lakin bu dünyanın taxtları kimi deyil. Cənnət taxtlarının uzunluğu .bir milyon və eni iki min ziradır. Onun taxtlarının mismarı cəvahirdəndir

Ləalül-əxbar" kitabında nəql olunur ki, onun hündürlüyü ٥٠٠ il yol məsafəsi qədərdir." Bilmək lazımdır ki, Cənnət taxtlarının hündürlüyünün miqdarı Möminin iradəsindən asılıdır. Çünki, Möminin taxtının hündürlüyündən məqsəd Möminin əhatəsi, səltənəti və ləzzət aparmasıdır. Mömin, Allah-Taalanın Cənnətdə ona verdiyi taxtın yanına gələn zaman o təxt sevinir. Mömin yaxınlaşan kimi taxt aşağı gəlir və sevincindən titrəyir. Ora qəribə yerdir. Dünya heç də rahatlıq yeri deyil. Bura rahatçılıq yeri deyil, bu dünya iş və əməl yeridir. "Məq"ədi sidq" nə deməkdir və onun bəyanı "Əl-qəmər" surəsinin təfsirində deyilibdir ki, "sidq" "kizbin" ziddidir. Bura ləngər salmaq yeri deyil. Yaşayış yeri, ağıllıların yeri deyil. Bu xalqın həmişə e"tiraz etməsinin səbəbi budur ki, rahatlıq axtararlar və həmişə xəstəliyə, cəhl, qəflət, paxıllıq və s. xəstəliklərinə düçardırlar. .Həqiqi oturmaq, istirahət etmək və rahatlığa layiq olan yer yalnız Cənnətdir

Taxta və sərirə söykənənlərin, başqa taxtı vardır. Onların görüşünə gələn qonaqları və dostları üçün də elə buna görə də "surur" (taxtlar) kəlməsini cəm formasında buyurubdur. "Surur", yəni taxtlar "məsfufə" kəlməsi bir-birinə bağlanmış bir-birinin yanında (bərabərində) qoyulmuş deməkdir. Nə üçün taxta sərir deyirlər? Çünki, sərir sururdandır, çünki, həm təxtin sahibi səriri görməklə şadlanır, həm də sərir öz sahibini görməklə sevinir. Həmin münasibətə görə ərəb dilində tabuta sərir deyirlər. Təfəüül babındandır. Yəni Mömin təbiət aləminin həbsindən azad olur. Onun sevinc və nicat səbəbi tabutdur. Tabut onu qəm qüssədən, giriftarçılıqdan xilas edir. Mömin üçün giriftarçılıq olmayan bir gün vardırmı? ölmək, yəni zindanın qapısının açılması; tabut, .yəni qurtuluş vasitəsi və həmin əsasla tabut sevincin səbəbidir

Eşitməmisən Mömini qəbrə qoyan zaman onun əqidəsi haqqında ondan soruşurlar və öz əqidəsini deyir. Sonra ona deyirlər, bu qəbir

sənin yatağındır. Müşk qoxusu onun qəbrindən qalxır. Möminin pak ruhu bərzəx :aləmində genişlənir. İmam Sadiq əleyhis-salam buyurur

Möminə rahatlıq yalnız Allahlla görüşüdyü vaxtda hasil olur.” ölüm saatında görür ki,“ mələklər cərgə-cərgə onu qarşılayırlar, sonra Möminlərin ruhları, daha sonra isə Allahın rəsulunun ruhu. Əgər Möminin heç sevinci olmasa da bu məsumların üzünü .görməklə çox sevinirlər

Sünnü və şiə məzhəblərinin hər ikisinin tərəfindən rəvayət olunur ki, Ayişə Həzrət Zəhra əleyha salam-a ərz etdi: Atan ölən vaxtı səni çağırmağını eşitdim. Sənin qulağına nə isə dedi və sən sevindin. De görüm, sənə nə buyurdu: Həzrəti Zəhra əleyha salam buyurdu: Atam mənə buyurdu, sən tezliklə mənə çatacaqsan, tezliklə .dünyadan köçəcəksən

## HURUL–EYN CƏNNƏT KİŞİLƏRİNİN HƏYAT YOLDAŞLARIDIR

Allah-Taalanın Möminə verdiyi şeylərdən biri və əzəmətlə zikr etdiyi həmin şey hurul .eyndir

Allah-Taala öz mehmanxanasında belə bir lətif mövcudu və”də veribdir. Əli əleyhis-salam buyurur: Allah-Taala böyük hesab etdiyi şeyləri siz də böyük hesab edin və Allah-Taala kiçik hesab etdiyini kiçik hesab edin. Məsum əleyhis-salam dua məqamında

”!Allaha ərz edir “İlahi, məni huril-eynlə evləndir

”.Bu ayə də buyurur: “Hurul-eyni Möminlə evləndirdim

O cümlədən başa düşülür ki, Möminin hurul-eyn ilə evlənməsi bu dünyadakı evlənməsi ilə fərqlənir. Nümunə olaraq şərif bir hədisi nəql edirəm. “Biharul ənvar” kitabında Səid :ibni Müs”ibdən nəql olunur

Kufə şəhərində Həzrəti Zeynül-abidin əleyhis-salamı gördüm. O Həzrət özünü pak-pakizə edib hamamdan çıxmışdı. Şərif məhasininə həna vurub gözəl paltar geyib, ətirlənmişdi. Ərz etdim, ağa hara gedirsiniz? Buyurdu: Məscidün-nəbiyə, namaz

.qılmağa gedirəm. Ərz etdim: İndi ki, namaz vaxtı deyil

.Buyurdu: Hurul-eynin elçiliyinə gedirəm

Əgər insan bütün zahiri və batini çirkinliklərdən, günah və pis əxlaqlardan özünü paklaşdırsa hurilərlə evlənmək ləyaqətinə malik olarlar. “hur” gözün ağ hissəsinin həddindən çox ağ olması deməkdir. Huril eynin gözlərinin qarası da onların gözlərinin ağı kimi həddindən çox qaradır. Onların camalının incə olmasına gəldikdə isə çoxlu rəvayətlər vardır. Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm buyurur: Əgər Cənnət hurilərindən bir qadın bu dünyaya gəlsə bütün xalq həlak olar, onu görməyə taqətləri olmaz. Əgər inşallah bu dünyadan xalq özləri ilə lətif göz və lətif görən göz aparsalar o dünyada huriləri görməyə taqətləri olar. Həzrəti Yusifin həyatı haqqında ?Qurandakı ayələri oxumusan

Yusif əleyhis-salam evə daxil oldu, arvadlar barmaqlarını kəsdilər, hiss də etmədilər. Yusifin gözəlliyi onların hissini aradan apardı. Bu həmin gözəlliklərdən bir damladır. Buyurur: Əgər Cənnət hurisi dünya aləminə gəlsə ayın işığını məhv edər. Hurun lətafətindən biri də budur ki, yetmiş “hallə” geyir. Hər bir təzə paltarın bir iyi vardır. Bu təzə paltarlar və hurun bədəni o qədər lətifdir ki, onun arxasından bədənin dərisi hətta sümüklərinin məğzi görünür, elə bil ki, saf suyun dibində bir dirhəm görünür. Hər bir hur Möminə hazırlanıbdır və hər birinin başında tac vardır. Biçarə aləm əhli bu təbiət aləminin qadınlarına ürəkl bağlayıbdır. Hurilər o qədər Möminlərə müştaqdırlar ki, :buyurur

-yəni öz yoldaşlarından başqa

larına baxmazlar. Əgər Mömin gec gəlsə hurilərin taqəti olmaz. Bunu da ərz etmək istəyirəm ki, bəzi yüngül fikir adamlar özlərini müqəddəs bilib deyirlər: Biz hurul eyn istəmirik. Necə ki, müqəddəslərdən biri söhbət etdi və öz kiçikliyini zahir edib dedi:– .Mən Allahdan qadın, ya hurul eyn istəmirəm

?Ustad dedi: Niyə

Dedi: Mən şəhvət əhli deyiləm. (Nə qədər ayaqlarını kilimdən çölə çıxarıblar və cahildirlər. Ey kaş öz cahilliklərini e”tiraf edələr. Ustad buyurdu: Cənnət huriləri dünya qadınları kimi deyillər. Dünya qadınları ilə söhbət etmək qəflətə səbəb olur. Əksinə

.ilə söhbət etmək və yaxınlıq etmək Allahın zikrinə səbəb olur. Zikr içində zikr

Elə ki, hur təbəssüm edir, dişlərinin işığı sarayı işıqlandırır. Xülasə şəhvət və çirkinlik .yeri deyil, orada başqa hal ruhiyyə vardır

## HURİLƏR RUHANİ VƏ NURANİ HƏYAT YOLDAŞI İSTƏYİRLƏR

Allah-Taala Mömin üçün çoxlu zəxirələr hazırlayıbdır. Bu zaman belə lətafətli qadın necə ər istəyir. Bir qadın ki, təbəssümündən nur yağır, ən aşağısı iman nuruna malik olan bir kişi istəyir. Möminin nuru vardır. Necə ola bilər ki, Allah-Taala sənin üçün arvad olan huriyə nur versin, amma sənin nurun olmasın, zülmət içində olasan? Bu cür ola bilməz. Bəzilərinin etdiyi kimi də asan deyil, nə qədər ki, iman yoxdur, mümkün deyil. Məsələn, o qədər əhəmiyyətlidir ki, məsumlar onları görməyi Allahdan istəyirlər. Başqa bir mətləb bundan ibarətdir ki, Cənnətdə nəfs, həva, yəni Allahdan xəbərsiz olmaq yoxdur. Hamı Allahı yad edir. Allahın rəsulu buyurur: Cənnətdə həlqənin açılıb bağlanmasını gördüm, o səslənərək deyirdi; Ya Əli, ya Əli! Əlinin vilayəti olmasa bu qapıdan daxil olmaq mümkün deyil. Bütün bunlar, bu cür lütf və kəramətləri aydınlaşdırmaq üçündür ki, insan bu beş günlük dünyada özünü paklaşdırsın. Bilmək lazımdır ki, Cənnət əhli olan qadınlar huri kimidirlər, üstəlik bütün nur və pak-pakizəlikdən də üstündürlər. Onların batinində olan təqva və iman nuru zahirlərini də nurlu edibdir. Artıq qadınlıq adətinin çirkinliyi və hamiləlik zəhməti orada yoxdur. Həmişə nur kimi bəkarət halında olarlar. Yüz dəfələrlə ərləri ilə yaxınlıq etsələr də yenə bakirədirlər. Xülasə hurilərin haqqında olan təriflər onlar üçün də üstəlik ondan .da artıq mövcuddur

Hurul-eynin başqa xüsusiyyətlərindən biri onun zatında olan şey haqqındakı rəvayətlərdir ki, Cənnətin yaz gülünün iyinə malikdir. Hurun iyi ۵۰۰ yüz illik yoldan hiss olunur. Elə ki, Mömin qəbirdən baş qaldırır, bu iyi hiss edir. Şiə və sünnü alimləri Allahın Rəsulundan nəql edir ki, Həzrət buyurur: Hurilərin iyi yaz gülünün iyi və mələklərin iyi qızıl gül iyidir. Doğrudan da ölüm saatı nə qədər ləzzətlidir. Mələklərin iyi! Elə bir vaxtda ki, bəşərin daha çox ləzzətə

ehtiyacı vardır. Mələklər gəlməklə onların qızıl gül iyi Mömin üçün şövq və sevinc gətirir. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurdu: Amma qızım Zəhra hər .üçünün iyini verir: həm ənbiyanın, həm hurun, həm də mələklərin iyini

Allah rəsulu səlləllahu əleyhi və alihi və səlləm Zəhra əleyha salam-ı hədsiz dərəcədə iyləyirdi. Hətta Ayişə həsadət edərək Peyğəmbərə e"tiraz etdi. Allahın rəsulu buyurdu: .Zəhranın bədənindən Cənnətin iyi burnuma gəlir

## BEHİŞTDƏ QOHUMLARI YADA SALMAQ

Cənnətin başqa ne"mətlərindən biri də budur ki, Mömin Cənnətə daxil olandan sonra ərz edir: Mənim atam, anam və zürriyyəm haradadır? Məlum olduğu kimi Mömin Cənnətdəki məqamına çatmayınca atası, anası yadına düşmür. Cənnətə daxil olmayınca atası, anası və övladı haqqında fikirləşmir. Elə ki, Cənnətdə yadına düşdü və onların vəziyyəti haqqında soruşdu, mələk cavab verər. Atan və anan Mömin olduğu üçün Cənnətdədirlər. Amma onların dərəcəsi sənin dərəcəndən aşağıdır. Bu zaman Mömin şəfaət edir və habelə, övladın şəfaəti ilə ata və ana uca dərəcələrə çatır. Ata-anası da onun dərəcəsinə çatır. Allah-Taala da lütf edir və Möminin istədiyi yerinə yetirilir. Həmçinin arvadı, əri, atası, övladı və başqaları üçün də şəfaət edir. Elə buna görə də Quranın bir neçə yerində zikr olub ki, əgər bir şəxsin yalnız imanı olsa atası, ya .anasının şəfaəti ilə uca dərəcələrə çatar

## İBRAHİM VƏ SARA Mömin UŞAQLARIN QAYĞIKEŞİ

Amma kiçik övladlar necə? Həddi buluğa çatmamış dünyadan gedən uşaqlar rəvayətə əsasən Həzrəti İbrahim əleyhis-salam və həyat yoldaşı Saraya tapşırılar. Elə ki, Mömin Cənnətdə yer tutdu, uşağa paltar geyindirib hədiyyə kimi ona təqdim edərlər. Başqa rəvayətə əsasən kiçik övladlar Həzrəti Zəhraya tapşırılır. Onların valideynləri Cənnətə .daxil olandan sonra ata analarına hədiyyə olurlar

O kəslər ki, Allaha iman gətirdilər, övladları özlərinə itaət etdilər, onlara mülhəq“ ”.(olacaqlar (onların vüsalına çatarlar

Əgər övldı imansız olsa, Cənnətdə olmayacaq. Burada bir sual qarşıya çıxır, əgər övlad Cəhənnəmdə və ata Cənnətdə olsa, ata qəm-qüssə içində olar. Halbuki, Cənnət qəm-qüssə yeri deyil. Bəs bu məsələni necə həll etmək olar? Cavab budur ki, Allah-Taala həmin övladı atasının yadından çıxardır. övladın imanı iki qismdir: Biri əsl təklifi imandır, bu o vaxtdır ki, uşaq həddi-büluğ ola, dünyadan gedə və Mömin ola; İkinci budur ki, hökmi və təbii imandır. Yəni müsəlman uşağı həddi büluğdan qabaq ölə, gərək ona qüsl verəsən. Əgər altı yaşı olsa meyyit namazı onun üçün vacibdir. Xülasə, ya həddi buluğa çatandan sonra özü iman gətirə, ya da həddi büluğa çatmamışdan qabaq atasının təsiri altında iman gətirə. Hər iki surət, Cənnətə daxil olmaq üçün kifayət edir. Əgər həddi buluğ olandan sonra imansız dünyadan getsə, nə atası onu görür, nə də o .atasını

Yəni kimsənin əməlini azaltmır, bir kəsin dərəcəsini aşağı salmırlar, üstəlik aşağı dərəcəni yuxarı qadırırıq. Allahın fəzli, kərəmi çoxdur. Atanın malından onun zürriyyəsinə verməyə ehtiyac yoxdur. Xülasə, ayənin mənası budur ki, Möminlərin zürriyyələrinin dərəcəsini artırmaqla və onları atalarının dərəcəsinə çatdırmaqla, mö”milərin əməlinin savabından zərrə qədər də azaltmırıq. Üstəlik Möminlərin ləzzətinin artması üçün və onların gözlərinin aydınlığı üçün övladlarını onlara çatdırırıq. Çünki, hər kəs nə kəsb edibsə onun da girovundadır və öz əməlinin savabına bağlıdır, yəni hər bir şəxsin Qiyamətdə bütün əməllərinin savabı bütövlükdə özünə çatacaq. Buna baxmayaraq, onun əməllərinin savabından zərrə qədər də başqasına verilmir, ya zürriyyəsinin ona çatdırılmasına görə əməllərindən azalmır. Necə ki, başqasının günahının əzabı ona verilməyəcək. Əgər soruşsalar ki, bəs necə olur Qiyamətdə Möminin yaxşılıqlarından alıb haqq sahibinə verilir, ya haqq sahibinin pisliklərindən götürüb ona borcu olanın boynuna qoyurlar? Bunun cavabını belə veririk: bu cür müamilə, onun əməlinin savabına və onun günahkar olduğuna görə gərək baş versin. Bəli, bəzi Möminlər haqqında rəvayət olunur ki, Allah-Taala Möminin boynunda olan haqq sahiblərinə öz fəzlindən savab verir və onları razı salır. Eyni zamanda Möminin savablarından

zərrə qədər azalmır. “Bürhan” təfsirində bu şərif ayənin bəyanı zamanı bir neçə hədis ,nəql olubdur, o cümlədən İmam Sadiq əleyhis-salamdan rəvayət olunur ki

Atanın ləyaqətli əməlindən, kiçik olan övladları, Allah-Taala öz atalarının vüsalına “ çatdırır, təki ataların gözləri aydın olsun. Yenə də o Həzrətdən rəvayət olunur ki, şiələrin uşaqlarını Fatimə əleyha salam tərbiyə edir və öz atalarına təhvil verir. İmam Baqir əleyhis-salamdan da rəvayət olunur ki, elə ki, Qiyamət bərqərar oldu, bir nəfər :carçı ərş tərəfdən car çəkərək deyər

Ey camaat! Gözlərinizi yumun, Fatimə əleyha salam gəlib buradan keçsin. Cənnətdən– min huri və onlarla birlikdə əlli min mələk Fatimə əleyha salam-ı qarşılayarlar. Fatimə əleyhis-salam elə ki, Cənnətə daxil oldu, onun üçün iki saray hazırlanmış olar. Ağ və sarı saray. Ağ sarayda yetmiş min ev vardır. Və həmçinin sarı sarayda Allah-Taala :Fatimə əleyhis-salamın yanına bir mələyi göndərərək, buyurar

Ey Fatimə! Məndən istə, Mən də əta edim. Məndən hər nə istəyirsən, istə, Mən də– göndərim. Fatimə əleyhas-salam deyər: Allah-Taala öz ne”mətini mənim üçün tamamlayır və əzizlədi. Allahdan istəyirəm ki, övladlarıma, zürriyyəmə və məndən .sonra onları istəyib onlara kömək edənlərə etdiyim şəfaəti qəbul etsin

Allah-Taala onun şəfaətini qəbul edir. Fatimə əleyhas-salam buyurur: Həmd olsun Allaha ki, qəm qüssəni məndən uzaq etdi Qəm qüssəni məndən uzaq edib və gözümü aydın edən Allaha, həmd olsun. Sonra İmam Baqir əleyhis-salam yuxarıdakı ayəni .tilavət etdi

Yenə də İmam Baqir əleyhis-salam) və İmam Sadiq əleyhis-salam)-dan rəvayət olunur ki, Allah-Taala İmam Hüseyn əleyhis-salamın şəhadəti əvəzində dörd şey verdi: İmaməti onun nəslinə verdi, şəfaəti onun qəbrinin torpağında qoydu, onun qəbrinin yanında edilən duanı qəbul edir və onun qəbrini ziyarət edən şəxsin ziyarətə .getdiyi və qayıtdığı müddəti həmin şəxsin ömründən hesablamır

Məhəmməd ibni Müslim İmam Sadiq əleyhis-salama ərz etdi: –Allah-Taala İmam Hüseyn əleyhis-salamın xatirinə bu dörd şeyi başqalarına veribdir. Bəs İmam ?Hüseynin özünə şəhadəti qarşısında nə veribdir

İmam Sadiq əleyhis-salam buyurdu:–Allah-Taala İmam Hüseyn əleyhis-salamı babasının vüsalına çatdırdı. Buna görə də o Həzrət öz

babasının yanındadır, babasının dərəcə və məqamındadır. Sonra İmam Sadiq əleyhis-
:salam bu ayəni tilavət etdi

Allah-Taala bir Möminin xatirinə başqasına verdiyi ne"mət, öz fəzlindəndir. Bu
.rəvayətlərin xülasəsi bundan ibarətdir ki, o Mömindən heç bir şeyi azaltmır

səh:۳۶

Əmdədə" imdad məsdərindən olub, kömək etmək mənasındadır. Yəni, "zidnahum"" onlar üçün artırırıq. Bütövlükdə fəzldən söhbət gedir, Cənnət meyvələrini təfəzzül üzündən artırdıq. Bu dünyanın meyvələri o aləmdə də həmin ada malikdir. Lakin onların həqiqətləri bir-birindən çox fərqlidir. Cənnət meyvələri lətifdir, dünya .meyvələri isə lətif deyil

Dünya meyvələrinin kalı və yetişmişi, əzilmişi, xarabı vardır. Cənnət meyvələri isə əksinə olaraq, kalı, dadsızı və xarabı yoxdur. Üstəlik bir-birindən gözəldir. Cənnət meyvələrinin başqa əzəmətindən biri də onun dənəsiz olmasıdır. Qalın qabığı da .yoxdur

Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-dən rəvayət olunur ki, Cənnət .meyvələrinin hər birinin yüz min dadı vardır

Ora başqa aləmdir. Gör Mömin necə dərrakəyə malik olur ki, yüz min dadı bir anda dadır! Cənnət ağaclarının budağı qızıldır, tikanı, çubuğu yoxdur. Budağında da meyvə vardır. Mömin istədiyi hər hansı bir meyvə həmin saat onun qarşısında hazır olur. Daha mühüm məsələ budur ki, Mömin ağzındakı meyvəni yediyi halda həmin ağzındakı .meyvə başqa bir istədiyi meyvəyə dönür

Həzrəti Xatəmül-Ənbiya səlləllahu əleyhi və alihi və səlləm-dən aşağıdakı məzmunda bir rəvayət nəql olunur: Yuxu aləmində əmim Həmzəni gördüm (Həmzə şəhid olandan sonra). Bu zaman onun yanında bir salxım üzüm var idi. Bir də gördüm birdən üzüm xurmaya döndü. Əmimdən soruşdum ki, əməllərin ən gözəli hansıdır? O, dedi: İnsanın əli ilə susuzun sirab olması, ikincisi budur ki, Mühəmmədə səlləllahu əleyhi və alihi və .səlləm salavat göndərmək, üçüncüsü isə əmin oğlu Əliyyibni Əbi Talibi sevməkdir

Ya Allah, Səni vəlin Əlinin haqqına and verirəm, qəlblərimizi onun məhəbbəti ilə doldur !və bizi onun dostlarından qərar ver

## BEHİŞTDƏ ƏT

!Meyl və iştahaları olan heyvan əti, toyuq əti, özü də ki, Cənnətdə

Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-dən nəql olunur ki, Mömin Cənnətdə öz taxtının üstündə oturur. Birdən dəvə boyda quşlar gəlirlər. Mömin onların ətindən yemək istəyən kimi quşlar o saat otururlar, quşun qanadları tökülərək kabab olur. Mömin onu yeyir, elə ki, doydu, əlhəmdü-lillah dedi, quş dirilir, uçur və quşların .arasında iftixar edir

## CƏNNƏT ŞƏRABI ALLAH ZİKRİNİ VƏ HUŞU ARTIRIR

Piyalənin içi içməli sularla doludur. İçməli sular nədir? Cənnətdə bir neçə cür içməli sular vardır. Birincisi bal, özü də ki, dünya balı kimi deyil. İkincisi süd, üçüncüsü su, dördüncüsü şərab, amma necə şərab! Dünyanın çirkin şərabı kimidir? Dünya şərabı insanın ən böyük qüvvəsi olan əql qüvvəsini bəşərin əlindən alır və insanlar məst, ağılsız, yırtıcı olurlar. Bu dünyanın şərabı huş və əqli işdən salır. Keyfiyyətli şərab Cənnətdədir. Bu dünyanın şərabı keyfiyyətli deyil. Əgər bir cam Cənnət şərabı içsən, huşun, şövqün və zikrin yüz qat artır. Elə ki, Mömin şərab içdi, huşu, məhəbbəti və dərrakəsi çoxalır. Möminlər bir-biri ilə o aləmin şərabının ləzzətləri ilə çoxlu müamilə edərlər, yəni bir-birinə Cənnət şərabı verərlər və alarlar. (Əlbəttə, bu dünyadakı kimi, dava etməzlər) "Yətənazəunə" (şəraba) şiddətli olmasına görədir. Elə buna görə də "yətənazəunə" kəlməsini işlətdi. Onların arasında çəkişmə və dava olmaz. Şərabı bir-.birindən alıb, bir-birinə təklif edirlər, bir-birinin sağlığına içirlər

"La ləğvun fiha və la təsimun"

Yəni Cənnət şərabında dünya şərabının əksinə olaraq puçluq yoxdur. Bu dünyada şərab içənlər çoxlu puç sözlər deyirlər. "Yətənazəunə" kəlməsinin mənası bir-biri ilə savaşmaq, çəkişmək deməkdir. "Və la təsimun" yəni "və la hərəkatun təsimun". Cənnət şərabı günaha, söyüşə, mənasız danışığa bais olmur. Bu məsələləri eşitməklə dərk etmək olmur. Bu eşitməli mətləblər deyil. Çünki, adam nə qədər ki, bu dünyadadır, bu dünya aləmində olan şeylərdən başqa heç nəyi dərk etmir. Halbuki, .axirət aləmindəki varlıqlar başqa cür və başqa həqiqətdirlər

## Mömin ÜÇÜN BEHİŞT XİDMƏTÇİLƏRİ OLAN QULAMLAR

Hər bir Mömінin Cənnətdə ən azı min qulamı vardır. Amma bu dünyanın qulamları kimi yox; "kəənnəhum lölö"un məknun", pak və əl dəyməmiş mirvari kimi parıltılıdırlar və .onlar Möminə xidmət etməklə ləzzət alırlar həm onlar kef edirlər, həm də Mömin

Elə ki, Mömin çağırır, min qulam ləbbeyk (bəli, hazırıq!) deyir. Burada bir nəfər (Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm-dən maraqlı bir sual soruşdu: Ey Allahın ?Rəsulu! Cənnət qulamı ki, bu qədər gözəldir, bəs Mömin özü necədir

Bilmək lazımdır ki, adamın səadət və bədbəxtçiliyinin mizanı onun ömrünün axırıdır. Əgər ölüm saatında hər bir günahdan pak və imanlı olsa, ölüm onun üçün qurtuluşun, rahatlığın və xoşbəxtçiliyin başlanğıcıdır. Əgər ölüm saatı qəlbi imanlı olsa, lakin eyni zamanda günaha bulaşsa əbədi əzaba düçar olmasa da bərzəxdə və Qiyamətin çətin anlarında bir müddət günah etdiyi miqdarda əzab çəkəcək, bu şərtlə ki, şəfaət və ya rəhmət ona nicat verməyə. Əgər nə"uzu billah, imansız ölsə, əbədi əzaba düçar olacaq. Doğrudan da aqibət qorxusu mərifət əhlinin ürəklərini alovlandırıb, onları ağlar qoyubdur. Çünki heç kəs ömrünün axırının necə olduğunu bilmir. Çoxlu insanlar ömrünün bir hissəsində müsəlman idilər, bəlkə də imanlı idilər, lakin ömürlərinin axırında küfrlə, günahla öldülər! Bunun əksinə olaraq, elə adamlar olubdur ki, bir müddət ömründə imansız və günaha bulaşıbdır, lakin ömürlərinin axırında pak və imanla ölüblər, üstəlik ən böyük səadətə də çatıblar; Hürr ibni Yəzid Riyahi kimi. Elə vaxt olur ki, insan dünya məhəbbətinin onun qəlbində qələbə çalması ilə Allaha kin bəsləyərək ölür. Belə olan halda artıq onun üçün nicat yolu yoxdur. Çünki, ölüm anında başa düşür ki, onu evdən, həyatdan, əhli-əyalından, böyük zəhmətlə topladığı sərvətdən və ya rəislikdən ayırmaq istəyirlər. Bütün istədiyi şeyləri ondan alırlar. Bu hadisənin Allah əmri olmasını da başa düşür. Elə buna görə də Allah düşmənçiliyi ilə ölür. (nəuzu billah!) Elə vaxt olur ki, imanı zəif olduğu üçün ölüm saatı şübhəli fikirlərlə, şəkli halla ölür. Bunlar axırıncı keçiddir ki, o bədbəxt və şər aqibətli üçün heç bir nicat ümidi

yoxdur. Elə olur ki, günah etdiyi zaman ölür; şərab içib məst halda ölən bədbəxt kimi və ya riba (sələm) yeyən və bazarda öz mənfəətini tələb edən şəxs kimi. O biçarə borclularla əlbəyaxa oldu. İş polis idarəsinə çəkildi. O söhbət etdiyi vaxt davanın səbəbini başa saldığı zaman infrakt keçirtdi və öldü. Ya bir məzlumun malını qəsb edən başqa bir bədbəxt qəsb etdiyi zaman öldü. Elə vaxt olur ki, günahı arzuladığı halda ölür. Məsələn, həmin bədbəxt ki, ölüm saatında həsrət çəkirdi. O bədbəxt bir gün pak bir qadını hiylə ilə öz evinə apardı. Pak qadın da hiylə işlədərək onun əlindən çıxıb qaçdı. O bədbəxt ölüm saatında da həmin günahın həsrətini çəkirdi. Xülasə, hər kim pis aqibətdən qorxub, yaxşı aqibəti arzulayırsa gərək bütün ömrü boyu imanını möhkəmlətməyə çalışsın, bütün günahlardan qorunsun. Əgər günaha bulaşsa həqiqi tövbə edərək özünü paklaşdırsın və Allah qarşısında zəlillik göstərərək öz aqibətinin yaxşılığını istəsin. Yəqin etmək lazımdır ki, Allah-Taala bu cür bəndənin əməllərini puç .etməyəcək

Cənnət ne"mətlərindən biri də ünsiyyətin yaranmasıdır. Rəvayət olunur ki, Möminlər bir-biri ilə görüşmək istəyəndə onların taxtları hərəkət edərək bir-birinə çatırlar. Əgər bir Mömininin dərəcəsi o birisinin dərəcəsindən böyük olsa, onlar üçün bir sərhəd düzəlir gi, bir-biri ilə görüşsünlər. Ola bilər ki, Seyyid Cəzayirinin və başqalarının dediyi mətləb burada kiminsə yadına düşsün. Həmin mətləb bundan ibarətdir: Əgər Cənnətdə qəm-qüssə yoxdursa, bəs necə olur ki, aşağı dərəcədə olan şəxs, yüksək dərəcələrə çatmadığı üçün qəm-qüssə yemir? Bu sual idi. Amma onun cavabına gəldikdə isə :Qu"ran buyurur

Onların qəlbərində olan kini, həsədi çıxartdıq və bir-birinin qarşısında taxtlara" ".söykəniblər

Hər kəs Cənnətə girsə, əvvəl bir bulaqla qüsl edir və ikinci bulaqdan içir. İkinci bulaqdan su içəndən sonra bütün daxili xəstəlikləri aradan gedir, artıq paxıllıq, həsəd, .kin və s. onda qalmır

Bu zaman Mömin başqasının paxıllığını çəkmir, başqasına həsəd etmir, üstəlik o .Mömininin dərəcələrindən ləzzət çəkir, kef edir

Xülasə, orada kin yoxdur. Cənnətin çölündə qüssəsi vardır, qəbirdən çölə ki, baş

çıxartdılar, qüssələri vardır. Hətta Cənnətin qapısına gedənə qədər də qüssələri vardır. Amma Cənnətdə heç cür qəm-qüssə

yoxdur. Bilmək lazımdır ki, deyilən sözlər iman əhlinin çoxu üçündür. Allahın elə bəndələri vardır ki, həmin ölüm saatından şaddırlar və hər dərddən, qüssədən uzaqdırlar. Onlar imanın yəqin məqamına çatanlardır. Onlar Allaha ibadət və bəndəlik etməkdə xatircəm və sabit idilər. Heç bir azğınlıqları yox idi. Necə ki, Qurani-Məcid :onların hamısını bəyan edir. Və həmçinin buyurur

Yuxarıdakı sualın başqa

cavabı şəxsi idrakla əlaqəlidir. Məsələn, bir nəfər bir əndazəyə qədər ləzzət çəkir, ondan artıq ləzzətləri dərk etmir və həmin ləzzətlərə malik olmadığı üçün əziyyət çəkmir. Ümumiyyətlə, bu qədər bilin ki, hər kəs Cənnətə getsə qəm-qüssəsi olmaz. “Fatir” surəsində Möminlərin Cənnətə daxil olmasını bəyan edəndən sonra ٣٣-cü :ayəsində buyurur

Allaha şükür olsun ki, qəm-qüssəni bizdən uzaqlaşdırdı və artıq bizim üçün heç bir“ ”.əziyyət və narahatçılıq yoxdur

Allah-Taala Mühəmməd və Ali-Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm xatirinə bizi Cənnət ne”mətləri ilə bəhrələndirsin və onların yanında bizə yer versin. Möminlər bir-biri ilə Cənnətdə görüşən zaman etdikləri söhbətlərdən biri də dünyanın vəziyyəti .haqqındakı sual-cavabdır

Yətəsaəlunə”: təsaul təfaul babından olub qarşılıqlı söhbət deməkdir. O bundan“ soruşur, bu da ondan soruşur. Xülasə bir-birinin halını soruşurlar. Deyirlər: Bu :dərəcələrə çatmağının səbəbi nədir? Dünyada nə edibsən? Cavabında deyirlər

Bu qədər ne”mət və günahların bağışlanmasının səbəbi, dünyada öz ailəmə mehriban“ ”.olmağımdır

:Məcməul-bəyan” təfsirində deyilir“

Yəni insan bir şeydən qorxduğu üçün ürəyində yaranan qorxu səbəbi ilə ürəyin .yumşalmasına səbəb deyilir

Şəfaət–qəlizlik və qəsavətin ziddidir. Buna görə də şərif ayənin mənası aşağıdakı kimi

:olacaq

Cənnət əhli bir-biri ilə danışarlar ki, biz bundan qabaq, yəni dünyada öz əhlimizin“ arasında, Allah qarşısında günah etmək qorxusundan ürəklərimiz yumşalmışdı və öz aqibətimizin necə olmasına görə çox qorxurduq. Elə həmin Allah qorxusu bizim nicat ”.tapmağımıza səbəb oldu

Cənnət əhlinin “biz dünyada öz əhlimizin arasında qorxurduq” deməkləri ondan ötəridir ki, adam bəzi vaxt öz əhlinin yanında olduğu üçün ünsiyyətdə, xoşluqda və rahatlıqda olur. Bəs belə bir vəziyyətdə də mehriban olub, Allahın əzabını yaddan çıxartmayıb. Allahın əzabından qorxan adam, başqa hallarda daha da qorxu içində olar. Xülasə, yəni bütün hallarda qəlbimiz qəsavətli olmayıbdır. Həmişə günahdan, .Allahla müxalifətçilikdən qorxurduq

Bəzi təfsirçilər deyiblər, ehtimal vardır ki, “əhlimizin arasında yumşaq qəlb idik”, cümləsindən məqsəd onların öz əhli üçün ürəkləri yanmasıdır. Yəni biz onlara görə .Allahın əzabından onların qəsavət və bədbəxtçiliyindən qorxuda idik

Allah-Taala bizim boynumuza minnət qoydu; lütfü ilə, rəhməti ilə itaət etməkdə tövfiq verməklə, günahdan qorunmaqla və axirətdə Cənnətə daxil etməklə. Bizi odun əzabından qorudu. Odun əzabı, nəhayət istidə bədənin dərisindən tərin xaric olması .üçün olan kiçik-kiçik məsamələrə nüfuz edən külək kimidir

Bəzi təfsirçilər deyirlər “Səmum” Cəhənnəmin adıdır. Bilmək lazımdır ki, “fəminəllah”-ın farsı təfsiri nəticə almaq üçündür. Yəni dünyada Allahdan qorxmağın nəticəsi ilahi hədiyyələr, Cəhənnəmdən xilas olmaq və Cənnətə daxil olmaqdır. öləndən sonra çətinliklərdən amanda olmağın miqdarı, insanın ölməsindən qabaq qorxusu qədərdir. Yəni insan ölməmişdən qabaq nə qədər qorxusu olsa, o qədər də öləndən sonra çətinliklərdən amanda olacaq. Çünki, nə qədər qorxu çox olsa insan günahı tərk etməkdə, itaətdə, ibadətdə daha çox çalışqan olur. Doğrudan da nə qədər ki, ürək Allah qorxusundan yanıb kövrəlməyib, ölüm vaxtı Allahın mehribançılığına, lütfünə :rəhmət nidasına layiq olmayacaq. Necə ki, “Füssilət” surəsində buyurur

ölüm anında mələklər onların yanına enərək onlar üçün Cənnəti müqdə verirlər və“ ”!deyirlər: Qorxmayın! qəmgin olmayın

Nə qədər (Allahdan ) qorxsan, bir o qədər ölən vaxt rahat olacaqsan və əksinə, nə qədər çox asi, itaətsiz olsan və təkəbbür etsən bir o qədər ölən vaxt qorxu və .biçarəliyin artacaq

### ÖLÜMDƏN SONRA ƏMİN–AMANLIQ

Həzrət Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm-dən nəql olunur ki, o Həzrət :buyurdu

Allah-Taala iki qorxunu bir ürəkdə toplamaz. Bir nəfər dünyada Allahdan qorxsa – mümkün deyil ki, Allah-Taala onu öləndən sonra da qorxaq saxlaya. Həmçinin iki əmin amanlıq birlikdə yığılmaz. Bu dünyada Allahdan qorxmayan daşürəkli adam o dünyada .qorxu içində olmalıdır

Quranın bu ayələri, bu biçarələrin qəlbində niyə öz təsirini qoymur? Elə bir Quran ki, .ayələri dağları titrədir

Sən nə bilirsən ki, imanla dünyadan gedəcəksən? Böyük şəxsiyyətlərin bəyan etdikləri qorxu bundan ibarətdir ki, qəlb, ürək ağrıya. İndi qəlbinə müraciət et, gör dərdli və ağrılısan, yoxsa yox? Əgər canavar sənin üstünə gəlirsə gör necə ürəyin sıxılır, əgər evinin, mağazanın yanında od alovlanıbsa və indi bütün evin, mağazan yanacaqsa, gör necə qorxursan, necə titrəyirsən! Qəbrin, bərzəxin, Qiyamətin odlanmasına səbəb olan günahdan da o cür qorxursan? İmam Həsən əleyhis-salam ölümü yadına salıb .ağlayırdı

Şeyx Səduq “Əmali” kitabında rəvayət edib ki, İmam Həsən əleyhis-salam elə ki, qəbri, həşri, siratdan keçməyi yadına salırdı, ağlayırdı, elə ki, “ərz ə”ləllahı” yadına salırdı, fəryad çəkib qəşş edirdi, elə ki, Cənnəti, Cəhənnəmi yadına salırdı ilan vuran adam .kimi titrəyirdi və qıvrılırdı. Cəhənnəmdən Allaha pənah aparıb Cənnəti istəyirdi

:Şeyx Şuştəri deyir

Mənə deyirlər bu qədər xalqı qorxutma! Necə onları qəbrdən, bərzəxdən, siratdan“ hesabdan, qorxutmayım? Nədən qorxutmayım? Şeytan sizə deyir ki, qorxmayın, mən də şeytana kömək edim? Şeyx sizə Allah və Onun Rəsulu tərəfindən deyir ki, qorxun! ”.Amma siz qorxmursunuz, sizdə qorxu yaranmır

.Yəni qorxu yəqin əhlinindir

Əgər insan yəqin dərəcəsinə çatsa başa düşər ki, qorxmaq nə deməkdir. Əli əleyhis-salamın qorxusunu eşitmisiniz ki, Allah qorxusundan ağac kimi quruyurdu. Əgər

insanda Allah qorxusu və liqaullah Allah görüşünün şövqü yaransa, bu dünyaya meyl .etmək öz işinin dalınca gedir. Buna görə də Mömin gərək Allah qorxusunu ələ gətirsin

Bir neçə cümlə ərz edim. Ola bilsin ki, biz də ömrümüzün bu axır çağında Möminlərə oxşayaq. Allah qorxusunu ələ gətirmək üçün ən mühüm yollardan biri, bizim dövrdə çətin və az tapılsa da qorxu əhli ilə oturub durmaqdır. Əgər bu cür adam tapdın, onun yanında otur, təki onun qorxu nuru sənin üstünə də saçsın. O cümlədən, alimlərlə oturub durmaq lazımdır. Alimlərlə söhbət etməyə rəğbət bəsləməyin səbəbi budur ki, alimin qəlbi atəşlə doludur. Əgər bir nəfər alimlərin məclislərindən qaçsa xəcalətli olacaq. Hətta İmam Səccad əleyhis-salam alimlərlə bir yerdə oturmağı təmənna :edirdi

”.İlahi, alimlərin məclisində olmadığıma görə məni öz başıma buraxdın, xar etdin“

İbni Babəveyh nəql edir ki, bir gün Rəsuli Əkrəm bir ağacın kölgəsində oturmuşdu. O gün çox isti idi. Birdən bir şəxs gəldi. Paltarını soyunub yerin üstündə qıvrılmağa başladı. Gah qarnını, gah da alnını isti torpağa sürtərək deyirdi: Ey nəfs! Dad bu əzabı! Allahın əzabı bundan da böyükdür. Həzrəti Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm ona baxırdı. Sonra həmin şəxs paltarını geydi. Həzrət onu yanına çağırdı və buyurdu: Ey Allahın bəndəsi! Səndə bir iş gördüm ki, onu heç kəsdə görməmişdim. ?Sənin bu işi görməyinə nə bais oldu

Həmin şəxs dedi: Allah qorxusu məni bu işə vadar etdi. öz nəfsimə bu istiliyi .dadızdırıram bilsin ki, Allahın əzabı bundan da şiddətlidir və ona dözməyə tabı yoxdur

Həzrət buyurdu: Allahdan qorxmağın ləyaqətli qorxudur. Həqiqətən sənin Allahın sənə .görə asiman mələkləri ilə iftixar edir

.Sonra Həzrət öz əshablarına buyurdu: Bu kişiyə yaxınlaşın, sizi dua etsin

Elə ki, əshablar o kişinin yanına getdilər o dedi: Ey Allah! Hamını hidayət yoluna topla! !Bizim üçün təqvanı azuqə et! Bizim qayıdacaq yerimizi Cənnət et

Bu hədisin axırından başa düşürük ki, xovf əhli Allah dərgahına yaxındır və onun duası qəbul olunur. Hər kəs dünyada xof əhlidirsə axirət aləmində rahat olacaq. Allah-Taala "Səmum"un dəhşətli əzabından onu qoruyur. "Səmum" isti şiddətli külək deməkdir. Bu külək Ərəbistanın ən isti hissələrində olur. Onun istiliyi qulaq, burun və boğazdan

olur ki, dəvəni o cür böyük olmağı ilə belə gicəldib yerə sərir və ya öldürür. Bu dünya aləminin “Səmum”udur. Aman axirət aləminin “Səmum”undan! Bu “Səmum” Cəhənnəmdə də vardır. “Səmum” əzabından xilas olanlara deyirlər: Allah-Taala bizi !Cəhənnəmin “Səmum”unun əzabından qorusun

## QORXU ATƏŞİ ÜRƏK XƏSTƏLİKLƏRİNİ ARADAN APARIR

:Həl əta" surəsində pak və məsum Əhli-beytin tərifində buyurur"

".Bütün günahkar və tüğyan əhlini çətinliyə, əzaba salan Qiyamət günündən qorxurlar"

:Həmçinin buyurur

Onlar Qiyamətin dəhşətli günündən qorxduqları üçün Allah-Taala onları həmin günün pisliyindən qorudu. Onlara təzə ruhiyyə, üzüaçıqlıq və şad ürək verdi. Deməli dünyada Qiyamətdən qorxmağın nəticəsi axirətdə əmin-amanlıqda olmaqdır. Düzgün qorxu .budur ki, insanı da hər bir günahadan və itaətlə müxalifətçilik etməkdən saxlasın

Bu ümumi bir və"dədir. Elə buna görə ərz edirəm ki, hər kəs öz qəlbinə müraciət etsin. Nə qədər ürəyində qorxu çox olsa, ölən vaxt daha da rahat olacaqsan. Əgər ürəyində qorxu olmasa da gərək öz əməlinə görə nalə və fəryad çəkəsən. Qorxu təkamül sifətlərindəndir. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurur: "Elm və ".hikmətin əsası Allahdan qorxmaqdır

Xovf Allah qorxusu alimlərin sifətidir. Qorxu əhli ən uca dərəcədədir. Qorxu əhlinin hesab-kitabı yoxdur. Bir cümlə yada salıram, təki qorxu atəşi ürəklərdə alovlansın. Əgər bu cür olsa, ən kiçik nəticəsi dünya məhəbbətinin məhv olması, həsəd, paxıllıq, rəyasət məhəbbətinin və s. ürəkdən çıxması olacaq. Arzu, istəklər azalacaq. Bir nəfər qorxu əhli olsa artıq başqası ilə dava-dalaşı olmayacaq. Qorxu atəşi ilanın sancması kimidir. Əgər ilan çalanın üstündə milçək də olsa hiss etməz. Həmçinin qorxu əhlinin ürəyi başqa yerdədir, özünü iki böyük xətərin arasında görür, biri Cənnətə getməmək, o birisi isə Cəhənnəmə getmək. Bu cür adam Cənnət və Cəhənnəmdən başqa heç bir yaxşı və pisliyi başa düşmür. Bu qədər zülmlər, həsədlər, paxıllıqlar, əzablar və başqa şəhvətlərin insanda tapılmasının səbəbi qorxunun olmamasıdır. Əgər bir nəfər qorxu əhli olsa, yəni ilan çalan adam kimi olsa, nə qədər gözəl qadın da onun qarşısına çıxsa .diqqəti ona yönəlməyəcək

## QORXU GƏTİRƏN FİKİRLƏR

Ruhun ağrısı da cismin ağrısı kimidir. Ruh ağrısı olan insana dünyanın bütün səs-küyləri təsir etmir. İmamlar əleyhimussalam Allah qorxusunu nur adlandırıblar. Bu nur ürəyə saçsa ürək sahibi çox xoşbəxt olar. Qorxunun əlaqə tapdığı şeylər iki yerə bölünür: keçmiş və gələcək. Kimin günahı yoxdur? Deyirsən tövbə vardır, yəqinin vardır ki, tövbən qəbul olubdur? Fərz edək ki, tövbən qəbul olubdur. Bəs sabah Qiyamət günü etdiyin günahın xəcalətini çəkməyəcəksənmi? Məgər hər bir etdiyin günaha görə düzgün tövbə etməyinə yəqinin vardırmı? Halbuki, çoxlu günahlar insanın nameyi-əməlində yazılıbdır, lakin o bunlardan xəbərsizdir, ya da həmin .günahlardan tövbə etməyi yaddan çıxardıbdır

Ola bilsin ki, çoxlu etdiyin günahlar yadında deyil. Amma öz xəyalında fikirləşirsən ki, günah etməyibsən, halbuki, sənin nameyi-əməlində yazılıbdır. (Bəlkə də mində bir günah insanın yadından çıxır.) Bəzi vaxt kiçik işlər Allahın yanında böyükdür. Məsələn: əgər anana üzünü turşutmusansa bu böyük günahdır. Lakin özün də ona diqqət etmirsən. Kim nə bilir? İnsan iş görəndə xəbəri olmur, sonra da yadından çıxarır və ya .onu kiçik hesab edir. Halbuki, Allahın yanında böyükdür

?Keçmiş əməllərinin qəbul və düzgün olmaq şərtlərinə əməl etmisənmi

.Keçən işlər də iki cürdür; günah və savab

Keçmişdə etdiyin işlərin ikincisi yaxşılıqlar və savab işlərdir. Yaxşı işlərinin qəbul olmasına yəqinliyin vardırmı? Riya və qurur onu məhv etməyibmi? Buna kimin yəqinliyi :vardır? İmam Cavad əleyhis-salam buyurur

Kişinin əqli onun işlərinin ehtimallarının çoxluğu ilə tanınır. Əgər fikrin fəaliyyəti" çoxdursa əql vardır. Əgər bu cür deyilsə əql işləmir. Bunların hamısına göz yumsaq, fərz etsək ki, keçmiş əməllər qəbul və düzgünlük şərti ilə qəbul olubdursa, qorxmursan ki, sabah fəzl və kərəmlə (Allah öz fəzl və kərəmi ilə) səninlə rəftar etməz. Bəlkə Allah öz ədaləti ilə səninlə rəftar edəcək. Əgər səndən Allahın dərgahında qəbul olan bir əməli istəsələr, məsələn, Allahın əzəmətinə layiqli olan iki rəkət namaz qılıbsanmı? ömründə bir gün Allahın həqiqi bəndəçiliyini keçirmisənmi? Əgər Qiyamət günündə

əməllərinin muzdunu hesab edib sənə vermək istəsələr, bil ki, bütün əməllərin sənə dünyada verilən ne”mətlərin qarşısında heçdir və yüz faiz borclu da qalacaqsan. Buna baxmayaraq, əgər hər əməlin qarşısında onun layiqli muzdunu sənə vermək istəsələr, görərik ki, insanın əməli düzgün qiymətə malik deyildir. Məsələni daha da aydın bəyan etmək istəyirəm. İnsanın bədəni, yaxud malı ilə yerinə yetirdiyi hər bir ibadət və itaət Allahın ne”mətləridir. Məsələn, qıldığı namaz Allahın onun üçün xəlq etdiyi bədənlədir, sağlamlığı Allah veribdir, tövfiqi Allah veribdir. Əgər bir malı infaq edirsə, malın özü Allahındır. O malı infaq etmək tövfiqi də Allah tərəfindəndir. Həmçinin başqa əməllər. Elə buna görə, Həzrət Davud əleyhis-salam ərz etdi: “Ey Allah, necə Sənə şükür edim ”.ki, həmin şükür də Sənin tərəfindəndir və Sənin ne”mətinin vasitəsi ilədir

Gərək bunun özünə də şükr edəsən. Allah-Taala ona vəhy etdi: “Ey Davud! Sən, Mənə ”.şükr etməyə aciz olduğunu e”tiraf etdiyinə görə səndən razıyam

Xülasə, bədəni, ruhu, var-dövləti, ümumiyyətlə bütün varlığı Allahın sırf mülkü olan bir adamın vəzifəsi bəndəlik edib Allahın hökmlərini yerinə yetirməkdir. Eyni zamanda bunun qarşısında heç bir əcr və muzd almaq haqqına malik deyil. Bu həqiqətdən əlavə (hələ bu həqiqətə göz yumsaq da) hər gün yüzlərlə təzə ne”mət bir insana çatırsa, əqlin hökmü ilə gərək o ibadət və itaətlə onun şükrünü yerinə yetirsin. Belə olan halda, əgər başa düşüb, insafla gecə-gündüz dayanmadan ibadət və itaət etsə, o günün bir .ne”mətinin də şükrünü yerinə yetirə bilməz

Rəvayət olunur elə ki, Həzrəti Zeynül-abidin əleyhis-salam Əbdülməlikin yanına getdi, Əbdülməlik gördü İmamın bədəni ibadətin çoxluğundan zəifləmişdir, gözləri çuxura düşüb, alnı səcdə etmək nəticəsində qabar bağlayıb. Əbdülməlik narahat olaraq dedi: Ağa! Niyə özünü ibadətin çətinliyində çox saxlayırsan. Halbuki, sənin yerin .Cənnətdədir. və cəddin Rəsulullahın şəfaəti sənin üçündür

:İmam buyurdu

And olsun Allaha, əgər ibadət və səcdənin çoxluğu nəticəsində bədən üzvlərim tikə-“ tikə olsa, iki gözüm yerindən çıxsa, yenə də Allahın saysız-hesabsız ne”mətlərinin .içində, bir ne”mətin onda bir hissəsinin şükrünün öhdəsindən gələ bilməyəcəyəm

Bu dastana diqqət edin! Bir gün bir vaiz Harunər-rəşidin yanına gəldi. Harun ondan nəsihət almaq istədi. Vaiz dedi: Əgər susuz olasan, suzuzluqdan həlak olmağa .yaxınlaşasan, su da tapılmaya, bu zaman hansı məbləğə su almağa hazırsan

.Harun dedi: Mülkümün yarısını verməyə hazıram

Vaiz dedi: Əgər sidik kanalın tutulsa, sidiyini xaric etmək üçün hansı məbləği verməyə ?hazırsan

.Harun dedi: Mülkümün qalan yarısını verməyə hazıram

Vaiz dedi: Belə isə, gərək səni mülk aldatmasın. Çünki, sənin mülkünün qiyməti içdiyin bir qurtum su və səndən xaric olan bir qətrə sidik qədərdir. Deməli, bir adam gecə-gündüz Harunun məmləkətinə bərabər olan suyu dəfələrlə içir. Amma adamın işlərinin qiymətini onun fəhləlik haqqını nəzərə alaraq, sübhdən axşama qədər zəhmət çəkdiyi işin pulunu, sübhə qədər yatmayıb daim qarovul çəkdiyinin pulunu ona verirlər. Bəs sübhə qədər namazla, Quran zikri ilə gecəsini keçirən şəxs əgər öz muzdunu istəsə, işinin qiyməti məlumdur. Lakin mənim dediyim sözlərdən məqsəd Allahın ədalətini bəyan etməkdir. Bu qədər məsələni şərh verməkdən məqsədimiz bu idi ki, Möminlər qürura düçar olub, Allahın qəzəbindən xəbərsiz olmasınlar. Necə ki İmam əleyhis-:salam ərz edir

İlahi, Sən cəlal sahibisən, sənin yalnız ədlətindən qorxarlar, Sənin yalnız ehsan və“ ”.fəzlinə ümid bəsləyərlər

Allah-Taala Mömini yaradandan sonra ona əql və ixtiyar verdi. Ona itaət və bəndəlik yolunu göstərdi. Onun imanı və bəndəliyi üçün elə savab nəzərə aldı ki, heç göz :görməyib, heç qulaq eşitməyib, heç qəlbdən keçməyibdir. Necə ki, buyurubdur

Hətta əgər bir dəfə “subhanəllah” desə onun üçün behiştdə heç vaxt qurumayan bir“ ”.ağac əkilir və onu suvarmağa da ehtiyac yoxdur

Mömin nə vaxt ürəyi hər növ meyvə istəsə o ağacda görür və dərir. Bəli, əgər adamın danışığı və rəftarı özünə və ya başqasına xatir olsa, həqiqi qiyməti olmaz. Amma əgər Allaha xatir olsa, Allah böyük olduğu üçün o da böyük olacaq. Bu mətləbin şərhi çoxdur.

İşarə etdiyimiz qədər kifayətdir. Məqsəd Möminin həmişə qorxu və ümid arasında olmasıdır, yəni Allahın ədalətindən şərh etdiyimiz kimi qorxsun, Allah fəzlinə ümidvar olsun, onu istəsin. Əgər Allahın ədalətindən qorxmayıb öz işləri ilə qürurlansa bilsin ki, çox böyük

səhvə yol veribdir. Bu cür vəziyyət, ilahinin fəzlindən məhrum olub, ondan bəhrələnməmək əlamətidir. Dediklərimin xülasəsi bundan ibarətdir ki, əməlsiz, savab və ilahi fəzlə ümid bəsləmək qürur və axmaqlıqdır. Elə bil ki, toxumu səpməyir, amma gözü xırman dalındandır. Həmçinin, yalnız əməl sahibi olmaqla öz əməlinə fəxr etmək də nadanlıqdır. Gərək elə əkinçi kimi olasan; belə ki, Allah-Taalanın onun torpağa əkdiyi toxuma bərəkət verməsinə ümidi vardır. Belə olarsa, Allah-Taala artıqlaması ilə .rəhmət edəcək

.Yəni gərək Allahın hədsiz fəzl, rəhmət və kəraminə ümidvar olub sevinək

Amma gələcəyinin pis olmamağına, qəlbinin qəsavət bağlamamağına, imtahan qarşısına çıxanda onun öhdəsindən gəlməyinə necə xatircəm ola bilərsən? Fəqirliyə, xəstəliyə düçar olsan, şikayət və giley qapısını açma. Bunlardan əlavə, aman ölüm saatından! Allahdan qorxanlardan birinin haqqında yazıblar, o dostuna vəsiyyət etdi ki, ölən vaxtı iman əlamətini məndə görsən sevinə-sevinə mal-dövlətimin üçdə birini infaq edib Allah yolunda verərsən. Əgər gördün ki, iman əlaməti yoxumdur və imansız .dünyadan gedirəm, camaata de, mənim cənazə mərasimimdə iştirak etməsinlər

Axırıncı saatda kim bilir necə öləcək? ölüm saatının qorxusu hər şeydən şiddətlidir. Hətta İmam Zeynül-abidin əleyhis-salam buyurur: "Ey Allah ömrümün axırıncı saatını "!həyatımın ən yaxşı saatı qərar ver

Əgər öləndən sonra bərzəx aləmini, qəbri, siratı, məhşəri də nəzərə alsaq gərək daha da çox qorxaq. İnsanların çoxlarının qəlbi qorxu ilə doludur, amma şeytani qorxu ilə, .rəhmani qorxu ilə yox

!Allah qorxusu olan adama canım qurban olsun

Dünya yaşayışına aid olan xoşagəlməz hadisələrdən qorxmaq şeytani qorxmaqdır. Məsələn, kasıblıqdan qorxmaq, xəstəlikdən qorxmaq, arzulara çatmamaqdan qorxmaq, nəfsani həvəslər..., insanların çoxu bu cür qorxulara giriftardırlar. Halbuki, bu qorxuların hamısı mövhumatdır və şeytanın vəsvəsələri ilə yaranır. Çünki, hər bir insan gələcəkdə yaşamasına yəqini yoxdur. Buna görə də gərək onun qəm-qüssəsini çəkməsin. Çoxlu insanlar gələcəyinə qüssəli idilər, lakin yaşamadılar və torpaq altında

qaldılar. Əgər fərz edək gələcəyi də görəcək, amma ola bilsin ki, qorxduğu hadisə baş verməyəcək. Başqa

bir tərəfdən, Mömin Allaha təvəkkül edir və Allahı özünün vəkili edir, hər bir hadisədə heç vaxt şeytanın vəsvəsəsinə aldanmır, həmişə əmin-amanlıqda olur, ürəksıxıcı .vəziyyətlərə düçar olmur

Müvəffəqiyyətsizlikdən, ilahi fəzldən məhrum olmaqdan qorxmaq isə rəhmani qorxudur. Rəhmani qorxu aqibətin pis olmasından, öləndən sonra "əqəbatın" qorxulu :olmasından qorxmaqdır. Elə buna görə də Əmirəl-Möminin Əli əleyhis-salam buyurur

Heç kim öz günahından başqa heç nədən qorxmasın və Allahdan başqa heç kəsə" ".ümidi olmasın

## BƏNİ–İSRAİL QöVMÜNDƏKİ ALLAHDAN QORXAN ABİD

Allahdan qorxanların hekayələri çoxlu kitablarda yazılıbdır. Bəzi kitablarda yazıblar ki, Bəni-İsrail tayfasında xəbis fahişə bir qadın olubdur. Onun adəti evinin qapısını açıq qoyub, özünü bəzəyib, qapının qarşısında oturmaq idi. Hər kəs onun qapısının ağzından keçmək istəsəydi, dərhal tələyə düşərdi. İslam dinindən qabaq fahişələr .evinin üstünə bayraq sancardılar, taxta vurardılar

Bu fahişə qadının xasiyyətlərindən biri on dinar pulu qabaqcadan almaq idi. Bir gün, bu cür işlərin əhli olmayan br nəfər saleh və abid bir nəfər həmin fahişənin evinin yanından keçdi. Bu abid ömrü boyu təqva toplamaqdan və Allaha bəndəlik etməkdən başqa heç bir iş görməmişdi. Elə ki, bu yerdən keçirdi, gözü bu fahişəyə sataşdı, ayaqları süstləşdi, qadının camalı, gözəlliyi onu özünə cəlb etdi. İllər boyu etdiyi ibadətdən sonra istədi həmin evə girsin. Gördü, məmur deyir ki, on dinar ver, sonra evə gir. Pulu yox idi. Tez gedib bir şey satdı və on dinarı verib fahişənin evinə girdi. Fahişənin yanında oturdu. Haram işi görənə qədər bir dəfə bədəni titrədi. Rəhmani fikirləri zehnindən keçirdi, elə titrədi ki, qadın da onun vəziyyətini gördü. Qadın dedi: !Niyə titrəyirsən? Bu fikirləri at başından

.Abid dedi: Allah burada hazırdır (görür), Ondan qorxuram

?!Qadın dedi: Bunu çoxları arzulayır. Sən gedirsən

.Abid dedi: Verdiyim pulu da sənə bağışlayıram, amma məni burax gedim

Abid evdən çölə çıxdı və arası kəsilmədən bu işinə görə fəryad çəkirdi. O özünü ələ ala bilmirdi. Buna görə də şəhərdən çıxıb başqa yerə getdi. İndi görün bu abidin işinin nəticəsi nə olacaq? Həmin zinakar qadın fikrə getdi. öz-özünə dedi: “Kül başına! Bu kişi indiyə qədər günah etməmişdi. İndi ki, günah etmək istədi, bu cür halı biri-birinə dəydi. ?Sən ki, bir ömür xarab iş görmüsən, bəs indi nə etmək istəyirsən

Həmin qadın o saat gedib evin həmişə açıq qapısını bağladı. Peşman oldu öz pis əməlindən. Həmin abidin dalınca gedib onunla evlənmək fikrinə düşdü, təki Allah-Taala onu bağışlasın. Abidin dalınca getdi. Ona göstərdilər ki, həmin abid filan kəndə gedibdir. Qadın o kəndə gəldi. Elə ki, o pak kişinin yanına çatdı çadrasını üzündən çəkdi ki, onu kişi tanısın. Qadın dedi: Tövbə etmək üçün gəlmişəm. Sonra üzünü çadra ilə bağladı. Elə bu zaman abid kişi qışqırdı və dünyadan getdi. Qadın üzünü göylərə tutub dedi: Ey Allah! Keçmiş işlərimdən peşman olmuşam. Bu pak kişinin yanına gəlib onunla evlənmək istədim, təki keçmiş səhvlərimi düzəldim. İndi ki, o dünyadan getdi, mənim .də canımı al və ona qovuşdur

Elə bu qadın da dünyadn getdi. Axirət aləmində də bir yerdə olmaqlarına yəqinliyim .var

Elm və mərifət öz batini vəziyyətinin xovf və Allah qorxusunu artırmaq üçün ən gözəl vasitədir. Elə buna görə də tövsiyyə olubdur ki özünüz haqqında çox fikirləşin. Qeybət, :töhmət və s. başqa xoşagəlməz fikirlərə əl atmayın. Həzrət Əli əleyhis-salam buyurur

Allah rəhmət etsin o adama ki, elə öz eybləri haqqında fikrə gedibdir, hətta“ ”.başqalarının eybləri yadına düşmür

:Həmçinin buyurur

”.Elə ki, Allah-Taala bir bəndənin xeyrini istəyir, eyblərini gözünün qabağına gətirir“

.öz eybindən xəbərsiz olmaq bədbəxtçilikdir

Bir nəfər elm əhli dedi: Bir gecə öz haqqımda fikirləşirdim ki, əgər ölümüm çatsa necə olacağam, nicat və Cənnət əhli olacağam, yoxsa Cəhənnəm əhli? öz-özümə deyirdim: Məni Cənnətlik edəcək xatircəm olduğum bir əməlim yoxdur. Yalnız imanım və Əhli-beytin məhəbbəti qəlbimdə vardır. İman və Əhli-beytin məhəbbəti nicat tapmağıma, Cənnətə daxil olmağıma səbəb olsa da, bəs hədsiz günahlarımla nə edəcəyəm? Allah-Taala bağışlamasa, Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm və onun Əhli-beyti .şəfaət etməsə, günahlarımın əzabı çox çətin olacaq

Bu qəm-qüssədə idim. Məni yuxu apardı. özümü vəhşətli bir səhrada yalqız gördüm. Üryan idim. Yalnız göbəyimdən ayaqlarımın üstünə qədər özümü bükmüşdüm. Bədənim çibana oxşar qara dənələrlə və yanıqla dolu idi. Məkanın vəhşəti və eybəcərliyi məni olduqca biçarə etmişdi. Birdən bir nəfər aşkar oldu. O dedi: Qiyamət bərpa oldu. Səni hesaba çəkmək üçün çağırırlar. Sonra məni apardı. Başqa bir nəfər gəlib dedi: "Səni oda atmağa məmur olmuşam." O iki məmurun şiddətli həmkarlığı ilə sol tərəfə gedirdim. Onlara dedim: "Məni Allahın Rəsulunun və İmamların yanına ".aparın." Dedilər: "Bizim icazəmiz yoxdur

Sonra birdən gördüm ki, sağ tərəfdən Rəsuli Əkrəm və Əmirəl-Möminin Əli əleyhis-salam oturublar. Onların yanında üç nəfər də vardır. Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm işarə edərək məni tələb etdi. Elə ki, o Həzrətə yetişdim, xəcalətin şiddətindən, çılpaqlığımdan, bədənimin rüsvayçılığından və oda Cəhənnəmə məhkum olmağımdan başımı aşağı salıb, salam verdim. Allhın Rəsulu mənim nameyi-əməlimi :istədi. Yaxşılıqlarım olan səhifədə bir sətir yazılmışdı

."İman və Əhli-beytin məhəbbəti"

Daha orada başqa yaxşılıqlar yox idi. Lakin pisliklərim olan səhifə pozuldu və yaxşılıqarım olan səhifə yazı ilə doldu. Xülasə, Rəsuli Əkrəm əmr etdi ki, məni Cənnətə aparsınlar. Cənnətdə olan bir çayda qüsl etdim, bədənimin bütün çirkinlikləri pak oldu. .Cənnət paltarlarından geydim və Cənnət meyvələrindən yedim

Bu dastanı nəql etməkdən məqsədim ilahi lütfün bir numunəsini bəyan etmək idi. Allah-Taala öz bəndələrinə ölməmişdən əvvəl batini və bərzəxi sifətlərini göstərir, təki özlərini islah edib hazırlasınlar. Tövbə suyu ilə öz çirkinliklərin yusunlar. Yalnız şəfaətə arxalanmasınlar. Şəfaətə çatana qədər dəfələrlə çətinliyə və təzyiqə düşməklərini .bilsinlər

Allah-Taalanın əzəməti, böyüklüyü, intiqam alması, şiddətli əzabı, əzab edənlərin ən əzab edəni, Qurani-Məcidin bəyan etdiyinə əsasən qahiriyyəti və əzabının möhkəm .olması haqqında fikirləşmək qorxunu yaradan səbəblərdən biridir

Doğrudan da insan nə qədər Allahı yaxşı və çox tanısa, bir o qədər xəşyəti və qorxusu .çoxalar

Hətta bu cür Allah tanımaq bir həddə çatır ki, insanın həlak olmasına səbəb olur. Subhanəllah! Kitablarda qorxulu ayələrin vasitəsilə tamamilə dəyişənlər haqqında yazıblar. Mənsur Əmmar deyir: Bir məsciddə idim. Gördüm bir cavan namaz qılır. Başa düşdüm ki, hal əhlidir. Onun yanına gedib dedim: Ey cavan, Cəhənnəmdə “Ləzy” ?adında bir səhranın olmasını bilirsənmi

Cavan bir nə”rə çəkdi və huşu başından getdi. Elə ki, huşa gəldi mənə dedi: Yenə də de! :Dedim

Ey iman gətirənlər, özünüzü və əhlinizi elə bir oddan qoruyun ki, onun odunları“ insanlar və daşlardır, onun üzərində qəliz və şiddətli mələklər vardır.” Cavan bunu eşidərək elə bir nə”rə çəkdi ki, canını Haqqa tapşırdı Sonra onu aparmağa gəldilər. Ona qüsl verəndə gördüm ki, qüdrət qələmi ilə onun sinəsində yazılıbdır: həyatdadır, ”.ali cənnətdə

?Sonra isə onu yuxuda gördüm. Ona dedim: Allah-Taala sənə hansı dərəcəni verdi

.O, dedi: Allah-Taala məni şəhidlərdən də yuxarı apardı

?Dedim: Necə

Dedi: Şəhidlər kafirlərin qılıncları ilə dünyadan köçürlər, mən isə Cəbbar Allahın qılıncı

.ilə

Əgər Quranın ayələri bizə azacıq təsir etsə çox yaxşı olar. Allah eləsin ki, qorxu atəşi qəlblərdə yaransın, təki şəhvətlər və dünya məhəbbəti qəlblərdən çıxsın. Peyğəmbərlər və İmamlar qorxu ölçüsüdür. Hər kəs müraciət etsə başa düşər ki, Əhli-beytdə olan

qorxunu başqalarının qorxusu ilə müqayisə etmək mümkün deyil. Bilmirəm, niyə biz bu qədər qəflətdəyik? Şeyx Şüştəri demişkən, şeytan bizim qulağımıza nə oxuyubdur ki, bu qədər qəflətdəyik? Qorxu saleh, pak adamların xasiyyətidir. Qorxu və ümid olsa, iman da olar. Hər kəsi ki, görsəniz günahdan qaçır, bilin ki, qorxu və xovf əhlidir. Hər .kəs şövqlə yaxşı əməllərə doğru gedirsə-ümid əhlidir

Bizim kimilərin qorxu mənbəsi, əimmə əleyhimussalam qorxu mənbəyi ilə fərqlidir. İmamların qorxu mənbəyi, günahsız olmaqları ilə yanaşı, məhcuriyyət qorxusudur. Onlar qorxurlar ki, öz məqamlarına çata bilməsinlər, öz məqamlarından aşağı ensinlər. Onlar Allahın ədalətindən qorxurlar. Onlar qorxurlar ki, layiqincə bəndəçilik və Allaha .şükr etməyin öhdəsindən gələ bilməyələr

Ənəs deyir: Mədinənin küçələrində Rəsuli Əkrəm ilə gedirdim. Birdən gözlənilmədən o Həzrətin halı dəyişdi, az qaldı yerə yıxılsın. Başını yuxarı qaldıraraq dedi: "Pərvərdigara! Məni

"!bir qırpım göz qədər də öz nəfsimin ümidinə qoyma

Sonra Həzrət mənə buyurdu: "Allah-Taala Yunis əleyhis-salamı bir an öz başına ".buraxdı və o da giriftarçılığa düçar oldu

.Onların münacat və dualardakı nalələri, fəryadları elə buna görədir

Bizim qorxumuzun mənbəsi kiçik və böyük günahlardır. Bizim eşitdiklərimizi imamlar görürlər, Cəhənnəmin nə"rəsini eşidirlər. Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm buyurdu: "Cəhənnəm nə"rə çəkən vaxt, əgər Allahın əmri olsa, məhşər əhlinin ".hamısını udar

Bu barədə hədis çoxdur. Burada da yalnız bir hədisi qeyd edirəm. Hədisin məzmununun xülasəsini deyirəm. Aşağıdakı ayə

Cəhənnəm kafirlər və müşriklər üçün və"də verilən yerdir. Onun yeddi qapısı vardır." ".Hər qapı bir dəstəyə məxsusdur

nazil olandan sonra Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm-in halı dəyişdi və

şiddətlə ağladı. Peyğəmbərin dostları da ağladı. Amma bilmirdilər hansı ayə nazil olubdur. Onların heç biri o Həzrətin ağlamağının səbəbini soruşa bilmirdilər. Həzrəti Salman dedi: Həzrəti Zəhranın gəlib soruşmağından başqa heç bir çarə yoxdur. Həzrəti Zəhra əleyha salam-ın yanına gəlib ərz etdi: Ey Peyğəmbərin qızı! Atanın halı ?dəyişib, gəl soruş, gör nə olubdur

Zəhra çadrasını başına atdı. Salman deyir ki, gördüm ki, Zəhranın çadrasında on iki yamaq vardır. Salman ağlayaraq dedi: Kəsra və Qeysərin qızlarının paltarları hərir, ipək və sündüsdür. Amma Peyğəmbərlərin ağasının qızının paltarı bu cürdür. Bu məsələni Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm-ə ərz edəndən sonra Fatimə əleyha salam buyurdu: Beş ildir ki, mənim və Əli əleyhis-salamın yalnız bir qoyun dərisi varımızdır. Gündüzlər onun üstündə dəvəyə ot verir, gecələr isə onun üstündə yatırıq. Balışımız da xurma lifindəndir. Sonra Fatimə əleyha salam Cəbrəilin hansı ayəni gətirdiyini əziz atasından soruşdu. Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm yuxarıdakı ayəni axıra qədər qiraət etdi. Fatimə Zəhra əleyha salam ayəni eşidəndən :sonra üzü üstə yerə yıxıldı və buyurdu

”!Vay olsun, bir daha vay olsun o kəsə ki, cəhənnəmə daxil olar“

Əshabın hamısı nalə çəkirdi. Əmirəl-Möminin Əli əleyhis-salam əlini başına qoyaraq :qiyamət səfərinin uzun müddətindən, səfər azuqəsinin azlığından nalə edərək deyir

.O Həzrətin söhbətinin davamını “Biharül-ənvar”ın ١٠-cu cildində oxumaq olar

Kifayətül-müvəhhidin” kitabında rəvayətlərlə nəql olunur ki, Cəhənnəmin ١-ci“ təbəqəsinin əzabı qalan altı təbəqəsinin əzabından azdır. Onun birinci təbəqəsi axırıncı peyğəmbərin ümmətindən olan günahkarların yeridir. Həmin günahkarlar orada bir müddət qalandan sonra, Allah-Taala məsləhət bilsə, öz rəsulunun şəfaəti ilə oradan .çıxıb Cənnətə gedəcəklər. Bu haqda həmin kitaba müraciət edə bilərsiz

### !DUA ETMƏK GöSTƏRİŞ DEYİL, YALVARIŞDIR

Bu ayədə başqa bir mühüm məsələyə toxunulur. Bizim Cənnətdə bu dərəcəyə çatmağımızın başqa bir səbəbi dünya evində dua əhli olmağımızdır. Cənnətə gəlməmişdən qabaq dünyada öz Allahımızı çağırardıq. Doğrudan da bizim Allahımız mehriban və bağışlayandır. “Birr” və “barr” mehriban, nazlayan deməkdir. Burada duanın əzəməti, böyüklüyü və əhəmiyyəti aydınlaşır. Duanın mənası, kiçiyin təvazö edərək böyükdən bir şey istəməsi deməkdir. Əgər mövla öz qulundan bir şeyi istəsə, buna göstəriş və hökm deyilir. Lakin qul öz ağasından bir şey istəsə, dua adlanır, hökm yox. Xülasə desək, aşağı

dərəcəlinin yuxarı dərəcəlidən təvazökarlıqla və acizanə bir şey istəməsinə dua deyilir. Daha sadə bəyan etsək, dua acizlik üzündən gədalıq etməkdir. Hər qədər əcr və muzd çox istəsə gərək öz acizliyini duada daha çox bildirsin. Gədaların hər birinin bir cür dilənməyini görmüsünüz, biri bir az aciz olur, o birisi çox aciz olur, üçüncüsü daha çox aciz olur. Hər hansı birinin acizliyi artıq olsa, öz məqsədinə çox yaxşı çatır. Məsələn, sızıdaya-sızıldaya, ağlaya-ağlaya dilənən gədaya hər ürəyi rəhmli insan kömək edir. Bu duanın ədəbi mənasıdır. İndi görək Allah, bəşəri biçarə və aciz yaradıbdır? Yalnız bir yolu, o da bir tərəfli olan yolu, Allahçılıq yolunu onun üzünə açıq qoyub, təki Allahı ?çağırsın

Hər bir bəşərin, ya hal hazırda müsibəti vardır ya da sonra onun üçün müsibət baş verəcək Elə bir kəs yoxdur ki, yaşadığı dövrdə onun üçün xoşagəlməz hadisə baş verməsin. Qüssəsiz ürək bu dünyada yoxdur. Allah bu cür məsləhət bilir, təki insan təzyiqə məruz qalıb, Allaha ehtiyaclı olmasını bilsin, hər tərəfə baxsın, çarə yolu tapa :bilməsin, axırda bir çarə yolu taparaq "Ey mənim Sahibim! Ey mənim Allahım!", desin

Xülasə, dünya yaşayışının bəlaları, çətinlikləri, təzyiqləri insanı Allaha tərəf yönəlməyə və Allahı çağırmağa məcbur edir. Həmçinin böyük çətinlikləri Qiyamət və bərzəx aləminin əzablarını təsəvvür edərək, Allahı yadına salır. Bəşər insanların necə .öldüyünü görüb, "Ey Allah! ölüm vaxtı mənim dadıma çat!" deyir

İnsan görür ki, ölüləri qəbrə qoyandan sonra qayıdırlar, Bu zaman deyir: "Ey mənim "!Allahım! Mənim təkliyimə rəhm et

Siratın adı gələn kimi, nameyi-əməl və onun sağ və ya sol ələ verilməsi, əliboşluğu, .biçarəliyi yadına düşür

Dərdi olmayanlar insan deyillər. Nə qədər dərd çoxalsa o qədər də dərman istəyirsən. Dərman nədir? Dərman duadır. Acizlik, ehtiyac, biçarəlik dua etməyə bais olur. Bunların hamısı müqəddimədir. Allah qadirdir bəşərin hər birini elə yaradardı ki, aciz olmasın. Lakin, Allahın hikməti bu cür tələb edir. Allahın hər kəsə məhəbbəti çox olsa, onun dərdini çoxaldar. Hər kəs bu cür məclisə çox yaxındırsa, ona bəla camını daha da çox verirlər. Bir neçə il bundan qabaq elə burada bu məscid bir nəfər namazın vaxtı keçəndən sonra məscidə gəlirdi. O məscidin sütunlarının dalında ah-nalə ilə namaz

ağlayırdı. Bir neçə müddətdən sonra gördüm əvvəlki kimi namaz qılmır. Böyük bir dünyəvi giriftarçılığın ona üz verdiyi məlum oldu. Giriftarçılıq aradan gedəndən sonra da həmin əvvəlki ibadət halı onda yox idi. Bəndədə bu hal tapılandan sonra ona bir hadisə üz gətirir. Müqəddəs Əhədiyyət nuru! Bu nurla ürəyi işıqlanır. "Ya Allah!", "Ya Rəbb!" deməklə nur saçır. Bunun həqiqətini, dərin mənasını diqqət və əql əhli başa düşür. Başa düşür ki, ən uca hikmət onu, ilahi feyzi başa düşməyə vadar edir, istər hacəti qəbul ola, istərsə də qəbul olmaya. "Biharül-ənvar"ın altıncı cildində belə :rəvayət olunur

Rəsuli Əkrəm ölüm yatağında olanda, Cəbrəil gecə-gündüz o Həzrətin yanına nazil olaraq deyirdi: "Allah-Taala sənə salam göndərir və sənin halını soruşur. Həmçinin .sənin ümmətində xəstəni ziyarət etmək rəsmi olmalıdır

Cəbrail deyirdi: "Ey Müəmməd, bil ki, Allah səni çətinliyə salmayıbdır və Allahın yanında səndən əzizi yoxdur. Lakin Allah Taala sənin səsini və duanı eşitməyi istəyir, təki Allah-.Taala səni bütün xalqdan fəzilətli edərək hazırladığı savaba və dərəcəyə çatdırsın

Əgər Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm rahat olsaydı buyurardı: Allahı tərif və Ona şükr et! Çünki Allah-Taala istəyir ki, sən ona həmd və şükr edəsən, təki öz .fəzlini sənin üçün çoxalda

İddətüd-da"i" kitabında bir hədis vardır. Bu hədis həqiqətləri kəşf edən Əbu Əbdillah" :İmam Sadiq əleyhis-salamdan nəql olunu. O Həzrət buyurur

Allah-Taalanın yanında bir dərəcə vardır. O məqama duadan başqa heç bir şeylə " ".çatmaq mümkün deyil

:Kafi" kitabında da İmam Sadiq əleyhis-salamdan belə nəql olunur"

Allahı, dua edərək çağırıb öz hacətinizi istəmək sizə vacibdir. Çünki dua kimi sizi Allaha" yaxınlaşdıran bir şey yoxdur. Hətta kiçik hacətləri də Allahdan istəyin və utanmayın. ".Çünki həm kiçik hacətləri, həmin böyük hacətləri verən Allahdır

.Yəni, hər bir şeyi Allahdan istəyin, hətta xörəyin duzunu və ayaqqabının bağını

Aləmlərin Rəbbi olan Allahla insanın söhbət etməsi çox böyük ne”mətdir. Həmin şəxs, mən bir saat şahla söhbət etdim deyəndə nə

səh:۵۸

qədər fəxr edər? Bəşərin səadəti Allaha üz tutduğu vaxtdır. İmam Zeynül Abidin :əleyhis-salam Allaha üz tutub ərz edir

Bizə mərhəmət etdiyin ən böyük ne"mət, dua etmək tövfiqidir. Əgər Sənin iznin və" ".əmrin olmasaydı heç vaxt Səni çağıraraq "Ya Allah" deməyə cür"ət etməzdim

Allah-Taala bəndənin duasını çox istəyir. Allah-Taala Musa əleyhis-salama buyurur: "!"Duzu da məndən istə

Bu o demək deyil ki, evdə otur və de: "Ey Allah duz ver!" Bu o deməkdir ki, duz dalınca .gedəndə də Allahdan kömək istə

Həzrət Musa əleyhis-salamın dişi ağrıyanda ona vəhy oldu ki, filan bitkini gedib tapsın və ondan istifadə etsin. Musa əleyhis-salam da o cür etdi və sağaldı. İkinci dəfə Musa əleyhis-salamın dişi ağrıdı. Bu dəfə birbaşa həmin bitki üçün durub getdi. Həmin bitkini dərib yedi. Lakin dişi sağalmadı. Musa əleyhis-salam Allaha ərz etdi: "Niyə bu dəfə "?dişimin ağrısı kəsilmədi

Vəhy gəldi: "Ey Musa, birinci dəfə ümidini Mənə bağlamışdın. İkinci dəfə isə ümidini öz ".təcrübənə və həmin bitkiyə bağladın. Elə buna görə də sağalmadın

Başqa bir hədisdə buyurur ki, Allahın yanında duadan çox heç bir əməl sevimli deyil. Allah istəyir ki, ondan bir şey istəyələr. Çünki, hər dəfə "Ya Rəbb" desən Allah-Taala buyurur: "Ləbbeyk!" Yəni Mən səni eşitməyə hazıram. Əlbəttə, əgər məsləhət olsa, bəndənin hacəti qəbul olacaq, əgər məsləhət olmasa qəbul olmayacaq və həmin dua axirət üçün zəxirə olacaq. Bu qədər bəlalar insanı Allaha tərəf getməyə məcbur edir. Xoş o adamın halına ki, özü Allahı yada sala, bəlanın gəlməsini gözləməyə.. Xoş o .adamın halına ki, duası qəbul olandan sonra yenə də dua edə

Çoxlu rəvayətlərdə yazılıbdır ki, əgər vəba kimi ümumi bəla, ya fəqirlik kimi şəxsi bəla gəlsə, bu bəlanın çox çəkməsini bilmək istəsən, gör dua etməyə halın vardır yoxsa yox? Əgər dua etməyə halın olsa bəla tez çəkilər, əgər dua etməyə halın olmasa bəla .çox çəkəcək

## DUA MƏQAMIN YÜKSƏLMƏSİNƏ SƏBƏB OLUR

Rəvayət olunur ki, əməlləri bərabər olan iki nəfərə Cənnətdə bir yerdə yer verəcəklər. Lakin onlardan birinin dərəcəsi o birinin dərəcəsindən böyük olacaq. Dərəcəsi kiçik olan Allahdan onun səbəbini soruşacaq. Allah-Taala belə buyuracaq: “Sənin yoldaşın ”.dünyada məndən çoxlu hacət istəyirdi, çox dua edirdi

Diqqət etmək lazımdır ki, əmr formasında dua etməməliyik, əksinə gərək yalvarış .formasında dua edək

Bəzi adamlar dua əvəzinə hökm edir. özü üçün məsləhət təyin edir. Deyir, gərək bu cür olsun, o cür olsun. Əgər öz istədiyi kimi olmasa e”tiraz edir. Bu cür etmək lazım deyil. Əgər dua edəndən sonra hacətin verilsə, şükr et! Gəda hara, boynu yoğunluq etmək .hara? O qədər ki, səni saxlayırlar bəsindir və buna fəxr etməlisən, bu sənin şərəfindir

İmam Baqir əleyhis-salam buyurur: Allahın bəndələrindən bəziləri hacət istəyirlər. Allah tərəfindən mələklərə nida gəlir ki, onların hacəti qəbuldur. Amma hələ indi verməyin. Çünki mən onun naləsini sevirəm. Bəzi gədalar kimi ki, evlərə gedib Əhli-beyt (imamları) tərif edirlər. Ev sahibləri onların səsindən xoşları gəldiyinə görə .hacətlərini gec verirlər

## ƏN PAXIL, ƏN ACİZ VƏ ƏN ZÜLÜMKAR XALQ

Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm-dən duanın əzəməti haqqında bir hədis nəql olunur. Həzrət öz əshabına buyurur: İstəyirsiz xalqın ən paxıl, ən aciz, ən ?zülmkar, ən oğru, ən tənbəlinin kim olduğunu sizə xəbər verim

Həzrət buyurdu: Xalqın içində ən paxıl o adamdır ki, bir müsəlmanın yanından keçə, amma ona salam verməyə. Salam vermək elə bir şey deyil ki, onda da paxıllıq edəsən. Salam verməyin yüz savabı vardır. Onun doxsanı salam verənə, qalan onu isə salamın cavabını verənə çatır. Başqa bir cəhətdən salam vermək vəhdət və birlik yaradır. Xalqın ən tənbəli o adamdır ki, bekar ola, eyni zamanda da Allahın zikri ilə məşğul olmaya. Zikr etmək ki, çətin bir iş deyil. “Kafi” kitabında rəvayət olunur ki, əgər bir adam gündə ١٠٠ dəfə “la ilahə

illəllah” desə, heç kəsin ondan çox əməli olmaz. Yalnız ondan çox “la ilahə illəllah” .deyənin əməli onun əməlindən çox olar

Xalqın içində ən zülmkar adam o kəsdir ki, mənim, (yəni Həzrət Peyğəmbərin) adımı“ ”.eşidir, lakin salavat çəkmir

Doğrudan da bizim ruhani atamız və bizə böyük yol göstərən Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm-in adını eşidib salavat çəkməmək nə qədər də böyük zülmdür. Bundan əlavə salavat çəkmək insanın özü üçün də savabdır. Bu hədis kitablarında .yazılıbdır

Xalqın ən oğrusu namazında bir hissəsini oğurlayan adamdır. Məsələn, ruku zikrini düz əda etmir, diqqətlə namaz qılmır, sözlərində və fe”llərində qərar tapmır, səcdəyə çatmamış səcdənin zikrini deyir. Namaz Allah əmanətidir, gərək ona çox əhəmiyyət .verək

:Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm hədisin arxasınca buyurur

Xalqın ən acizi o adamdır ki, dua etməyə acizlik edir.” Bu hissə bizim söhbətimizə“ aiddir Giriftar olur, amma Allaha üz tutub kömək istəmir. Elə bil ki, ölü kimi nəfəs çəkmir, elə bil ki, oğru bir nəfərin evini çapır, amma ev sahibi heç olmasa qışqırmır. Ay cahil insan! Şeytan sənin qəlbində oğurluq edir, heç olmasa “ya Allah” demirsən, Allahdan kömək istəmirsən! İnsan qəlbinin dərdini bilib dua etmirsə necə ola bilər? Quşa da güllə dəyəndə qol-qanad çalır. Bizə güllə dəyibdir, bəlkə bizim namazımız qəbul olubdur?! Biçarə o adamdır ki, nalə də etmir. İmam Zeynül Abidin əleyhis-salam :nalə edərək İlahinin dərgahına ərz edir

”.Günah məni yerə yıxıbdır, Sən məni qaldır“

.Məqsəd duanın əzəmətidir. Dua haqqında rəvayət çoxdur

### İŞLƏR DöRD ŞEYƏ QAYIDIR

Allah tərəfindən bəşərin atası Adəm əleyhis-salama vəhy oldu: Bütün mətləblər, xeyr işlər dörd kəlmədə yerləşibdir. Adəm əleyhis-salam ərz etdi: O dörd şey nədir? Allah-

Taala buyurdu: Biri Mənə aiddir, biri sənə aiddir, biri sən ilə xalqa aiddir, o biri isə .Mənimlə sənə aiddir

Birinci, Mənə aid olan şey budur ki, Mənə ibadət edəsən, Mənim üçün şərik qərar verməyəsən. İkinci, sənə aid olan şey budur ki, ehtiyacın olan şeyi sənə verəcəyəm. Üçüncüsü, səninlə xalqa aid olan şey budur ki, necə ki, ürəyin istəyir xalq səninlə rəftar etsin, eləcə də sən xalqla rəftar et! Dördüncüsü, mənimlə sənə aid olan şey budur ki, sən gərək dua edəsən mən də qəbul edim. Gəda yalvarmaq bacarmırsa ev sahibinin .günahı nədir? Allahdan başqa hər bir şeyi ürəkdən çıxartmaq duanın şərtidir

## ALLAHDAN QEYRİSİNDƏN ÜMİDİ KƏSMƏK DUANIN ŞƏRTİNDƏNDİR

Duanın qəbul olmasının ən mühüm şərtlərindən biri dua edən zaman Allahdan başqa hər şeyi yaddan çıxartmaqdır. Gərək ürəyini Allahdan başqa heç kəsə bağlamayasan. Bu ən mühüm şərtdir. Az olur ki, Allahı hazır bilə, başqalarını aciz. Əgər yalnız Allahı öz nəzərində tutsa duası qəbul olacaq. Elə buna görə də bir nəfər Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm-dən Allahın ismi-ə"zəmini öyrənməyi istədi. Həzrət buyurdu: "!"Ürəyini Allahdan başqa hər bir şeydən boşalt və "Ya Allah" de

## HARAM MAL YEMƏK VƏ MƏZLUMUN AH-NALƏSİ DUANIN QƏBUL OLUNMASINA MANE OLUR

Duanın qəbul olmasının şərtlərindən biri haram çörək yeməməkdir. Haram tikə duanın ۴۰ gün qəbul olmasına mane olur. Həmçinin əgər bir məzlum insanın əlindən nalə çəksə, zalımın duası qəbul olmaz. Bəzi vaxtlar məzlumun ahı insanı alçaqların ən alçağı .dərəcəsinə endirir

Tarix kitablarında yazılıbdır ki, Fir"onun adamlarından biri Bəni israil tayfasından olan bir qızın qulağından sırğanı çəkdi. Qızın qulağı qana bulaşdı. Qız başını qaldıraraq dedi: "!"Ey Allah sən özün bu zülmə şahidsən

İran sultanlarının biri haqqında yazılıbdır ki, bir gün axşam onun yuxusu gəlmirdi. öz-özünə dedi, ola bilsin bir məzlumun ahı mənim

başımın üstündədir. O paltarını geydi və evdən çölə çıxdı. Bir az gəzmişdi ki, məscidin qabağından keçəndə orada kiminsə nalə etdiyini eşitdi. Məsciddə bir məzlum nalə edərək deyirdi: "Ey Allah, sultanı həlak et!" Sultan məscidə girib həmin məzluma dedi: Mən şaham, de görüm sənə kim zülm edibdir?" Həmin məzlum kişi cavab verdi: "Sənin qoşunundan bir nəfər hər gecə mənim evimə gəlir və zorla arvadımla cinsi əlaqədə olur." Şah o kişinin evinə getdi. İşığı söndürüb həmin zinakarı öldürdü. Sonra işığı yandırıb şükr səcdəsi etdi. Ev sahibi ondan soruşdu: "Nə üçün işığı söndürdün və şükr səcdəsi etdin.?" Şah dedi: "İşığı söndürdüm ki, əgər həmin zinakar oğlum da olsa onu ".öldürəm. Şükr səcdəsi də buna görə idi ki, gördüm həmin zülmkar mənim oğlum deyil

## ALLAHA ÜMİDVAR OLMAQ

Duanın şərtlərindən biri də Allaha xoşbin olub ona e"timad etməkdir. İnsan şəkk etməməlidir ki, onun hacəti nə qədər də böyük olsa Allahın qüdrəti qarşısında heçdir. İmam Sadiq əleyhis-salam buyurur: Dua edən zaman elə fikirləş ki, hacətin qəbul .olmaq üzrədir

Duanın şərtləri çoxdur. Amma Allah-Taala o şərtlərin qarşısında müəyyən vaxtları təyin edibdir ki, əgər o şərtlər olmasa da dua qəbul olur. Həmin vaxtlardan biri gecənin axırıncı ۱÷۳hissəsidir. Başqa bir vaxt gecənin ۲-ci hissəsinin ۱÷۶hissəsidir. Əgər bu cür vaxtlarda insan namaz qılsa, hacət istəsə, qəbul olar. Başqa bir vaxt günorta çağıdır. Həmçinin, gün batan çağı, xüsusilə cümə axşamı və cümə gününün axırıncı saatı. Bu .vaxtlar duanın qəbul olunan vaxtlarıdır

Fizzə rəvayət edir ki, Həzrəti Zəhra əleyha salam mehrabda idi. Məni damın üstünə .göndərdi ki, hər vaxt günəş batsa qürub etsə o Həzrətə xəbər verim

## DUA ETMƏYİN İBTİDAİ ƏDƏBLƏRİ

Zahiri və batini paklıq duanın əvvəlinci ədəblərindəndir. Bədən və paltar dua edən vaxt gərək pak olsun. İnsan duadan qabaq gərək qüsl etsin, ya dəstəmaz alsın. Müstəhəb .qüsllərdən biri hacət qüslüdür

Batini paklaşdırmaq üçün gərək dua edən vaxt qəlbi pak edəsən. Məsələn, əgər bir müsəlmana qarşı kin-küdurət və ya bədbindirsə bunu ürəyindən çıxartsın, ya əgər .günah edibsə tövbə etsin

Rəvayət olunur ki, Həzrət Davud əleyhis-salam səhraya münacat etməyə getməmişdən bir həftə qabaq onun müqəddimələrini hazırlaşardı. Məsələn, bir həftə oruc tutardı. O cümlədən, əgər qəlb Allaha tərəf yönəlməsə, işlər düzəlməyəcək. Allaha tərəf ürəyi yönəldiyinə görə gərək ürəyi təmizləyəsən, sonra Allaha tərəf üz .gətirəsən

İmam Sadiq əleyhis-salamdan hədis nəql olunur ki, o Həzrət buyurur: Bəni İsrail tayfasından olan bir nəfər üç il dua edərək Allahdan oğul istəyirdi. Lakin duası qəbul olmurdu. Üç ildən sonra o kinayə edərək dedi: "Pərvərdigara, üç ildir ki, duam qəbul olmur!" Gecə yatdı və yuxuda gördü ki, bir nəfər ona deyir: "Sən üç ildir ki, Allahı çirkin dillə, napak niyyətlə, qürurlu qəlblə çağırırsan. Gərək dilini pis, nalayiq sözlərdən ".qoruyasan, ürəyini Allah qorxusu ilə doldurasan. Təki duan qəbul ola

Həmin kişi bir il qəlbini və dilini paklaşdırdı. Allah da onun duasını qəbul etdi və ona bir .övlad verdi

İddətüd-dai" kitabının müəllifi bu hədisi nəql edəndən sonra duanın qəbul olması üçün" :dörd şərt sayır

;Dili günahdan paklaşdırmaq-١

Niyyəti gözəlləşdirmək. Məqsəd yaxşı niyyətə malik olmaqdır, yəni Allaha qarşı yaxşı-٣ niyyətə malik olmaqdır. Bilməlidir ki, Allah-Taala onun duasını qəbul edəcək. Əgər dua gec qəbul olsa bilsin ki, məsləhət o cürdür. O cümlədən məsləhət bəndənin halını islah .etməkdir

Etdiyi günahlardan tövbə etməkdir, yəni dua etməmişdən qabaq etdiyi günahların-۴ .hər biri üçün peşman olsun və tövbə etsin

Duanın ədəblərindən biri də duadan qabaq sədəqə verməkdir. Necə ki, Allah-Taala :Qurani Məciddə buyurur

“Mal və sərvət sahibi öz sərvətindən gərək infaq edə. Yaşayışı çətinləşən və ya fəqir olan adam da Allahın ona verdiyi ne”mətlərdən infaq etsin”.

səh:۶۴

Allah tərəfindən vəhy oldu ki, hər kəs Rəsuli Əkrəm ilə nəcva etsə, sədəqə versin. Bu ayəyə ancaq İmam Əli əleyhis-salam əməl etdi. Sonra bu ayə nəsx olundu. Xülasə, sədəqə ürəyi şad etdiyinə görə Allah-Taala da sədəqə verənin ürəyini şad edir. .Həmçinin, dua etməmişdən qabaq gərək ətir vurasan

## DUA EDƏNDƏ TƏLƏSMƏMƏLİSƏN

Dua edəndən sonra duanın qəbulu üçün tələsmək lazım deyil. Lazım deyil ki deyəsən, “niyə çox çəkdi” Əksinə, böyük səbrlə, hövsələ ilə dua etməkdən əl çəkməməlisən. :Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurub

”.Əgər bir qapını döysən, axır bir nəfər çıxıb sənə cavab verəcək“

İnsan Allahla söhbət etmək istədiyinə diqqət etməlidir. Ona görə tələsməməlidir. .Namaz qılanda da tələsmək lazım deyil

Rəvayət olunur ki, əgər namazdan sonra bir nəfər dərhal durub getsə, Allah ”!tərəfindən nida olunar: “Mənim bəndəmin mənimlə işi yox imiş

Gərək namazdan sonra namazın təqibatı ilə məşğul olasan. Xüsusilə bu iş, ruzinin .çoxalması üçün çox yaxşı işdir

## HACƏTİ GƏRƏK DİLƏ GƏTİRƏSƏN

Duanın ədəblərindən biri də istədiyi, hacəti açıq surətdə deməkdir. Yəni, istədiyi hacətin adını da gərək desin. Məsələn, əgər borcludursa dili ilə onu qeyd etsin. Əgər ərəb dilini bilirsə, ərəb dilində desin. Xülasə, Allah istəyir ki, hacəti dilə gətirəsən. Buna .baxmayaraq ki, Allah-Taala aşkar və gizli olan şeylərin hamısını bilir

## DUA EDƏNDƏ CİDDİ OLMAQ, İSRARLA İSTƏMƏK LAZIMDIR

Duanın ədəblərindən biri “ilhah” etmək, yəni israr etmək, əl çəkməməkdir. Dilənçiləri görmüsünüz? O, nə qədər çox əl çəkməsə o qədər də istədiyini alır. Çoxlu rəvayət vardır ki, Allah-Taala bir xüsusiyyəti yalnız özünə aid edibdir. Gərək onu Allahdan başqası

üçün yerinə yetirməyəsən. O da bir şeyi alana qədər istəmək və əl çəkməməkdir. Allah-Taala istəyir ki, bəndələri bir şey istədikdə istədiyi şeydə Ondan əl çəkməsinlər. .Heyf olsun ki, insan öz hacətini zəif bir bəndədən almayınca əl çəkmir

Yorulmamaq, incimərnək, xatircəmli və vüqarlı olmaq bunların hamısı duaların .şərtləridir

.özündən başqalarını da gərək dua edəsən

**DUADA BAŞQALARINI DA ŞƏRİK ETMƏLİSƏN**

Duanın ədəblərindən biri də hamını dua etməkdir. Məsələn, əgər bir nəfərin borcu vardırsa yalnız öz borcunu ödəmək üçün dua etməyə, bütün borclu Möminləri öz .borclarını ödəmək üçün dua etsin. Yəni, "mən" kəlməsinin əvəzinə "biz" desin

Mərhum Əllamə Məclisi buyurur: "Allahummə-hdini min indik" kimi duaların əvəzinə "Allahummə ihdina min indikə" duasını oxumaq lazımdır. (Yəni "məni hidayət et" yerinə (."bizi hidayət et" demək

Hamı bir olan Allahın bəndəsidir. Başqalarını da gərək öz duanda şərik edəsən, təki .başqalarının xatirinə, Allah-Taala dua edənin hacətini də versin

Duanın başqa bir ədəbi Allah-Taalanın qüdrətinə arxalanmaqdır. Yəni, hacəti istəyən zaman bilməlidir ki, bu hacəti vermək Allah üçün çox asandır. Sənin hacətin ölünü diriltməkdən çətindir. Allahın qüdrətinə e"timad et, sonra dua et! Yəqin etməlisən ki, .əgər məsləhət olsa Allah-Taala qəbul edəcək

Bəzi vaxtlarda qəribə əhvalatlar baş verir, kimsə infrakt keçirərək ölür, qəbrə qoyulandan sonra huşu başına gəlir. Allah-Taala onlara müxtəlif yollarla qəbirdən .nicat veribdir. Bu cür hadisələri danışsaq söz uzanar

Nəcəfi-Əşrəfdə Şeyx Mühəmməd Həsən Qumi adlı bir nəfər olubdur. O "qəbirdən çıxıb .qaçan" ləqəbini özünə almışdır. Bu hadisəni sizin üçün danışıram

O, cavan yaşında ölür. Məhəmməd Həsən Qumi anasının bircə oğlu idi. Anası evin damına çıxıb dua edərək deyir: "Ey Allah, mənim bir oğlum var idi ki, o da öldü. Onu

.O qədər Allaha yalvarır ki, elə həmin dua etdiyi zaman oğlu dirilir

Bu cür hacətləri yerinə yetirmək Allah üçün çətin deyil. Elə bil ki, Hatəmi Tainin evinə on şahı üçün gedirsən, ya elə bil ki, bir nəfər dəryanın yanında yaşayan adamdan su istəyir. Xülasə, dua edən adam gərək Allahın qüdrətini nəzərə alsın və bilsin ki, hər nə .istəsə bir göz qırpımında istədiyi şeyin qəbulu mümkündür

Görürsən ki, kasıb varlaşır, zəif gücləşir. Axirət hacətləri də bu cürdür, günaha bulaşmış adam, ürəyi qaralmış, daş ürəkli olmuş insan, daha doğrusu ölmüş ya ölməyə az qalmış insanın qəlbini Allah-Taala bir göz qırpımında paklaşdırır, ölmüş qəlbini diríldir. İnsan gərək ürəkdən "əl"əfv" yəni, "Allah, məni bağışla!" desin. öz kiçikliyinə baxma, Allahın böyüklüyünə bax. "Səfinətül-bihar" da İmam Sadiq əleyhis-salamdan bir hədis nəql olunubdur. Həzrət buyurur: Yunus peyğəmbər bir dənə üstün işi yerinə .yetirmədiyi üçün balığın qarnında həbs oldu

Balıq hərəkət edərək Qarun olan yerə çatdı. Qarun təzə bir səs eşitdi. Onun üçün ?məmur olmuş mələkdən soruşdu: Bu səs nədir

Mələk dedi: O səs, balığın qarnındakı Yunus peyğəmbərin səsidir. Qarun dedi: "İcazə verirsən onunla danışım? Mələk ona icazə verdi. Qarun Yunusdan soruşdu: Harun nə vəziyyətdədir? Yunis əleyhis-salam dedi: O dünyadan gedibdir. Qarun Musa əleyhis-salam ın vəziyyətini soruşdu. Yunus əleyhis-salam dedi: O da dünyadan gedibdir. Qarun onların hər ikisi üçün ağladı. Allah-Taala mələyə əmr elədi ki, Qarunun əzabını .öz yaxın adamları üçün ağladığına görə azalt

Başqa bir rəvayətdə yazılıbdır ki, Qarun Yunis əleyhis-salama dedi: Mənim tövbəm Musa əleyhis-salamın əlində idi. Mən o Həzrətə müraciət etdim, amma məni qəbul etmədi. Əgər sən Allaha müraciət etsən və tövbə etsən, sənin tövbəni birinci dəfə .qəbul edəcək

Qarunun günahı Musa əleyhis-salam ilə müxalifətçilik edib o Həzrətə töhmət vurmaq idi. Elə buna görə də onun tövbəsinin qəbul olması Musa əleyhis-salamı razı salmaq ilə bağlı idi. Elə Qarunun Yunus əleyhis-salam ilə söhbəti də bu haqda idi. Lakin, Yunus əleyhis-salam günahı üstün işləri yerinə yetirməməyi də özü üçün günah bilirdi. Allahın

hökmündən narazı qalmaq və öz qövmünə bəlanın nazil olması idi. Elə buna görə də -Yunis əleyhis-salamın günahı Allah

Taalanın qarşısında idi. Günahkar bəndə Allaha üz tutub tövbə etsə, Allah-Taala da .onun birinci dəfə etdiyi tövbəni qəbul edəcək

Bu rəvayətləri nəql etməkdə məqsəd, insanın Allaha qarşı yaxşı niyyətdə olmasıdır. Bəndə hər kim və ya hər nə cür olsa da gərək heç vaxt Allahdan məyus olmasın. Bilsin ki, Allahın rəhmətindən məyus olmaq özü də böyük günahdır. Üstəlik kafirliyə də yaxındır. Bəndənin Allaha olan ümidi möhkəm olmalıdır. Xülasə, dua edən zaman .duanın Allah tərəfindən qəbul olmasına xatircəm olmaq lazımdır

Allahlıq iddiasında olan Firondan pis olan adam ki, yoxdur. Hətta Allah-Taala onun da duasını qəbul etdi və qoşunu ilə birlikdə onu qərq olana qədər rüsvay etmədi. "Biharül-ənvarın" ۵-ci cildində rəvayət nəql olur. O rəvayətin xülasəsini sizin üçün danışıram.

Nil çayının suyu azalandan sonra, misirlilər dedilər: Fir"on Allahlıq iddiası edən .zamandan bəri Nil çayının suyu azalmışdır

Fir"on qoşunu ilə səyahətə çıxdı. O, qoşundan ayrılaraq tək-tənha çayın kənarı ilə gedirdi. O gözdən itənə qədər getdi. Artıq onu heç kəs görmürdü. Fir"on özünü üzüquylu torpağın üstünə atdı. Allahın dərgahına üz tutub yalvararaq ərz edirdi: "Ey mənim Allahım! Mən yalan danışdığımı bilirəm. Lakin, mən səndən axirət istəmirəm, dünyanın rəyasətliyini istəyirəm. Sən məni rüsvay etmə, bu çayın suyunu çoxalt!" Xülasə, su çoxaldı. Elə fikirləşməyin ki, Fir"onun duasının qəbul olunması xalqın azmasına səbəb oldu. Gərək bu cür olmayaydı. Çünki, əgər Fir"on yüzlərlə qeyri-adi işlər görsəydi də onun Allahlıq iddiasında olmasının puçluğu aşkar olacaqdı. Çünki, hər .bir ağıllı insan Fironun başqaları kimi bəşər və aciz məxluq olduğunu başa düşürdü

.Bəli! Fironun duasının qəbul olması misirliləri imtahan etmək üçün idi

## BİRLİKDƏ OLUNAN DUA QƏBULDUR

Duanın ədəblərindən biri də birlikdə dua etməkdir. Ola bilməz ki, ۴۰ nəfər dua etsin və onların duası qəbul olmasın. Nə qədər çox adam

dua etsə, bir o qədər dua təsirli olar. Əgər ۴۰ dənə pak ürək “Ya Allah” desə, necə ola bilər ki, dua qəbul olmasın. Mübahilə hadisəsində Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm tək gəlmədi, İmam Əli, Fatimə, Həsən və Hüseyn əleyhimus-salam ilə birlikdə gəldi. Allah-Taala birlikdə edilən duanı çox istəyir, sevir. İmam Sadiq əleyhis-salam buyurur: Atam İmam Baqir əleyhis-salam mühüm hacəti olanda evdəkilərin hamısını, hətta kənizləri və qulları bir yerə yığıb deyirdi: “Mən dua edirəm, siz də amin ”!deyin

Məqsəd budur ki, dua birlikdə olunsa çox gözəl olar. İstər hamı birlikdə dua oxuya, .istərsə də bir nəfər dua oxuya qalanları amin deyə

Həzrəti İmam Zeynəl Abidin əleyhis-salam ramazan ayının axırıncı günü kənizləri və qulları bir yerə yığıb, onların arasında duraraq buyurardı: “Mənim üçün dua edin və ”Allahdan mənim bağışlanmağımı istəyin

Rəvayətdə buyururlar: Əgər dua etmək üçün ۴۰ nəfər olmasa, ۱۰ nəfər bir yerə cəmləşin. Hər biriniz ۴ dəfə dua edin. Əgər ۱۰ nəfər olmazsa, ۴ nəfər bir yerdə yığılın və !hər biriniz ۱۰ dəfə dua edin. Əgər bir nəfər olsan ۴۰ dəfə dua et

## DUADAN QABAQ ALLAHA HƏMD VƏ ŞÜKR

Duanın şərtlərindən başqa biri də duadan qabaq Allaha şükr və həmd etməkdir. Məsələn, “Covşən Kəbir” duasında bir neçə fəsil oxusun, ya İmam Əli əleyhis-:salamdan nəql olunmuş aşağıdakı duanı oxusun

Allaha həmd və səna göndərəndən sonra öz günahlarına iqrar edərək onların .bağışlanmasını istəsin. Həmçinin, Allahın ne”mətlərini saysın

İmam Hüseyn əleyhis-salam “Ərəfə” duasında Allahın bütün ne”mətlərini sayır. İmam Hüseyn əleyhis-salam Allaha ərz edir: “Pərvərdigara, məni anamın qarnından dünyaya ”.gətirdin, ne”mətləri verdin, paltar verdin

:İmam Səccad əleyhis-salam “Əbuhəmzə Somali” duasında Allaha ərz edir

Ey mənim Ağam, mən kiçik idim, məni tərbiyə etdin. Heç nə bilmirdim məni alim etdin.“ ”.Azmışdım, hidayət etdin. Mən kiçik bir insan idim, məni yüksəltdin

İmam Sadiq əleyhis-salamdan soruşdular: “Bu qədər dua edirəm nə üçün qəbul ”?olmur

”.Buyurdu: “Çünki, duanın şərtlərinə əməl etmirsən

Duanın başqa bir şərti duadan qabaq salavat deməkdir. Çünki, Məhəmməd səlləllahu əleyhi və alihi və səlləm və Onun Əhli-beytinin bizim boynumuzda haqqı vardır. .Həmçinin, onların hörmətinə xatir, biz də hörmət sahibi oluruq

ZÜLEYXA HƏZRƏT MÜHƏMMƏDİN səlləllahu əleyhi və alihi və səlləm MƏHƏBBƏTİ İLƏ HÖRMƏT QAZANIR

İmam Sadiq əleyhis-salamdan rəvayət olunur ki, Yusif əleyhis-salam Misirin səltənət taxtına çıxandan sonra, Züleyxa qocalıb əldən düşürdü. Bütün sərvətini də əldən vermişdi. Bir gün Züleyxa bir nəfərə dedi: Yusifin yanına get! Ona de ki, Züleyxa səninlə bir dəfə söhbət etmək istəyir. Həmin adam Züleyxaya qulaq asmadı. O, Züleyxaya dedi: Sən, bütün etdiyin əməllərlə yanaşı ikinci dəfə necə üzün gəlir Yusiflə söhbət edəsən? Züleyxa ona dedi: Həzrət Yusif dünya əhli deyil, o, Allahdan qorxur. Elə buna görə də məni incitməyəcək. Xülasə, həmin şəxs Həzrəti Yusif əleyhis-salama dedi: Züleyxa səninlə görüşmək istəyir. Yusif əleyhis-salam Züleyxaya icazə verdi. Züleyxa Yusif əleyhis-salamı görən kimi dedi: Allaha şükr olsun ki, itaət, ibadət vasitəsilə Misirin əzizinin şahlığını sənə qismət etdi. Misirin əzizini isə Allaha itaətsizlik etdiyinə görə onu .alçaltdı

Yusif əleyhis-salam Züleyxadan, onun sevgisi barəsində soruşdu. Züleyxa ərz etdi: ”.“Sənin gözəlliyin məni sənə aşiq etdi

Yusif əleyhis-salam buyurdu: Əgər axırıncı Peyğəmbərin zahirdə və batində məndən ?gözəl olan camalını görsəydin nə edərdin

.Züleyxa ərz etdi: Düz buyurursan

?Yusif əleyhis-salam buyurdu: Sən bunu haradan bilirsən

Züleyxa ərz etdi: Axırıncı Peyğəmbərin adını eşidən kimi onun məhəbbəti qəlbimə .doldu

Elə həmin saat Cəbrail Həzrəti Yusif əleyhis-salamın yanına nazil oldu, dedi: “Pərvərdigari-aləm buyurur ki, Biz Züleyxanı dost tuturuq, çünki, o, Həzrəti ”.Mühəmmədi dost tutur

.Sonra Yusifə nida çatdı ki, gərək Züleyxa ilə evlənsin. Və Yusif də Züleyxa ilə evləndi

## SALMANIN ÜÇ İSTƏYİ

Salman Farsı buyurur: “Hər vaxt sizlərdən birinin padşaha işi düşsə, onun yaxın ”.adamlarına, qohum-əqrəbasına müraciət edin ki, həmin işi yerinə yetirsin

Bu yerdə Həzrəti Salman buyurur: “İlahi nizamda heç kəsin şərəfi, şərafəti Həzrəti Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm kimi deyildir. Ona və Onun Əhli-beytinə pənah aparın ki, sizin hacətlərinizi yerinə yetirsinlər. Münafiqlərdən bir neçəsi Salmana irad tutub dedilər ki, sən bu sözü düz deyirsənsə, Allahdan istə səni camaatın içərisində ən varlı şəxslərdən biri etsin. Salman buyurdu: “Mən Allahdan üç şey istəmişəm. Birincisi budur ki, Allahın zikrini məşğul edən dil əta etsin. İkincisi, Allahın müqabilində xaze olan qəlb əta etsin. Üçüncüsü də budur ki, dünya müsibətlərinə və bədənimə yetən zəhmətlərdə səbrli olum. Mənim Allahdan istədiklərimi Allah mənə əta etdi. Və Allahın mənə əta etdiyi şeylər, dünyanın bütün mülkü və onun içində ”.olanlardan yüz min dəfə əfzəldir

Qısaca demək olar ki, məqsəd budur ki, duanın şərtlərindən biri salavat göndərməkdir. .Əgər hər hansı bir duanın əvvəli və axırı qəbul olunsa, ortası hökmən qəbul olunar

Cümə axşamı günü axşam çağından, cümə axşamı gecəsindən cümə günü axşamına .qədər məlaikələr yer üzünə nazil olur və salavat göndərən şəxslərin salavatını yazırlar

Bir nəfər Həzrəti Sadiq əleyhis-salama ərz etdi: mən elə ki, Kəbəyə getdim, o yerdə Peyğəmbər və Ali-Peyğəmbərə salavat göndərməkdən başqa yadıma bir şey düşmədi. Həzrət buyurdu: Oradan çıxan şəxslər içərisində səndən başqa heç kəs savab qazanmamışdır. Yəni, Peyğəmbər və Ali-Peyğəmbərə salavat göndərmək duaların hamısından əfzəldir. Hər kəsin Peyğəmbərə

məhəbbəti varsa, bu məhəbbət məhv olub aradan getməz. Əgər o şəxs Cəhənnəmə getsə, rəvayətdə nəql olunub ki, o şəxs Cəhənnəmə gedəndə nə qədər ki, Allahı Peyğəmbərə və Onun Əhli-beytinə and verməyib, Allah onu Cəhənnəmdən xilas .etməz

Duanın şərtlərindən biri də xüzu və sidqi qəlbdir. Duanın başqa qaydalarından biri də budur ki, insan öz qəlbini xaşe", zəlil etsin, öz qəlbinin sınıqlığı üçün lazım olan vasitələri, şərtləri hazırlasın. Əgər qəlb xaşe olsa dua müstəcəb olunar. Hətta buyurulur ki, qəbirstanlığa get və ölülərlə danış ki, bəlkə sənin halın dəyişildi. Həmçinin qəlbinin iqbalı da duanın mühüm şərtlərindən biridir. İqbalın mənası budur ki, hər hansı bir mətləbi Allahdan sidqi qəlb ilə, təkcə dillə deyil, sidqi qəlblə istəsin. Çünki, dil qəlbin mültəzimidir. Əgər həqiqi insan su istəyirsə, onun üçün su gətirirlər. Amma, adi adam nə qədər su deyə fəryad etsə də heç kəs ona cavab vermir. Həmçinin duada da qəlb işə düşməlidir. Məsələn, həyatı və yaxud evi təhlükəyə düşən insan necə kömək istəyirsə, yaxud tufanlı dəryada gəmiyə minən bir kəs necə Allahı çağırırsa və həmçinin ölüm fikrində olan bir adam ölümün axırıncı dəqiqələrində səmimi qəlbdən .necə dua edirsə və yaxud Allahı çağırırsa, o cür duada çağırmaq lazımdır

:Əmirəl-Möminin Əliyyibni Əbitalib əleyhis-salam buyurur

".Allah-Taala qafil olan qəlbdən gələn duanı qəbul etməz“

Başqa bir hədisdə gəlibdir ki, Həzrəti İsa əleyhis-salama nida yetişdi ki, bizi yalnız ağlayıb ahü-zar etdiyin halda çağır. “Şərifi Kafi” kitabında Əmirəl-Möminin Əliyyibni :Əbitalib əleyhis-salamdan bir hədisdə nəql olunubdur ki, buyurur

Elə ki, sizlərdən bir nəfər ölü üçün dua etsə, gərək ciddi dua etsin. Və qafil, qəflətdə“ ".olan qəlb ilə dua etməsin

Məsələn, camaat arasında adi hal olan hüzür mərasimində mərhum üçün edilən quru duaların yazıq meyyit üçün həqiqi nəticəsi yoxdur. Mərhum Məclisi buyurur: “Bu cür qaydalar camaat arasında yayıldığından, İmam əleyhis-salam buyurur: “Bu cür təriflərin meyyit üçün heç bir səmərəsi yoxdur. Bəli, əgər oturub ananın Bərzəx aləmindəki giriftarlıqlarını fikirləşsən, səmimi qəlbdən duanın bütün şərtləri ilə birlikdə

onun üçün Allahdan bağışlanma tələb etsən, Allah da Bərzəx aləmində onun üçün rahatlıq bəxş edər.”

Kafi” kitabında nəql olunubdur ki, İslam Peyğəmbəri Həzrəti Mustafa səlləllahu əleyhi“ və alihi və səlləm-in axtında bir müddət yağış yağmadı. Səhabələr Peyğəmbərin hüzuruna gəlib ərz etdilər: “Ya Rəsuləllah, dua et ki, Allah rəhmət yağışını nazil etsin.” Rəsuli Əkrəm dua etdi, amma dua müstəcəb olmadı və yağış yağmadı. Növbəti dəfə Allaha pənah apardı və yağış yağdı. Səhabələr Peyğəmbərdən soruşdular ki, birinci dəfə duanın qəbul olunmamasının və ikinci dəfə duanın qəbul olunmasının səbəbi nədir? Həzrət buyurdu: “Birinci dəfə niyyət etməmişdim. Amma, ikinci dəfə isə niyyət ”.ilə dua etdim

Məsələn, Həzrət birinci dəfə səhabələrinin xahişinə əsasən dua etdi və ciddi bir məsələ yox idi. Amma ikinci dəfə ciddi şəkildə Allahdan istədi və duası da səmimi .qəlbdən idi

Möminin də duası gərək səmimi qəlbdən ola ki, Allahın dərgahında qəbul olunsun. Əksər duaların qəbul olmamasını səbəbi budur ki, Allahı səmimi qəlbdən çağırmırlar. Qısaca demək olar ki, dua edən iqbalı yaddan çıxarmamalıdır. Hətta, əgər Allah kəlməsini demək istəsə iki rəkət təfəkkürlə qılınan namaz axşamdan səhərə kimi .səmimi qəlbdən olmayan namazdan daha faydalıdır

Ümmü Davud Həzrəti Sadiq əleyhis-salamın hüzuruna gəldi. Oğlunun, Mənsuri Dəvanəqinin zindanından azad olması üçün dua etməsini istədi. (O, Həsən əleyhis-salamın nəslindən olan Seyyid və İmam Riza əleyhis-salamın qardaşı idi. Həzrət buyurdu: “Rəcəb ayının əyyamül-biyz (yəni, ١٣, ١۴, ١۵-ci) günlərini oruc tut. ١۵-ci günü gizlin bir yerdə zöhr və əsr namazlarından sonra, həmçinin ١٠٠ dəfə “Həmd”, ١٠ dəfə .“Ayətəl-kürsü” və İmamın təyin etdiyi Quran surələrini oxuduqdan sonra bu duanı oxu

Ümmü-Davudun etdiyi əməllər məşhurdur və duanın sürətlə qəbul olunmasında şübhəsiz və təcrübədən çıxarılmışdır. Məfatihül cinan və s kitablarda bu dua təfsilatı ilə yazılmışdır. Xülasəsi budur ki, Ümmü Davud İmam əleyhis-salamın göstərişinə əməl etdi və Allah-Taala həmin gecə oğlunu xilas etdi. Oğlunu da sürətlə hərəkət edən .dəvələrlə anasına çatdırdılar

İnsanın Allahdan istədiyi hər şey gərək səmimi qəlbdən olsun. Əgər bir dənə "sübhanəllah" kəlməsi səmimi qəlbdən deyilərsə, səmimi qəlbdən olmayan min .zikrdən yaxşıdır

## BAŞQALARINI ÖZÜNDƏN İRƏLİ ÇƏKMƏK

Duanın qəbul olmasının səbəblərindən biri də dini qardaşların hacətlərini özündən qabağa keçirməkdir. Məsumlardan biri buyurur: Əgər bilsən ki, Möminlərdən biri sənin dərdinə giriftar olubdur, özünü borclu bilib onun barəsində dua et. Əlbəttə, bu dua etmək həqiqi olmalıdır, yalandan yox. Yəni ona qarşı olan məhəbbəti nəticəsində onun dərdini özündə hiss etməli və onun rahatlığını öz rahatlığı bilməlidir, hətta bundan da artıq olmalıdır. Əgər belə olsa, Allah onun hacətini də rəva qılacaqdır. "İddətu" kitabında Əliyyibni İbrahimdən nəql olunmuşdur ki, o da öz atasından belə nəql edir: Əbdullah İbni Cündəbi gördüm ki, "Ərəfə" günü ərəfə çölündə gün batana qədər iki əllərini asimana qaldırmışdı və yaş gözlərindən axırdı. Camaat köçüb gedəndən sonra dedim bu gün bu çöldə səni hamıdan yaxşı gördüm. O, cavabında dedi: And olsun Allaha ki, yalnız qardaşlarımı dua etdim. Çünki mövlam Musəbni Cə"fər mənə xəbər verib buyurmuşdur ki, "hər kəs öz dini qardaşı üçün dua etsə, ərşdən onun üçün nida olunar ki, yüz min bərabər sənin üçündür". Buna görə də qəbul olunmasına zəmanət verilmiş yüz min duanı, özüm üçün edəcəyim və hələ qəbul olunması da şəkkdə olan bir duadan üstün hesab etdim. Yəni əgər özüm üçün dua etsəydim bir dua sayılırdı, özü də qəbul olunub-olunmaması barəsində şəkkdə olacaqdım. Lakin dini qardaşım üçün dua etdiyimdən özüm üçün yüz min dua, özü də qəbul olunmuş dua qazandım. .Çünki mələk dua edir, mələkin də duası geri qaytarılmır, qəbul edilir

Rəvayətlərdə belə nəql olunur ki, dini qardaş barəsində edilən duada onun bir neçə qat əvəzini verirlər: bəzi vaxtlar ٢ dəfə artıq, bəzi vaxtlar neçə dəfə artıq, nəhayət bunun sayı ١٠٠ min dəfəyə gəlib çatır və bu da dua edən şəxsin qəlbi iman və .məhəbbətinin qüvvəli və ya zəif olması ilə əlaqədar olaraq müxtəlif olmasındadır

Əbdullah ibni Cündəb İmam Sadiq və İmam Kazim əleyhiməs-salam səhabələri ,içərisində böyük şəxsiyyət olduğundan ilahi məhəbbətdə

yüksək qədir-qiymətə və məqamə malik olduğundan yüz min bərabər dua qazandı. Həmçinin Zeyd Mərsidən rəvayət olunubdur ki, o deyir: Müaviyət ibni Vəhəblə "Ərəfat" çölündə dua etməklə məşğul idik. Onun duasına qulaq asanda gördüm ki, özü üçün heç nə istəmir və Möminlərin, ata-babalarının adını çəkir və onlar üçün dua edir. Bu işin səbəbini ondan soruşanda dedi: Mövlam imam Sadiq əleyhis-salamdan eşitmişəm ki, buyurur: Hər kəs qardaşının olmadığı yerdə onun üçün dua etsə, birinci asimandan mələk nida edər və onun üçün etdiyi duanın yüz min bərabəri qədər dua edər. İkinci asimandan isə bir mələk nida edib deyər ki, sənin üçün etdiyin o duanın iki yüz min bərabəri olsun. Üçüncü asimandan bir mələk deyər ki, sənin üçün etdiyin duanın üç yüz min bərabəri olsun. Nəhayət yeddinci asimandan bir mələk deyər ki, sənin üçün etdiyin bu duanın yüz min bərabəri olsun. Sonra Allah-Taala buyurar: Sənin üçün olsun .min-min bərabər

Aydındır ki, bu mərtəbə o dua edənlər üçündür ki, duası yeddinci asimandan da oyana .keçir

## BƏDA BƏHSİ

Dua bəhsinin sonunda dua etmək barəsində yaradılan şübhəyə cavab vermək istəyirəm. O şübhə bundan ibarətdir ki, insanın istəyi və yaxud Allahın məsləhəti üzündən verdiyi bir şeyi dua etsə də, etməsə də fərqi yoxdur. Başqa sözlə, Allah bu işi görəcək. Başqa sözlə desək, insanın müqəddəratı dəyişilmək qəbul etmir. Buna görə də dua qəbul etməyin heç bir təsiri və faydası yoxdur. Bu şübhə müqabilində müxtəlif .cavablar verilmişdir ki, biz də onlardan bəzilərinə işarə edirik

Əvvəla, bütün müqəddəratların hamısı hökmən baş vermir, əksinə onların da bəziləri duaya, sədəqəyə bağlıdır. Duanın vasitəsi ilə, sədəqə verməklə baş verəcək bəla aradan qaldırılır. Başqa sözlə desək, dua edib sədəqə verildikdən sonra məsləhətli iş baş verir. Məsələn, Yunis əleyhis-salamın qohumuna bəla yaxınlaşmışdı. Lakin onların dua edib Allah dərgahında ah-nalə etməsi səbəbi ilə bəla aradan qaldırıldı. Bu mətləb .bəda adlanan məsələdir ki, ona etiqad bəsləmək vacibdir

Bəda məsələsi şiə məzhəbinin xüsusiyyətlərindən olduğuna görə, həmçinin imamlarımızın ona etiqad bəsləmək barəsində çoxlu təkidlərinə əsasən və həmçinin bu məsələni bilib etiqad bəsləməkdə çoxlu faydalar olduğuna görə, bədanın həqiqəti barəsində müxtəsər bir şərhi zikr etmək yerinə düşərdi ki, bütün Mömінlər bu böyük .feyzdən bəhrələnsinlər

Bəda, təkvini işlərdə, bəşərə məxsus olan halətlərdə və onların taleyində dəyişiklik icad etməkdir. Sağlamlığın dalınca bəla gəlməsi, bəlanın dalınca sağlamlığın gəlməsi, sağlamlıqdan sonra xəstəlik, xəstəlikdən sonra sağlamlıq, varlılıqdan sonra fəqirlik, fəqirlikdən sonra varlılıq, asanlıqdan sonra çətinlik, çətinlikdən sonra asanlıq, uzun .ömürlülük və qısa ömürlülük, yəni əcəlin təxirə düşməsi və yaxud tez baş verməsi

Məsələn, bir şəxs uca bir yerdən yerə düşür ki, qayda üzrə ölməli idi, lakin əvvəlcə qohumları və yaxud özü dua etdiyinə görə, sədəqə verdiyinə görə ölmür və əcəli təxirə düşür. Yaxud, əksinə başqa bir şəxs tam sağlamlıq halətindədir, lakin qohum-əqrəbalarla əlaqəni kəsdiyinə görə, yaxud kəbirə günahlardan başqa birini yerinə yetirdiyinə görə, qayda üzrə yəni, təbii hadisələr əsasında ölməli deyildi, lakin gözlənilmədən ölür. İlahi tərəfindən bu cür dəyişikliklərin səbəbi budur ki, bəda zahir olmaq, yəni aşkar etmək mənasındadır. Yəni Allah-Taala xalqdan, insanlardan gizlin olan bəzi şeyləri aşkar edir, belə ki, insanlar onun baş verməsini ehtimal vermirdilər. Məsələn, həkimlərin ehtimal vermədiyi, kəskin bir xəstəliyə düçar olmuş insan əgər sədəqə və yaxud dua vasitəsilə onu sağaldırsa, bu halda deyirlər ki, Allah tərəfindən bəda hasil oldu, yəni ehtimalı verilməyən sağlamlıq məsələsi Allah tərəfindən aşkar edildi. Xülasə şəkildə ayədə buyurulur ki, Allah istədiyi şeyi məhv edir, aradan aparır və istədiyi şeyi isə yerində sabit və bərqərar edir. Bədaya etiqad bəsləməyin vacib olması .ona etiqad bəsləmək nəticəsində əldə edilən savab səbəbi illədir

".Allah-Taala istədiyini məhv edir və istədiyini sabit qərar verir"

Bədaya etiqad bəsləməyin, nəticədə isə böyük əcr və savaba çatmağın sirri budur ki, məbdəyə etiqad qorxu və ümid halətinin yaranmasına səbəb olur. Bu da tovhid və imanın tələbidir. Çünki Mömin bir şəxs ne"mət verildiyi sağlamlıq halətində hər günahdan qorxub pəhriz

edir. Yəni, qorxur ki, bir günah baş versin və bu səbəbdən də Allah tərəfindən bəda hasil olub ne"mət və sağlamlığı ondan alsın. Həmçinin bəndə bəla və müsibətlər baş verdiyi halda Allaha ümid bağlayır. Yəni ümidvardır ki, Onun tərəfindən bəda hasil olar, sədəqə verməklə və dua etməklə bəla dəf olunar. Bu mətləblərə diqqət yetirdikdən :sonra İmam Sadiq əleyhis-salamın buyurduğunun mənası aydınlaşır

Əgər camaat bədaya etiqad bəsləməkdə nə qədər savab olduğunu bilsəydilər, onun" ".barəsində söhbət etməkdə e"tinasız olmazdılar

Yəni, əksər vaxtlarda bəda barəsində, müqəddəratın Allah tərəfindən dəyişdi- ".rilməsindən söhbət edərdilər

Başqa bir hədisdə buyurulur: "Allah-Taala heç nədə bədaya etiqad bəsləmək kimi pərəstiş olunmayıb. Çünki, bəndələrin mənafe və məsləhətlərinin çoxu və Allaha pərəstiş mərtəbələri bədaya etiqad bəsləməkdədir. Çünki, əgər bədaya etiqad olmazsa, dua, sədəqə və s. kimi əməlləri tərk edib böyük bir səadətdən məhrum olarlar. Çətinliklərdən, giriftarçılıqlardan xilas ola bilməzlər. Həmçinin, Allahı yeganə bilməyin qəti şərtlərindən olan qorxu və ümid haləti də bədəndə vücuda gəlməz və iman naqis qalar. Xülasə şəkildə demək olar ki, bədanı inkar etmək "müqəddər olunmuş hər şey mütləq baş verəcəkdir, onda heç bir dəyişiklik ola bilməz, hadisələrin hansısa bir qaydada, səbəb-nəticə qanunu üzrə ötüb keçəcək" kimi sözlər yanlış söz olub imanda naqisliyə, müxtəlif məhrumiyyətlərə səbəb olar. Həmçinin bu etiqadı inkar etmək Qurani-Məcidin ayələrini, həqiqətləri, mütavatir rəvayətlərin inkar olunmasına gətirib çıxarır. Çünki, ayə və rəvayətlərdən məlum olur ki, insan üçün yazılan müqəddəratlar iki qismdir: hətmiyyə və qeyri-hətmiyyə, yaxud müəlləq. Yəni, əcəl barəsində deyilir ki, hər insan üçün iki növ əcəl vardır. birincisi hətmi, hökmən baş verəcək əcəldir. Yəni, ömür müəyyən olunmuş həddə çatdı. Ondan o tərəfə keçə bilməz, heç bir vəchlə onun əcəli təxirə düşməz. İkinci qism isə müəlləq, asılı əcəldir ki, hətmi əcəli çatmazdan qabaq irəlidə öldürücü hadisələr var, insanın o hadisə səbəbi ilə ölə bilmək ehtimalı var, həm də dua, sədəqə, sileyi-rəhim və s. saleh əməllər səbəbilə onun əcəli təxirə düşə bilər. Xülasə, ola bilər ki, bu vasitələrlə Allah insanın ölümünü hətmi əcəl çatana qədər təxirə salsın. Habelə, duanı dərk etmək, ehsan

etməkdə paxıllıq, qohum-əqrəba ilə əlaqələri kəsmək və s. günahların səbəbi ilə onun əcəli tez çatar. Bəyənilən, layiqli işlərin tərk olunması ilə bağlı olan əcəl ilə ölər. Bu bəyandan agah olur ki, hər kəsin müqəddəratı müəyyən qədər onun öz əlindədir. Bəziləri ibadət və s. bəyənilən əməllər vasitəsilə ömrünü uzadır, bəziləri isə günah vasitəsilə ömürlərini qısaldırlar. "Biharül-ənvar"da Əmirəl-Möminin Əli əleyhis-:salamdan belə nəql olunub

İnsanların günah səbəbi ilə ölmələri, hətmi əcəlləri ilə ölmələrindən, habelə yaxşı" ".əməl səbəbilə uzun ömür sürmələri müqəddər olunan ömürdən çoxdur

Misal üçün, günahlardan biri yeyinti məhsullarında–kəmiyyət və ya keyfiyyət baxımından–israfdan ibarətdir. Çoxlu insanlar bu günah səbəbilə özlərini xəstəliyə salıb, bəzi hallarda hətta ömrlərini qısaldırlar, nəticədə hətmi əcəl gəlməmişdən qabaq .ölürlər

Əcəl barəsində deyilənlər eynilə sağlamlıq və xəstəlik, yoxsulluq və varlılıq, əzizlik və zəlillik və s. barəsində də tətbiq olunmalıdır. Yəni, bütün bu işlər və dəyişikliklər, azalıb çoxalmaları tamamilə Allahın əlindədir. Lakin onların baş vermə səbəbi insanın rəftar, söz və müxtəlif halətləridir. Bu məsələnin şərhi kəlamın uzanmasına səbəb .olduğundan, qeyd olunanlarla kifayətlənirik

Bunu da qeyd edək ki, insanın taleyinin öz əlində olması təkcə bu dünya işlərinin deyil, həm də axirət həyatı və oradakı taleyi də öz əlindədir. Məsələn, axir-aqibəti xeyirlə qurtarmaq, imanlı halda dünyadan getmək, mənəvi dərəcələrə yüksəlmək ümumi halda insanın əməllərinə bağlıdır. Əgər bir insan Allaha ibadətdən boyun qaçırıb günah və məsiyətdə cür"ət tapsa, axir-aqibəti şərlə qurtaracaq, imansız dünyadan gedəcək. Amma Allaha müt"i olub günah əməldən qorxub uzaq olsa, ibadətə, xeyir əmələ tələssə, axir-aqibəti xeyirlə qurtaracaq, imanlı dünyadan gedəcək, dünya və axirət səadətinə nail olacaq. Bu deyilənləri isbat etmək üçün çoxlu ayə və rəvayətlər var ki, .bir neçəsini qeyd edirik

:Üsuli-kafi"nin "dua" bölməsində İmam Səccad əleyhis-salamdan belə nəql olunur"

".Dua həm nazil olan, həm də hələ nazil olmamış bəlanı dəf edir və qarşısını alır"

Məzmunu bu hədislə eyni olan səkkiz belə hədis də nəql olunub. Həmçinin İmam Sadiq :əleyhis-salam Müyəssər ibni Əbdül Əzizə buyurdu

Dua et və demə ki, iş-işdən keçib. Doğrusu Allah yanında bir məqam var ki, yalnız dua“ edib istəməklə o məqama çatmaq olar. Əgər bəndə sidqini bağlayıb Allahdan bir şey istəməsə, ona heç nə verilməz. Sən Allahdan istə ki, versin. Ey Müysəsr, elə bir qapı ”.yoxdur ki, döyüləndə ev sahibi gəlib onu döyənin üzünə açmasın

Həmçinin, “Kafi”nin “Məarin” kitabında İmam Sadiq əleyhis-salamdan belə nəql :olunub

Möminlərdən bəzisinin imanı icarə imandır (yəni, zatlarında əvvəldən iman olmamış,“ qəlbləri iman nuru ilə nurlanmamışdır). Amma əgər onlar dua etsələr və duada israr ”.etsələr, imanla dünyadan gedərlər

Bu hədisdə xeyir aqibətli olmaq, imanlı ölmək üçün hər vaxt dua oxuyub duada israr etmək, Xaliqin dərgahında ahü-nalə etmək çox təsirli səbəblər kimi göstərilib. Həzrəti Musəbni Cəfər əleyhis-salamdan belə nəql olunub: “Bəni İsrail dövründə əməli saleh bir kişi var idi. Arvadı da əməli saleh idi. Yuxuda ona deyilir ki, Allah sənə filan qədər ömür vermişdir ki, bir yarısı naz-ne”mət, bolluq ilədir, o biri yarısı isə yoxsulluqda keçəcəkdir. Sənə ixtiyar verib ki, hansı yarısını istəyirsən birinci əta etsin. Kişi dedi ki, əməli saleh bir arvadım var ki, mənimlə həyatımda şərikdir. Qoy onunla məşvərət edim. Elə ki, sübh açıldı, öz yuxusunu arvadına dedi. Əməli saleh arvad dedi: “Ne”mət bolluğu olan birinci yarısının əvvəlcə verilməsini seç. Bəlkə Allah bizə rəhm etdi və o biri ”.yarısında da o ne”mətləri bizdən almadı

İkinci gecə yuxuda ondan soruşdular ki, birinci hansını seçdin? Dedi, birinci yarısını naz-ne”mət içərisində olmağı seçdim. Sabahısı gündən dünya naz-ne”mətləri hər tərəfdən ona tərəf gəlməyə başladı. Sonra arvadı ona dedi: “Allahın sənə verdiyi ne”mətlərdən qohum-əqrəbaya, möhtaclara, yoxsullara, qonşulara, filan qardaşlarına ver!” Müntəzəm surətdə ərinə əmr edirdi ki, Allahın ne”mətlərini xeyir işlərə sərf etsin. O kişi də onun sözlərinə əməl edirdi. ömrünün yarısı keçəndə həmin şəxs yenə də ,yuxusuna gəlib dedi: “Etdiyin ehsanlar

şükr-ne”mət xatirinə Allah ömrünün o biri yarısını da naz-ne”mət içərisində müqəddər ”.etdi

Həmçinin nəql olunub ki, Həzrət İsa əleyhis-salam toy mərasimi keçirilən bir evin qabağından keçəndə səhabələrinə buyurdu: “Bu gecə gəlin öləcək və onların şadlığı şivənə dönəcək.” Sabah yenə o yerdən keçəndə gördülər ki, şivən səsindən bir əsər-əlamət yoxdur. Soruşdular, dedilər ki, gəlin sağlamdır. Sonra ev sahibindən icazə alıb evə varid oldular, buyurdu: “Gəlinin döşəyini qaldırın.” Döşəyi qaldıranda böyük bir ilanın yatdığını gördülər. Həzrət buyurdu ki, bu ilana əmr olunmuşdu ki, keçən gecə səni öldürsün. De görüm dünən gecə nə etmisən? Gəlin dedi: axşama bir fəqir “mənə təam verin” deyə səslənirdi. Heç kəs ona cavab vermirdi. Mən öz xörəyimi götürüb ona ”.verdim. Həzrət buyurdu: “Elə o əməlinə görə ölümü özündən uzaqlaşdırmısan

.Bu rəvayətə oxşar olan bir neçə rəvayət də nəql olunur

Biharül-ənvar”ın ١٣-cü cildində “intizari-fərəc“ babında İmam Sadiq əleyhis-salamdan“ belə nəql olunub: “Allah-Taala Bəni İsraili müqəddər etdi ki, dörd yüz il fironçuların pəncəsində giriftar olsunlar. iki yüz otuz il keçəndən sonra Bəni İsrail qövmü qırx gün Allah dərgahında ah-nalə edib ağladılar, Ondan kömək istədilər. Bu vaxt Allah Musa və Haruna vəhy etdi ki, qalan yüz yetmiş illik əzab onların üzərindən götürüldü.” Sonra Həzrət buyurdu: “Əgər siz də Bəni İsrail qövmü kimi Allah dərgahında ahü-nalə edərək Ondan kömək istəsəniz, Allah fərəci (yəni, Həzrəti Məhdi əleyhis-salamın zühurunu) tezləşdirər; yox əgər belə etməsəniz, bu cür ağır vəziyyət müqəddər olunan vaxta ”.qədər davam edəcək

Qeyd olunanlarda bəda məsələsi, duanın müqəddəratda təsirli dəyişiklik yaratması aydın olur. Hər bir şəxs ömrünün keçən hissəsinə nəzər salsa,aydın olar ki, dua və sədəqə vasitəsilə onun həyatında müəyyən dəyişikliklər baş vermiş və istəyi yerinə yetmişdir. Əgər bəziləri desə ki, bu məsələ müəyyən qədər düzdür, amma bəs nə üçün əksər dualar qəbul olunmur? Cavabında deyirik ki, bir dua qəbul olunmursa, ya onun qəbul olunması şərtləri mövcud olmamış, yaxud Allahın məsləhəti onu qəbul etməmək olmuşdur. Əvəzində isə ona başqa bir şey əta etmiş və ya axirət zəxirəsi qərar .vermişdir

Dua barəsində olan mətləblərin hansının şərt mövzusundan xaric olması ilə .nəticələndiyini qeyd olunan mətləblərlə kifayətlənirik

Fəzzəkkir” kəlməsi bu münasibətlədir ki, qorxu, şəfqət və dua səbəbi ilə Cənnətə“ çatır. Sən ey Peyğəmbər! Xatırlatmaqdan əl çəkmə ki, camaat Allahı çağırsın və dua .səbəbi ilə ilahi savaba nail olsunlar

Müfəssirlər qeyd etmişlər ki, Peyğəmbəri Əkrəm bütləri və ya bütpərəstləri məzəmmət etdikdən sonra, Həzrətin Qüreyş qəbiləsindən olan düşmənləri qərara gəldilər ki, bir dəstə adamlarını göndərib Məkkə yolunu bağlasınlar. Məkkə mərkəz olduğuna görə ora gediş-gəliş çox idi. Onlar o yolun üstündə dayanır və yolu camaat üçün kəsirdilər və deyirdilər ki, bu şəhərdə Mühəmməd adlı bir şəxs nazil olmuş və bəzi iddialar edir. Məbadə siz o iddialara aldanasınız. Bu sözlərdən sonra Peyğəmbərə töhmət vururdular və bəzən deyirdilər ki, o kahin və sehrkardır. Bəzi vaxtlar da deyirdilər ki, divanə və şairdir. Halbuki, bu töhmətlər və iftiraların heç biri Rəsuli Əkrəmə tətbiq oluna bilməz. Çünki, sehrkarlıq, divanəlik və şairlik bir-biri ilə uyğun .gəlməyən sifətlərdir

## ?KƏHANƏT NƏDİR VƏ KAHİN KİMDİR

Kəhanət–cinləri təsxir etməkdir. Bu yolla bəzi qeybi işlərdən agahlıq tapmaq olur. Cinin .vasitəsilə oğurlanmış bir malı tapmaq olar

İslamdan əvvəl kəhanət çox rəvac tapmışdır və bu peşənin çoxlu rəvayətləri vardır. Bəzi şəxslər olurdu ki, bu şeytani rizayətlərə dözür və ruhları xəbisləşirdi. Nəticədə cin onların qabağında ram olurdu. Cinin vasitəsilə keçmişdən və gələcəkdəki hadisələr .barəsində agahlıq əldə edirdilər

İslamda təsxirin bütün növləri, istər cin təsxiri olsun, istərsə də ruh təsxiri, hamısı .haramdır və mənfur işlərdən sayılır

Kəhanət işində hər hansı bir xəbərin doğru və yalan olması bir-birinə qarışmışdır və bu iş insanları çox alçaq dərəcələrə aparıb çıxarır. Məsələn, riyazətlərdən biri budur ki, qırx gecə-gündüz öz sidiyi ilə dəstəmaz alsın və qırx gün Quranı ayağı altına qoysun və .bu işlərindən sonra cinin kahinə verdiyi xəbərlər çox az və əhəmiyyətsizdir

İbni Məhbubun səhih hədisində Leysəndən belə rəvayət etmişdir ki, İmam Sadiq əleyhis-salamın hüzuruna gedib ərz etdi ki, orada bir kahin vardır, itmiş və oğurlanmış şeyləri tapır. Camaatdan bir şey oğurlandıqda həmin kahindən soruşaqmı,-deyə sual etdilər. Həzrət buyurdu: “Hər kəs kahinin, sehrkarın yanına getsə və onu təsdiq eləsə, ”.Allahın kitabına, yəni Qurani-Məcidə qarşı kafir olmuşdur

Kəhanət, kahinlik kəbirə günahlardandır. Müşriklərdən bir qrupu Peyğəmbəri Əkrəmə kahinlik töhməti vurdular. Bu insafsızlar bilmirdilər ki, Peyğəmbərin işi heç də kahinliyə oxşamır. Nübüvvət məqamı bu kimi dəyərsiz sözlərdən çox-çox yüksəkdədir. Peyğəmbər Allahdan və məaddan söhbət edir. Bunun kahinliyə və onun kimi işlərə heç bir dəxli yoxdur. Buna görə də Xudavənd bu ayədə Peyğəmbərə xitabən buyurur: “Bu töhmətlər səni öz işindən saxlamasın (yəni hər nə istəyirlər desinlər). Sən Allahın ”.verdiyi ne”mət səbəbilə sehrkar, kahin və divanə deyilsən

Ola bilsin ki, “bi ni”əməti Rəbbikə” kəlməsindəki “ba” hərfi and içmək kimi olsun. Yəni, .mənası “and olsun sənin Rəbbinə ki, sən kahin və divanə deyilsən” ola bilər

İslam Peyğəmbəri mütləq əqlə malik idi. İslamın gətirdiyi şər”i vəzifələrdən boyun qaçırmaq istəyən şəxslər, Peyğəmbərə hər gün töhmət vururdular. Bəzisi onu divanə, bəzisi şair və bəzisi də kahin adlandırırdılar. Hətta iş o yerə gəlib çatmışdı kı, Peyğəmbərimiz buyururdu: “Heç bir Peyğəmbər mənim kimi xalqın əlindən əziyyət ”.görməyib

Bu qədər əzab-əziyyətlərlə belə qarğış etmirdi, əksinə buyururdu: “İlahi, mənim ”.ümmətimə rəhm elə, həqiqətən onlar nadandırlar

Əllamə Məclisi (r.ə) “Həyatul-qulub” kitabında belə bir rəvayət nəql etmişdir: “Allah Peyğəmbərə buyurdu ki, Qüreyş tayfasının içində aşkar də”vət etsin, Həcc mövsümündə, camaatın Məkkənin ətrafında və Məkkəni dolandıqları yerdə Səfa dağının üstünə çıxsın və uca səslə nida etsin. Nida etdi: “Əyyühənnas! Mən aləmlərə, Pərvərdigarın göndərdiyi Rəsulam” Bütün camaat təəccüblə o Həzrətin üzünə baxırdılar. Sonra Həzrət Mərva dağının üstünə gedib üç dəfə həmin sözü təkrar etdi. Əbu Cəhl bunu eşidəndə, Peyğəmbərin mübarək alnına bir daş vurdu və alnını yaraladı. Sair müşriklər də əllərinə daş alıb Həzrətin dalınca qaçdılar. Həzrət Əbu

Qübeys dağına çıxıb hal-hazırda Müttəka adlanan yerdə dayandı. Müşriklər o Həzrəti axtarırdılar. Bir nəfər Əmirəl-Möminin əleyhis-salamı gördü və dedi ki, Mühəmməd öldürülüb. Həzrət Əli əleyhis-salam ağlaya-ağlaya Xədicənin evinə gəldi və buyurdu: "Müşriklər Rəsuli Əkrəmi daşa basmışlar. Bəziləri deyirlər Peyğəmbər öldürülüb. Bir qabda mənə su ver və özün də yemək götür. Birlikdə Həzrətin yanına gedib onu tapaq və bu yeməkləri ona çatdıraq.

Sonra hər ikisi Əbu Qübeys dağının yanına gəldi. Əmirəl Möminin Əli əleyhis-salam Xədicəyə buyurdu: "Sən düzənlik tərəfdən get, mən isə dağın başından gedirəm. Əmirəl-Möminin Əli əleyhis-salam ağlaya-ağlaya fəryad edib deyirdi: "Ya Rəsuləllah! Canım Sənə fəda olsun! Hansı vadidə teşnə və acsan və məni özünlə aparmamısan." Xədicə də fəryad edib deyirdi: "Allahın seçdiyi, Allah yolunda əzab-əziyyət görən Peyğəmbəri mənə göstərin." Bu vaxt Cəbrail Peyğəmbərə nazil oldu, o Həzrəti qaldırıb Cənnətdən gətirdiyi bir kürsüdə əyləşdirdi. Sonra, asimanların, yerin, dəryaların, dağların məmuru olan mələklərin hər biri O Həzrətin hüzuruna gəlib ərz etdilər ki, biz hamımız Haqq-Taala tərəfindən məmur olunmuşuq ki, sənə itaət edək. Əgər izn versən səninlə bu cür rəftar edən qövmü həlak edək. Həzrət buyurdu: "Mən rəhmət Peyğəmbəriyəm. Mənim qövmümü boşlayın, çünki onlar nadandırlar."

Sonra Cəbrail dedi: "Ya Rəsuləllah, Xədicəyə nəzər sal, o sənin dalınca gəlir. Onun ağlamaq səsi məlaikələri ağlatmışdır. Allahın və mənim salamımı ona çatdır. Ona Cənnətə getməklə müqdə ver."

Sonra o Həzrət Xədicəni və Əmirəl Möminin Əli əleyhis-salamı çağırdı. Onun mübarək üzündən qan axırdı.

Axşam olduqda Xədicə və Əli Peyğəmbəri Xədicənin evinə gətirdilər. Müşriklər bu işdən agah olduqda gəlib Xədicənin evini hər tərəfdən daşa basdılar. Xədicə və Əli Peyğəmbərin qarşısında dayanıb özlərini Ona sipər qərar verdilər ki, atılan daşlar Peyğəmbərə dəyməsin. Xədicə ucadan fəryad etdi: "Ey Qüreyş tayfası! Xəcalət çəkmirsiniz ki, sizin içərinizdə ən nəcabətli olan bir nəfərin evini daşa basırsınız?! Məgər Allahdan qorxmursunuz, ağlınıza başınıza yığın."

Bu sözlərdən sonra müşriklər qayıtdılar.

Xülasə, Allah öz Peyğəmbərini düşmənlərin vurduğu ittihamlar qarşısında müdafiə .edir

Həzrəti İsa əleyhis-salamın zamanında şeytanlar dördüncü asimana qədər gedirdilər. İslam Peyğəmbərinin təvəllüdündən sonra daha cinlər və şeytanların asimanlara getmələrinə icazə verilmirdi. Bundan da əlavə cinlərin arasında doğru və yalan danışanlar var idi. Digər tərəfdən cinin verdiyi xəbərlər naqisdir. Onların İslam dini .barəsində verdiyi xəbərlər naqis və ya yalan ola bilər

İslam dinində qeybdən xəbər vermək, sehr və kəhanət hamısı haram işlərdəndir. Məsələn, bir kəs rəmmala müraciət etsə və öz gələcəyini ondan soruşsa bu iş haram, İslama qarşı kafir olmaqdır. Məgər qeyd edilən belə işləri haram və ya batil hesab ?edən bir şəxsə–Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-ə aid etmək olarmı

Peyğəmbəri Əkrəm səlləllahu əleyhi və alihi və səlləm-ə vurulan töhmətlərdən biri də şairlik töhmətidir ki, tərəbbəs və intizar mənasındadır. "Rəybəl-mənun" müsibət və ağır, acınacaqlı hadisələr və ya ölüm, fəlakət mənasındadır. Müşriklərin gücü Peyğəmbərə çatmayanda (çünki Onu hifz edən Allah idi) deyirlər ki, ruzigarın ağır və müsibətləri onu öldürəcək, Onun sözləri də onunla birgə məhv olub aradan gedəcək. Atası cavanlıqda dünyadan getdi, o da cavanlıq vaxtında öləcək. Biz Onun əlindən .rahat olacağıq

:Allah öz Peyğəmbərinə buyurur

".De, siz mənim ölümümün intizarında olun! Mən də sizin ölümünüzün intizarındayam"

Peyğəmbərə töhmət vuranların əksəriyyəti ondan əvvəlcə öldülər və yaxud islamı qəbul etdilər. Amma görəsən, şairlik ittihamını Peyğəmbərə vurmağın nə kimi mənası var idi. Hamı bilirdi ki, Peyğəmbər dərs oxumurdu. Ühüd qəzvəsində buyurduğu: "Ənən-nəbiyyü la əkzibu, ənəbnu Əbidil-Mütəllib" kəlməsindən başqa bir şer deməmişdir. Quran da nəzm deyil, nəsr formasında gəlmişdir. İndi görək Peyğəmbərə .şair demələrinin əsas səbəbi nə idi

:Şerin iki mənası var

;İki və ya daha artıq beytdən təşkil olunmuş mətn (۱

Həqiqəti olmayan bəzədilmiş kəlamlar; Buna görə də demişlər ki, şerin ən yalanı, ən (۲ gözəl olanıdır. Yəni, şerdə nə qədər yalan və həqiqətlərin əksi daha çox olarsa, o şer .daha gözəldir

Batil şairlər o şairlərdir ki, pul üçün əxlaqsızları, facirləri mədh edir, bir kəsdən istəklərinin xilafına bir şey gördükdə, hətta məzəmmətə layiq olmadığı təqdirdə belə, o kəsi məzəmmət edirdilər. Bu özü də kəbirə günahlardan biridir. Həmçinin onların şerlərinin bir qismi eşqbazlıqda şəhvətləri, iffətə zidd olan şeyləri həyəcana gətirmək barəsində idi. Şer və şairliyin mənasını bildikdən sonra görəsən Qurani Məcidə, habelə hər bir çirkin sifətlərdən uzaq, gözəl fəzilətlərə malik olan Mühəmməd də"vətinə meylinin mənasını aid etmək, yaxud o Həzrətə şair demək olarmı? Görəsən rəbbani, ruhani və ilahi bir Peyğəmbərin müqəddəs vücudu öz ardıcıllarını mal-dövlətə, cah-cəlala pərəstişdən, şəhvətin ardınca düşməkdən çəkindirən bir şəxsə belə bir töhmət vurmaq olarmı? Ar olsun o kəslərə ki, bu töhmətləri o Həzrətə vururdular. Bəli düşmənin ən böyük zərbəsi töhmət və iftiradır. Şəkk yoxdur ki, onların özləri də dediklərinin yalan olmasını bilirdilər. Bu şərif hədisə diqqət edək. "Həyatul-qülub" kitabının ۲-ci cildinin ۲۳-cü babında mərhum Məclisi nəql edir ki, Məkkə müşrikləri camaatın çoxunun Həzrət Mühəmmədin dininə iman gətirməklərini gördükdə Əbu Talibin yanına gəlib dedilər ki, sənin qardaşın oğlu bizim bütləri söyür, bizi səfeh hesab edir, cavanlarımızı fəsada çəkir, camaatımızın arasına təfriqə salır. Əgər pərişanlıq və yoxsulluq onu bu yola çəkmişdirsə, o da mal-dövlət istəyirsə, onda biz ona mal-dövlət verərik ki, Qüreyş tayfası içərisində hamıdan varlı olar. Qüreyş tayfasının hər qadınını istəsə, ona ərə verər, onu özümüzün əmiri, Məkkənin sultanı seçərik. Bu şərtlə ki, bizim allahlarımızdan əl çəksin. Əbu Talib Qüreyş başçılarının təklifini Peyğəmbərə çatdırdı. Həzrət buyurdu: "Əgər günəşi sağ əlimə, ayı sol əlimə versələr yer üzərində olan hər şeyi mənim ixtiyarımda qoysalar da, öz Pərvərdigarıma qarşı müxalifət ".etməyəcək, ilahi risaləti yerinə yetirəcəyəm və öz yolumdan qayıtmayacağam

Şer və şairliyin mənasında deyilənlərdən gözəl şəkildə məlum olur ki, əgər hər hansı bir kəlam mübaliğə, yalan, həqiqətin xilafı və yersiz məzəmmətə səbəb olmazsa, əksinə, həqiqəti çatdırıb öyüd-nəsihətə

nüsrət etmək olarsa, hətta şer halında olsa belə, bəyənilmiş, üstəlik bir növ cihad da .sayılır

Bu qrupdan olan şerlər Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm-in tərəfindən hörmətə layiq görülmüşlər. Məsələn, Qeys ibni Ədi, Kə"b ibni Malik Ənsari, Kə"b ibni Züheyr, Əbdillah ibni Rəvayi Ənsari (Rəsuli Əkrəm ona "şairlərin ağası" ləqəbini .vermişdi), Vəlid ibni Rəbiyyə, Amiri, Həssani ibni Sabit Ənsari

Amma Həssan Peyğəmbəri Əkrəmin zamanında tutduğu yolda sabit qalmadığı və o Həzrətin vəfatından sonra mal-dövlət, dünya məhəbbəti onun Müaviyəyə tərəfdar olmasına vadar etdiyindən, Əmirəl-Möminin əleyhis-salam ilə müxalifət etdiyindən, :Rəsuli Əkrəm ümumi şəkildə onu mədh etməmiş, əksinə buyurmuşdu

Ey Həssan, nə qədər ki, öz dilinlə bizə kömək etmisən həmişə Ruhul-qüdüsün səbəbi" ".ilə qüvvətləndiriləcəksən

Rəvayət olunmuşdur ki, Rəsuli Əkrəmin məscidində bu Həzrətin əmri ilə mənbərə oturdu və İslam və müsəlmanlaın nüsrətinə, Rəsuli Əkrəmin mədhinə şirk və müşriklərin məzəmmətinə dair yazdığı şerləri oxuyurdu. Həmçinin Qədir-xum .günündəki qəsidəsi məşhurdur

İmamlarımızın zamanlarında ölən və Əhli-Beytin haqqını müdafiə etməkdə həqiqətən dilləri ilə cihad edən və bu yolla da İmamlarımızın lütf və ikramına layiq görülən şairlər: Kumeyt, Seyyid İsmail Himyəri (Həzrət Sadiq əleyhis-salammın tərəfindən mərhəmətə layiq görülmüşdür), Fərəzdəq İmam Səccad əleyhis-salamın tərəfindən mərhəmətə layiq görülmüşdür. Dəbbəl Xəzal İmam Riza əleyhis-salamın tərəfindən ikrama layiq görülmüşdür. O öz qəsidəsini imam Riza əleyhis-salam üçün oxuyanda :əvvəli aşağıdakı beytdən olan şeri oxudu

".Həzrət buyurdu: "Allah səni Qiyamətin böyük qorxusundan amanda saxlasın

,Sonra o bu şeri oxuyanda

.İmamın əleyhinə çıxan, şübhəsiz Allahın adına və bərəkətlərə qarşı qiyam etmişdir

:Həzrət buyurdu

Ey Xuzai! Ruhul-qudus bu iki şeri sənin dilində cari etdi. Bilirsənmi ki, bu İmam kimdir“
”?və hansı zamanda qiyam edəcək

səh:۸۷

Dedi: “Yox, ey mənim mövlam, Amma eşitmişəm ki, siz Əhli-beytdən olan İmam qiyam ”.edəcək yer üzünü fəsaddan təmizləyəcək, ədaləti bərqərar edəcək

Buyurdu: “Ey Dəbəl, məndən sonrakı imam oğlum Mühəmməd və ondan sonra onun oğlu Əli və ondan sonra da Höccət əleyhis-salamdır ki, uzun müddət nəzərlərdən qaib olacaq, və Allah özü məsləhət bildiyi vaxtda onu aşkar edəcək. O, yer üzünü ədalətlə ”.dolduracaq. Onun zühurunun vaxtı Qiyamətə kimi hamıya gizlidir

Sonra o Həzrət özü iki beyt inşa etdi. Dəbələ buyurdu ki, bunları öz qəsidənə artır. Və :buyurdu

Bu qəbir mənim qəbrimdir ki, Tusda yerləşcək, hər kəs məni ziyarət etsə, mənimlədir. “ ”.Qiyamətdə də günahları bağışlanmış olacaq

Sonra Həzrət onun öz adına kəsilmiş yüz sikkə dinarı Dəbələyə mərhəmət etdi. Dəbələ ərz etdi: “Allaha and olsun ki, bunun üçün gəlməmişdim və bu qəsidəni dünya tamahı niyyətinə deməmişdim.” Sonra pulları geri qaytardı, Həzrətin paltarlarından birini təbərrük üçün istədi. Həzrət öz paltarını həmin kisədəki pullarla birlikdə Dəbələyə göndərdi. Xadimlərinə buyurdu ki, ona desinlər ki, bu kisəni götürsün çünki, çox keçməz ona ehtiyac duyarsan. Dəbələ kisəni və paltarını götürüb qayıtdı. Vətəninə çatanda gördü ki, oğrular evində olan var-yoxunu aparıblar. Sonra Həzrət Riza əleyhis-salamın verdiyi paltarları on min dirhəmə onun şiələrinə satıb ev ləvazimatlarını aldı. Sonra Həzrətin “çox keçməz ki, yüz dinara ehdiyaclı olarsan” kəlamını xatırladı. Onun bir kənizi var idi ki, onu çox istəyirdi. O da göz ağrısına tutlmuşdu. Təbiblər demişdilər ki, sağ gözü kor olub, sol gözünü isə müalicə edəcəyik. .Ola bilsin ki, sağalsın

Dəbələ çox qəmgin oldu, ah-nalə etdi. Yadına Həzrətin verdiyi köynək düşdü. O köynəyi Qum əhli ondan min dinara aldılar və onun kiçik bir parçasını özünə verdilər. O parçanı kənizin gözünə bağladı. Sübh açılanda gördülər ki, hər iki gözü sağalmışdır. Bu .Həzrətin verdiyi paltarın bərəkətinə görə idi

Biharül-ənvar”-ın ١١-ci cildində Səhl ibni Zəbyandan rəvayət olunmuşdur ki, bir gün “ Həzrət Əliyyibni Musa Riza əleyhis-salamı görməyə getdim. Elə ki, hüzuruna çatdım,

buyurdu: “Yaxşı oldu ki, gəldin. Sənin ardınca adam göndərmək istəyirdim. Dünən gecə

səh:۸۸

yuxuda gördüm ki, yanımda yüz pilləli bir nərdivan var. Onu mənim üçün qoymuşdular. ”.Mən o pilələrlə yuxarı çıxdım

”.Səhl dedi: “Sizin ömrünüz çox uzun olacaq və yüz ildən artıq həyat sürəcəksiniz

Həzrət buyurdu: “Allah nə istəyirsə, o da olacaq. Sonra buyurdu: Elə ki, yuxarı çatdım, bir qəsr gördüm ki, Rəsuli Əkrəm orada oturmuşdu. Sağ və sol tərəfində Həsən və Hüseyn əleyhis-salam var idi. Fatimə onun yanında, Əmirəl-Möminin isə Həzrətin müqabilində oturmuşdu. Başqa bir kişini gördüm ki, cəddimin qarşısında dayanaraq, məzmunu aşağıdakılardan ibarət olan qəsidəni oxuyur. “Həzrət Peyğəmbər buyurdu: Salam de atan Əliyə və atan Həsən və Hüseynə sonra anan Fatiməyə və sonra bizi mədh edən şair Seyyid İsmail Himyəriyə. Sonra ona salam verdim və oturdum. Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm Seyyidə buyurdu: Qəsidəni oxu! Sonra buyurdu: “Hər kəs bunun oxuduğu bu qəsidəni əzbərləsə və onu təkrar etsə, Cənnət ”.əhlidir

Biharül-ənvar”da nəql olunmuşdur ki, İmam Sadiq əleyhis-salam Himyəri üçün hənut“ və kəfən göndərdi, onun vəfat xəbərini eşidəndə dua edib rəhmət göndərdi. Bir nəfər dedi: Ağa, Himyəri şərab içirdi. Həzrət buyurdu: Atamdan eşitmişəm ki, o da Rəsuli :Əkrəmdən rəvayət edib ki

Ali-Mühəmməd dostları tövbəsiz bu dünyadan getməzlər”. Himyəri də günah etdi,“ onun ölüm vaxtı üzü qap-qara qaralmışdı. Belə ki, hamının diqqətini özünə cəlb etdi. Düşmənləri xoşhal oldu. Amma gözlənilmədən üzündə bir ağ nöqtə zahir oldu. Get-gedə nuraniləşib ۱۴ gecəlik ay kimi oldu. Həmin vaxta bu şeri dedi.

Həqiqətən Əlinin onu sevənləri cəhənnəmdən xilas etməməsini güman edənlər“ ;şübhəsiz yalan demişlər

Allaha and olsun ki, elə bu anda mən Ədn cənnətinə daxil oldum və Allah mənim ”.günahlarımı bağışladı

Əhlam” hülmün cəmidir və əql deməkdir. Yəni “məgər onların əqlləri əmr edir ki, bu“ sözləri danışırlar? Çünki Məkkə əhli elə şöhrətpərəst idilər ki, yalnız məkkəliləri ağılı

oxumaq da Məkkə əhlinə məxsus idi. Çünki onlar çox sərvətli idilər və övladlarının .savadlı olması üçün çoxlu sərmayə qoyurdular

Mal-dövləti və sərvəti olmayanlar isə övladlarına savad öyrətməkdən məhrum olurdular. Allah-Taala istəyir ağıllarının düzgün işləmədiyini onlara anlatsın. Buyurur: Siz ki, ağıllılıq iddiası edirsiniz onda bir kəs həm şair, həm dəli, həm də kahin ola bilərmi? Deyirlər ki, yalançının yaddaşı olmaz və özünü rüsvay edər (çünki, Allah onu, .(onun özünə tapşırar

Sehr və kahinlik ağıl və bacarıq tələb edir, dəli adam ağılsız, gicdir. Əqli-külli və külli-əql olan Həzrəti Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm-in barəsində Allah-Taala buyurur: bunlar öz əqllərini itirmişlər. Hər kəsin əql nuru ondan alınsa danışığında .ziddiyyət və artıq sözlər çox olar

.Üstəlik onlar inadkarlardır. İman və Allaha itaəti qəbul etmək istəmirlər

Yoxsa deyirlər ki, Mühəmməd Quranı özündən düzəldib? "Təqəvvuləhu", yəni öz yanından çıxarmaq. Allah buyurur: İman gətirmək istəmirlər, əks halda belə olmasaydı :bu da bir bəhanədir. Allah buyurur

Əgər şəkk və şübhədəsinizsə onun kimi bir surə gətirin. Mühəmməd ki, sizin aranızda yaşayır. özü də ömründə bir dəfə, özü də Əbu Taliblə birlikdə karvanla səfərə getmiş, .məktəbə getməmiş, müəllim görməmişdir

?Belə bir Mühəmməd elə bir Quran gətirdi

Belə bir Mühəmməd əvvəlkilərin və axırdakıların elmindən artıq olan Quranı gətirdi. Burada belə bir sual qarşıya çıxır ki, yazmaq və oxumaq bəşərin kamal sifətlərindəndir. Belə isə Peyğəmbər bu kamaldan məhrum idi. Bu sualın cavabı budur ki, yazmaq və oxumaq adi camaat üçün kamal sayılır. Amma o kəslər üçün ki, elmi kəsb olunmaqla əldə olunur, elmi kəsb edib alim olsunlar. Buna görə də oxumalı öyrənməlidir ki, kitablarda yazılan elmləri mənimsəsin, yazmağı bacarmalıdır ki, bildiklərini yazsın və unutmasın. Amma elmi ilahi əta və ne"mət olan bir kəs, həmçinin bəşərdən kəsb olunmayan, Allah yanında əta olunan elmi yazıb-oxumaq onun üçün

unutqanlığa, səhvə yol yoxdursa, mətləbləri unutmamaq üçün yazmağa ehtiyac .yoxdur

O Həzrətin mətləblərə əhatəsi o dərəcədə idi ki, heç nə ondan gizlində qalmırdı; yuxu və oyaqlıq onun üçün bir idi. Həzrətin özü buyururdu: Mən qabaq tərəfdən müşahidə etdiyim kimi arxamda olan camaatın cərgələrini də hiss edirəm. Yuxuya gedirəm, amma görürəm. Heç nəyin xatirəsindən silinib məhv olmadığı bir kəs üçün yazıb-oxumağın nə lüzumu vardır?! Allah Taala o Həzrəti ilk əvvəldən məktəbə getmədən, dərs oxumadan alim etdi ki, peyğəmbərliyə məb"us olanda bir kəs "Quran elmlərini bəşərdən öyrənmişdir"-deyə, irad tuta bilməsin. Qeyd olunmalıdır ki, o Həzrətin məktəbə gedib dərs oxumamasına baxamayaraq, mö"cüzə ilə hər vaxt istəsəydi, .oxuyub-yaza bilərdi

## ?QURAN KİMİ BİR SURƏ GƏTİRƏ BİLDİLƏRMİ

Allahın buyurduğu "əgər bacarırsınızsa Quran kimi bir surə kətirin" mövzusunda tarixdən agah olmayan bəzi kəslər deyə bilərlər ki, "ola bilsin ki, bəzi ərəblər Quranın mislini gətirə bilərdilər. Amma bu aşkar olmamışdı yaxud gətirə bilirdilər, amma ".deməyə qorxurdular

Cavabımız budur ki, Peyğəmbərin Məkkədə olduğu ١٣ il müddətində onların heç bir qüdrəti yox idi ki, Peyğəmbərin sözlərinin qabağında bir şey gətirməyə cür"ət etməsinlər. Müsəlmanların da üç il müddətində sayı ۴٠ nəfəri keçmirdi. İslamı aşkar şəkildə təbliğ edə bilmirdilər və sonradan bir müddət Əbitalib dərəsində məhbus oldular. Müşriklərin əzab-əziyyətlərinə məruz qaldılar, daha sonra Həbəşistana hicrət etdilər. Xülasə, o dövrdə bir kəsin gücü yox idi ki, "müxaliflərin öz əqidələrini izhar etməyə cür"ətləri yox idi" deyə bir kəs iddia edə bilsin. Əksinə, o zamanda fəsahət və bəlağət o qədər rəvac tapmışdı ki, hər kəs bir şer qoşurdusa, dərhal Kəbə divarından asırdı. İslam günəşi parlayandan sonra onların özləri həmin şerləri Kəbə dirvarından .götürdülər

Bəli, "Bismillahir-rəhmanir-rəhim", "Əlhəmdu lillahi rəbbil-aləmin" hara, ərəb fəsahət !?ustalarının eşqbazlıq şerləri hara

Allah-Taala buyurur: “Əgər doğru deyirsinizsə, Quran kimi bir söz (fəsahət, bəlağət və həqiqətin bəyanında) gətirin”.

Xülasəsi budur ki, “Quran Mühəmmədin özünün yazdığıdır” deyirlər. Əgər bu sözlər doğru olsaydı, onların ki içində fəsahət və bəlağət ustaları var idi! Nə üçün Quran kimi bir şey gətirə bilmədilər?! Elə ki bunun mislini gətirməkdə aciz oldular, məlum olur ki, .Quran Peyğəmbərin kəlamı deyil, Allah kəlamıdır

:Məkkə əhalisi özlərini çox ağıllı hesab etdiklərinə görə, Quran buyurur

Məgər onlar heçdən yaradılıblar, yoxsa öz-özünə yaranıblar?! Məgər torpaqdan,“ nütfədən yaradılmayıblarmı?! Əql sahibi olan kəs kuzəni görəndə demir ki, öz-özünə düzəlib, əksinə, torpaq, su və əql sahibi olan bir kəsin istəyi ilə düzəlmişdir. Bu vaxt ۲۴۸ hissədən ibarət sümükdən əmələ gələn bədən, üzün, gözlərin, ətin, (۲-۳ milyon hissəcikdən təşkil olunan) eşitmə sistemi, ağızın, növbənöv dişlərin, yuxarıdakı sabit çənə, aşağıdakı mütəhərrik çənə... Dilə əmr edib ki, çeynədiyini dişlərin üstünə qoysun, yemək şeylərini dişdən sonra aşağı getmək istəyəndə hülqum və mədə borusu bir-birinin yanında yerləşib. Əgər qida mədəyə deyil, hulquma getsə, insan ani olaraq ölər. !Bu necə də Qahir və Qadir bir qüvvədir ki, bu əzəmətli dəsgahı nəzmə salmışdır

### !SƏNİ GöRMƏYƏN GöZLƏR KOR OLSUN

Mərhum mühəddis Nuri “Darül-islam” kitabında yuxu üçün ۱۶ dənə fayda qeyd etmişdir. Onlardan biri də ehtilamdır (məninin yuxuda çölə axması). Ehtilamın bədənin sağlamlığından əlavə faydalarından biri də budur ki, insan, onu təşkil edən ilkin maddəsini–məni görür, bu üfunətli su qətrəsindən gözəl insan yaranır. Sümük hara, üfunətli su hara! Əbi Əbdillah Hüseyn əleyhis-salam necə də gözəl buyurur: “Kor olsun o gözlər ki, Səni görməzlər!” Dünya malına meyl etmək materializmin, əql qüvvəsinin qarşısını alır. Məkkə əhalisinin işi bir ömür haram mal yemək zinakarlıq, qumarbazlıq, camaatın malını qarət etmək idi. Heç kəs cür”ət edib onlara “gözün üstündə qaşın var” .deyə bilməzdi. Cahildirlər və öz cəhalətləri barədə agah deyillər

### HEÇ KƏS ƏBƏS YERƏ HƏRƏKƏT ETMİR

Əgər bəşər övladı öz cəhalətini e”tiraf etsə, bunun özü onun üçün elmə dönür. Amma vay o kəslərin halına ki, mürəkkəb cəhldə olsun. Bəşərdə həmişə mürəkkəb cəhl olub, nəticədə özünün yanlış işlərini səhih hesab etmişdir. Qeyd olunan ayənin başqa bir mənası da bu ola bilər ki: “məgər məqsəd və hədəf olmadan yaradılıblarmı!? Sən özünü ağıllı hesab edirsən, bu yaradılış dəsgahının nəticəsi və səmərəsi yoxdurmu?! Əgər sən bir ev tikməyə başlasan və başqası sənə e”tiraz etsə, deyərsən ki, mən boş .yerə iş görmürəm evi öz asayişim üçün düzəldirəm

Evi öz asayişim üçün düzəldirəm. Hətta sənin tövləndən çölə çıxan heyvanlar dən tapmaq, qida tapmaq üçün çölə gəlirlər. Aləmin hər bir üzvü hədəfsiz, məqsədsiz işləmir. Bu halda aləmin sahibi məqsədsiz yerə sizi yaradıbdır? Sizi maddiyyat və alçaqlıq üçün düzəldibdir? Əqlin deyir ki, əbəs yerə xəlq olunmusunuz? Nə qədər qanmazsınız?! Aləmdə olan ən kiçik varlıq belə hədəfsiz və məqsədsiz hərəkət etmir. Bu aləmin də nəticəsi və məqsədi Qiyamətdir. Bunların hamısı eşidilməli deyil, görülməlidir. Möminə axirətdə verilən ən kiçik şey bu dünyanın on bərabəridir. Əgər huril-eynin ağzından bir qətrə dəryalara düşsə, dəryalar şirin olar. Bunlar eşidilməli yox görməli şeylərdir. Bu dünya həyatıdır. Minlərlə dərd, qüssə, qəm ilə yanaşı olan həyat. Mömin bu dünyada çətinliklərdə yanmalıdır ki, axirətin böyük səadətinə nail .olsun. Və o səadətə çatmağın yolları da mərifət və əməldir

İnsan iki qanadla–mərifət və əməl ilə ali dərəcələrə pərvaz edir, böyük səadət də ona nəsib olur. Doğrudan da insan fikirləşir ki, bu dünyada özü nə ilə məşğul olubdur: bir .sıra yorucu, təkrar işlər. Halbuki axirət həyatı sırf xoşluqdur və təkrar da olunmur

## ELM VƏ ƏMƏL XİLQƏTİN NƏTİCƏSİDİR

Yaradılışdan məqsəd elm və əməldir. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-in göstərişləri də məhz bu məqsədlədir. Günahlardan paklanmaq üçün. Həzrəti Sadiq əleyhis-salam buyurur: “Qəlb üçün günahdan pis olan bir şey yoxdur. De: ey mənim ”!Pərvərdigarım, bizi günahlardan pakla

Məcməül-bəyan” təfsirində və “Hədisi-qüdsi”də deyilir: “Xudavəndi-aləm İsəbni“ Məryəm əleyhis-salama buyurdu: “Mənim səndən razılığım və xoşhal olmağım o vaxtdır ki, qorxu və tamah (qorxu və ümid) üzü ilə Mənə üz gətirəsən, Məni çağırasan. Xülasə, dilənçilik əllərini İlahinin dərgahına uzatmaq, acizlik, ehtiyacsızlıq üzündən Ona diqqət yetirmək. Allah dərgahında dildə yaltaqlanmaq özü şərəf, səadət və fəxrdir ki, .onun fövqündə heç nə təsəvvür olunmaz

ömür keçir, hər vaxt görsən ki, başında və ya üzlərində ağ tüklər zahir oldu, ölümün .əlamətidir

.Axar suyun qırağında otur öz ömrünün çay kimi necə ötüb keçdiyini gör

Bu dünyadan köçənlərə işarənin özü bizim üçün kifayətdir. Nə qədər ki, ömür sərmayəsi qurtarmayıb səfər azuqəsini götürüb səfərə hazırlaşın, Allaha ahu-nalə edib Ondan mərifətin çoxluğunu, əməli-saleh tovfiqini istəyin. Bu ayələr təkcə Peyğəmbər dövrünün müşriklərinə məxsus deyil, bütün zamanlara şamildir. Dinsiz materialistlər nə deyirlər? Elə bu cür öz-özünə vücuda gəlmisiniz? Sizin əllərinizi vücuda gətirməyiblər? Əgər divarda bir rəsm əsərini görsən deyərsən ki, hökmən bunun bir nəqqaşı var, rəssamı var. Bəs onda sənin üzünün gözəl surətinin nəqqaşı kimdir? Bu gözəl qaşları, badamı gözləri yaradan kimdir ki, onu nə üçbucaq, nə dördbucaq yaradıb, çirkin qərar verməyib. Gözün küncünü deşik yaratmışdır ki, gözün çirkabları burun yolu ilə çıxsın. Bunlar hamısı Allahın müsəvvir (surət verən) olmasını .çatdırmaqdır

Sonra xarici aləmi xatırlayıb buyurur: “özündən keç! Başının üstündəki bu çıraqlar nədir? Onları kim hərəkət etdirir? Ən kiçik ulduzlar yer kürəsindən ۸ dəfə böyükdür. Günəş yer kürəsindən ۱۲۰۰۰۰۰ dəfə böyükdür. Bu yer kürəsini günəşlə müqayisə et! Hansı qüdrət bunları dövr etdirir. Yaxud indiki astronomların dediyi kimi, günəş və s. göy cisimləri müəyyən bir nöqtə ətrafında fırlanırlar. İynənin ucu qədər də hərəkətlərində azalıb-çoxalmaq müşahidə olunmur. Dörd fəsil yer kürəsinin günəş ətrafında fırlanması nəticəsində əmələ gəlir. Hər bir mövcud öz hüdudunda ona tapşırılan işi yerinə yetirməyə məşğuldur. Amma insan öhdəsinə qoyulan vəzifələrdən .boyun qaçırır

Təbiətə materialistlər nə deyirlər? Dediklərinin hamısı təxmin üzərindəndir, nəinki yəqinlik. Hətta onların filosofları və böyük alimləri öz dediklərini dəlil ilə sübut etmirlər. Məsələn, deyirlər ki, pələngin dərisinin rəngli olmasının səbəbi budur ki, o meşədə ağacların altında yatmışdır. Günəş ağacın yarpaqları arasından onun üstünə düşmüş və nəticədə rəngi bu cür olmuşdur. Biz onlara deyirik ki, pələngin balası əvvəldə bu rəngdə olmamalıdır, halbuki elə doğulandan belədir. İkinci sözümüz də budur ki, pələng yatdığı vaxt bədəninin günəşlə müqabil olan tərəfi də bu cür olmalıdır, halbuki bütün bədəni zolaq-zolaqdır. Üçüncüsü də budur ki, sair heyvanlarda pələng kimi .meşədə yaşayırlarsa rəngi onlar kimi olmalıdır

## DƏLİLSİZ SÖZLƏR

Mərhum Fəxrül İslam əvvəlcə məsihi keşişi olmuş, sonra isə islamı qəbul etmişdir. O, "Ənisul-ə"lam" kitabında materialistlərin cavabını vermişdir. O cümlədən deyir: ".“Materialistlər heç vaxt dəlil üzərindən danışmırlar, danışıqlarının hamısı təxminidir

!Təəccüblüdür ki, bəşər bu qədər acizliyi və zəifliyi ilə belə necə də böyük iddialar edir

Zəməxşərinin "Rəbiül-əbrar" kitabında İmam Səccad əleyhis-salamdan bir hədis nəql olunmuşdur: "Həzrət gecələrin birində yerindən qalxıb gecə namazı qılmaq üçün dəstəmaz almaq istəyir. Dəstəmaz üçün su Həzrətin yanında idi. Gecə də aylı idi. Həzrət sağ əlini su ilə doldurub üzünə vurmaq istəyəndə gözü göylərə sataşır. Elə həmin cür başı yuxarı su əlinin içində qalan halda birdən azan verənin "Allahu əkbər" ".səsini eşidir. Məlum olur ki, Həzrət bir neçə saat müddətində həmin halda durubmuş

Bəli, İmam bu cürdür. Əql və iman sahibi də hərdən asimanların və ondakı planetlərin barəsində, onların nəzm və hərəkətində, işıqlarında və çıxıb-batmasında dərindən təfəkkür etməlidir. Beləliklə də onların yaradıcısının nəhayətsiz elm, hikmət, qüdrəti ilə tanış olmalıdır. Və əgər insan asimanları görüb təfəkkür etməsə, heyvanlar ilə heç bir fərqi yoxdur. Ulaq də gözlərini yuxarı qaldırır, amma dərk etmir. İnsan bu yaradılış dəstgahına nə qədər çox fikir versə, bir o qədər də əzəmətli olar; amma nə qədər cüz"i işlərə başını qarışdırsa, o qədər

də alçalar. Camaatın bəziləri yalnız başqalarının işləri və dünya barəsində fikirləşirlər. Bu cür şəxslərin həddi də elə bu qədərdir. Bir kəsin bütün səyi dünya həyatının cüz"i işləri–yemək təmin etmək, geymək, məskən, şəhvətini doyurmaq, bütün fikir və xəyalı mövhumatda, xalqın işlərində axtarış aparmaqda və keçmişdən-gələcəkdən danışmaq olsa və ne"mət verənin tanımaq və şükr məqamında deyilsə, ölümdən sonrakı həyatı tanıyıb, o həyatı təmin etmək fikrində deyilsə, o, insaniyyət dərəcəsindən süqut etmişdir. Və heyvanlar həddində, bəlkə onlardan da daha aşağıdadır. Bunun müqabilində bütün bu sayılanlardan pak olan və daha yüksək .aləmlərə qovuşan mülk aləmindən yüksəyə qalxan bir kəs dayanır

## !YARASA SİFƏTLİLƏRİN GöZLƏRİ İLAHİ AYƏLƏRİ, NİŞANƏLƏRİ GöRMƏZ

Əvvəlki ayə barəsində bəzi alim mühəqqiqlər qeyd etmişlər ki, əgər divarda bir rəsm əsəri görünsə, onu görən bir şəxs dərhal rəssam fikrinə düşür. Amma necə olur ki, bəşər Allahın ayələrini görür, amma yaradanın fikrində deyil. Cavabı budur ki, Allahın nişanə və ayələri o qədər çox və sonsuzdur ki, pas basmış zəif gözlər onu görə bilmir. Məsələn, günəşin nuru çox qüvvətli olduğuna görə yarasanın zəif gözlərinin onu görməyə tabı yoxdur. Bəşər də elə bu cürdür. Bəşərin batini bəsirəti zəif olduğundan ilahi nuru, Allahın ayələrini görməyə tabı yoxdur. Çarəsi də budur ki, başqa bir qüvvə tapsın. Qüvvə tapmağın da vasitəsi namaz, oruc və s. kimi ibadətlərdir ki, bəsirət hasil olsun, hər bir ilahi məlakuti şeyi güclü gözlərlə görmək lazımdır. Allah yolunda ehsan etmək də bəsirət gözlərini açır. Allah yolunda ehsan etməyə və s. ibadətlərə əmr olunması qəlbin genişləndirilməsi üçündür. Bəsirətin qüvvətləndirilməsi üçündür. Bunun əksinə olaraq paxıllıq, həsəd, kin və s. kimi xəstəliklər də idrakın qarşısını alır, .azaldır

Rəsuli Əkrəm səllallahu əleyhi və alihi və səlləm-dən soruşdular ki, qəlbin genişləndirilməsi nədir? Buyurdu: O bir nurdur ki, qəlbə daxil olur. Soruşdular ki, bu nurun nişanəsi varmı? Buyurdu: Dünyanı boşlamaq və axirət aləminə diqqət yetirmək, onu abadlaşdırmaq

fikrində olmaqdır. O hər hansı qəlbə nüfuz etsə adam daha yüksək mərtəbədə olan .aləmlərə diqqət yetirər

Bu qədər qayda qanunlar, müstəhəbb əməllər müəyyən edən müqəddəs şəriət bu işlərin hamısını ruhun qüvvətləndirilməsi üçün qərar vermişdir. O ki, qala Əli əleyhis-salamın arxasında qərar tutana. Bəşər övladının əksərən matirialist baxışlı olduğunun .səbəbi bəsirət gözlərinin kor olması ilə əlaqədardır

Mübarək “Tur” surəsində ۱۵ dənə sual zikr olunmuşdur. Bunlar danlaq və ilzam üçündür ki, cavabları yoxdur. Məsələn bəzən sizlərdən biri kağız səhifəsini uşağın əlinə verirsiniz ki, yazsın. Sonra evə qayıdanda görürsünz ki, əyri-əyri xətlər çəkmişdir. Ona deyirsiniz: Sənə qələm vermədimmi? Sənin üçün nümunə yazmadımmı ki, bu cür pis xətlərlə yazmısan? Bunlara cavabı olmayan suallar deyilir. Allah-Taala on beş dənə bu cür suallarla buyurur: “Yoxsa səbəbsiz yerə yaradıblar?! Yoxsa özünüz özünüzü ”!?yaradıbsız

Bəhlul barəsində yazıblar ki, günlərin birində qəbiristanlıqda oturub bir insan kəlləsinin sümüyünü tapmışdı. Onu torpaqla doldurub sonra boşaldırdı. Bir nəfər gəlib soruşdu: Nə üçün bu cür edirsən? Dedi: İstəyirəm bildirəm ki, bu dünyada bu qədər iddialar !edən bəşərin beyni necə də torpağa dönmüşdür

Bir neçə il bundan qabaq Şiraz şəhərinin sursat anbarına od düşmüşdü. Hamı Allahın dərgahına pənah apardı, hətta ömrü boyu bir namaz qılmayan bir dəfə “ya Allah” ?.deməyən kəslər də. Nədən pənah aparmışdılar

Bir dünyəvi oddan (vay olsun axirət əzabından!), özü də ki, şəhərə çatması sadəcə !ehtimal verilən bir oddan

Aya Pərvərdigarının fəzl və rəhmət xəzinələri onların yanındadırmı ki, hər kəsə“ istəsələr versinlər? Yaxud ilahi elmlər xəzinəsi onların yanındadır ki, kiminsə nübüvvət məqamına layiq olduğunu bilsinlər. Aya onlar bütün əşyalara hakim və qalibdirlər ki, bütün şeylər onların istəkləri altına gəlsin. Belə ki, hər nə istəsələr etsinlər, hər şəxsi ”.istəsələr risalət məqamına seçsinlər

Xəzain”–xəzinənin cəmidir və mənası əsil maddə və külldür. Qeyd etmək lazımdır ki,“ aləmdə olanların hamısı–müxtəlif gözəlliklər, ne”mətlər, qüdrətlər, hikmətlər, insan və heyvan ruzilərinin xəzinələri Allahın yanındadır ki, tədriclə müəyyən qədər də aləmdə :vücuda gəlirlər. Belə ki, “Hicr” surəsində buyurub

Və elə bir şey yoxdur ki, onun xəzinələri Bizim yanımızda olmasın və Biz yalnız məlum“ ”.qədərdə nazil edərik

Bu mətləbin şərhi və təfsilatı uzun, başa düşülməsi də müəyyən qədər çətin olduğundan, ümumi camaatın başa düşməsi üçün, hər ikisini–ilahi batini və zahiri .xəzinələri qeyd edirik

Əgər insan öz ruzisində, habelə bitkilərdən, ləpəli olan heyvan ruzisində bir az fikirləşsə başa düşər ki, onların xəzinəsi və maddəsi su, hava, torpaq və enerqidən ibarətdir. Elmin dediyi kimi oksigen, hidrogen, fosfor, dəmir, azot və s. Aydındır ki, əgər bəşəriyyət bir yerə yığılsa, bu xəzinələrə yol tapa bilməzlər ki, onları artırsınlar. Yaxud onları tərkib edərək nəbatatı və paxlaları düzəltsinlər. Deməli, görəsən bu bəşər bütün bu xəzinələri qüdrət əli ilə yaradan bir Allah müqabilində müti" və zəlil olmamalıdırmı və Ona pərəstiş etməməlidirmi? Başqa bir numunəsi elm və hikmətdir. Bəli, aləmlərin Pərvərdigarını tanımaq və Onun bütün adlarını, sifətlərini; xilqət aləminin sirlərinə, hikmətlərə yol tapmaq, bəşərin səadət və kamalını, məsləhətli işlərini tanımaq, məad və əbədi həyatı tanımaq, ölümdən sonrakı və s. şeyləri tanımaq. Xülasə şəkildə demək olar ki, məqsəd mülk və mələkut aləminə yol tapmaqdır. Şəkk yoxdur ki, heç bir bəşər bu ilahi xəzinəyə yol tapa bilməz, amma Allahın fəzl və kərəmindən bəhrələnərək bu ilahi xəzinələr inayət olunan kəslərdən başqa. Əlbəttə, ilahi ne"mətlərin də dərəcələri vardır. Onun ən yüksək mərtəbəsi Həzrət Mühəmməd ibni Əbdillah səlləllahu əleyhi və alihi və səlləm-in mübarək vücududur ki, bütün elm və hikmət xəzinələrini Allah onun mübarək qəlbində qərar vermişdir. Necə ki, Əli əleyhis-salam o Həzrətin vəsfində belə :buyurur

Elə ki, Allah-Taala öz bəndəsi Mühəmmədi seçdi və onun şərif qəlbini öz elmi" xəzinələri qərar verdi və onu peyğəmbərliyə seçdi, heç bir bəşər bunun müqabilində e"tiraz və imtina etmək haqqı yoxdur. Çünki, Allah elminin xəzinəsi onların əlində deyil. Allahın yanındadır. O da bunları Həzrət Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm-ə vermişdir. Gərək bəşər övladı Allahın öz Peyğəmbərinə verdiyi ilahi elmlərdən istifadə edib öz səadətlərinin yolunu tapsın. Kafirlərin, müşriklərin və Peyğəmbəri inkar edənlərin halı doğurdan da qəribədir ki, onlardan bəhrələnmək yerinə müxalifətə qalxdılar, Düşmənçilik və müharibə etdilər. Doğrudan da bu müşriklər nə deyirlər? Allah bu ayədə buyurur ki: Məgər sənin Pərvərdigarının xəzinələri onun yanındadırmı? Yaxud Onun zahiri və batini

xəzinələri siz camaatın yanındadır ki, özünüzü aləmlərin Pərvərdigarına ehtiyaclı bilmirsiniz və Ona pərəstiş etmirsiniz və Allah demirsiniz? Yox belə deyil, əgər Allah öz ne"mət qapılarını tamamilə bağlasa nə olar? Yazırlar ki, ۱۲۹۷-ci hicri ilində (۸۰ il öncə) elə bu Şiraz şəhərində ۷ il qəhətlik oldu. Camaat çörək tapa bilmədi. Təkcə qəhətlik deyil sel, zəlzələ, quraqlıq, yoluxucu xəstəliklər yayılmağa başladı. O vaxt məlum olur ki, camaatın vəziyyəti necə oldu. Deyirlər bir nəfər Allahın işlərinə həyasızcasına dəxalət edirdi. Ona deyəndə ki, əgər Allah çeşmələri qurutsa suyu haradan gətirəcəksən? O dedi: Bunun ki, bir çətinliyi yoxdur; bel və külüng gətirib yeri qazıb su çıxardaram. Sübh duranda gördülər ki, gözünün suyu quruyubdur. Hər təbibə müraciət etsələr də, əlacı olmadı. Yəni elə bir Allah ki, sənin gözünün suyunu quruda bilir, sənin gözündən daha pis çeşmələrin suyunun qurudulması necə? Ondan .qorxmalısan, özünü Ondan ehtiyacsız bilməməlisən

## ÖLÜM RÜSVAY EDİR

Mərhum seyyid Ne"mətullah Cəzairi "Zəhrul rəbii" kitabında nəql etmişdir ki, Hindistanda belə bir qayda var ki, hər padşah fani dünyadan köçəndə onun cənazəsini taxtın üstünə qoyub əlini açıq halda şəhərdə dolandırır, deyirdilər ki, sultanın .cənazəsidir. Ta ki, camaat onun əlinin boş olduğunu görsünlər

Müsəytir", lüğətdə "qalib", "qahir" və bir kəsin fərmanı altında olmayan şəxsə deyilir." Məgər Allahdan başqa bir kəs müsəytir ola bilərmi? Çox böyük iddiaçılar var idilər ki, .ölümü görməklə susdular

Sülləm" nərdivan mənasındadır. Yəni onların nərdivanları və başqa vasitələri vardır ki, " asimanlara tərəf gedib mələikələrin sözlərinə qulaq assınlar və mələikələrə vəhy olunanları bilsinlər və nəticədə keçmişdən və gələcəkdən xəbərdar olsunlar. O cümlədən Peyğəmbərə deyiblər ki, onlardan qabaq öləcək, yaxud onlar Həzrət Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm-ə qələbə çalacaqlar. Əgər onlardan biri belə bir iddia edirsə ki mələikələrin sözlərini eşidir, qeyb aləmindən xəbərdardır, onda sözünün iddiasının doğruluğuna dair aşkar bir dəlil gətirməlidir. Siz daha yüksək aləmlərə yol tapmısınız ki, bir şey eşidəsiniz? Əgər bir kəs varsa və o aləmə yol tapıbsa, (nübüvvət məqamından başqa) dəlil gətirməlidir. Allah-Taala bir işarə ilə buyurur ki, bunlar Peyğəmbərin müqabilində bu sözləri deyirlər, amma şüurları :yoxdur. Onların şüursuzluqlarını göstərən "mələikələr Allahın qızlarıdır", deməleridir

!Allah cisim deyil ki, övladı da olsun

Bundan da daha pis Allaha iftira və töhmət vurub deyirlər ki, Allahın qızları var. (Çünki, ərəblərin cahiliyyət dövründə qızdan acıqları gəlirdi, öz qızlarını diri-diri qəbirdə dəfn edirdilər.) Məgər Allah üçün qızlar özləri üçün oğlan qərar verirlər? Doğurdan da belə sözləri deyənlər səfehliyin, ağılsızlığın son həddindədir. Məgər belə şəxslər belə yüksək aləmlərə yol tapmışlar ki, nəticədə mələikələrin sözlərini eşitsinlər. Onların Allaha övlad aid etmələrində axmaq olduqlarında bunu demək kifayətdir ki, bundan da pis özlərinin acığı gələn şeyi Allaha aid edirlər. Belə kəslərin yüksək aləmə müttəsil ?olmağa, elm mədəninə qovuşmağa ləyaqətləri vardırmı

Bu da başqa bir sual əlamətidir. Yəni, məgər onlardan risalət üçün muzd istəmisən ki, ?onların öhdələrində ağır bir yük olsun

Qəramətin mənası maddi cəhətdən zərər çəkməkdir. Cinayət olmadan. “Musqəlunə” yükü çox, ağır olanlar mənasındadır. Quranda bu mətləbi təkrar xatırladıb ki, peyğəmbərlər risalət müqabilində camaatdan əcr və muzd istəməmişlər, varlığa tamah salmamışlar. Görəsən əqlin hökmü ilə heç bir tamahı olmayan, bir mehriban :nəsihətçinin nəsihətini qəbul etmək vacib deyildirmi? “Yasin” surəsində buyurur

”.O kəsə tabe olun ki, sizdən heç bir muzd istəmir“

Ruhani heç vaxt maddiyyata nəzər salmır. Əgər bilsə ki, rizq və ruzi verən yalnız Allahdır, o vaxt ruhanidir. Belə olan halda yalnız Allaha nəzər yetirir. “Mən bu risalət müqabilində sizdən muzd istəmirəm.” Bu, Həzrət Davud əleyhis-salamın zireh düzəltməsidir ki, Allah-Taala ona təlim buyurmuşdur. Həzrət İbrahim əleyhis-salamın gileylənməsi də məhz həmin səbəblər üçün idi ki, camaat üçün höccət tamam olsun. Əli ibni Əbi Talib əleyhis-salam Həzrət Mühəmmədin səlləllahu əleyhi və alihi və səlləm :şə”nində buyurur

Xatəmül-ənbiya səlləllahu əleyhi və alihi və səlləm-in qarnı bütün məxluqatın“ ”.qarnından daha boş idi

İbni ömər deyir ki, günlərin bir günündə Rəsuli Əkrəm ilə gəzirdik. Bir xurma ağacının yanına çatanda Həzrət yerə düşmüş bir neçə xurmanı götürdü, təmizləyib mənə təklif .etdi. Dedim yemirəm. Həzrət buyurudu: bu mənim üç gündən sonrakı yeməyimdir

## PEYĞƏMBƏR səlləllahu əleyhi və alihi və səlləm DÜNYA MALINA E"TİNA ETMİRDİ

Sərvətli şəxslərdən biri olan Əbdürrəhman elçilik üçün Həzrəti Rəsulun hüzuruna gəlib ərz etdi: Əgər qızını mənə versən, sizin mənzilinizdən öz mənzilimə qədər ipək və .(məxmər xalçalar döşəyəcəyəm (müəyyən etdiyi o böyüklükdə mehriyə ilə belə

.Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm buyurdu: Görək Allah nə istəyir

Bəli, Həzrəti Zəhra əleyha salam-ın həyat yoldaşı Həzrət Əmir olmalıdır ki, onların toy gecəsindəki xalçaları yerin qumları idi. Rəvayətdə var ki, bütün xəzinələri Həzrət .Rəsula verdilər, amma qəbul etmədi və buyurdu ki, axırı ölümdür

Əli əleyhis-salam buyurur: "Əgər bizim heç bir eyb və nöqsanımız olmasa, amma Peyğəmbərin istəmədiyi şeyi istəsək, (eybli sayılmaq üçün) kifayətdir. Peyğəmbər ".dünyanı istəmirdi

## MUSA VƏ ARPA ÇÖRƏYİNİN BORCU

Həzrət Əmir əleyhis-salam "Nəhcül-bəlağə"nin xütbələrindən birində bir neçə peyğəmbərlərin adını qeyd edir. O cümlədən, Musa ibni İmran barəsində buyurur: O Həzrət o qədər səhranın otlarından və göyərtilərindən yedi ki, göylüyü qarnından görünürdü. Şüeyb Peyğəmbərin qızları üçün su çəkəndən sonra ona arpa çörəyi :verdilər, Allaha şükr etdi və dedi

".Ey Rəbbim, Sən mənə nazil etdiyin xeyrlərə ehtiyaclıyam"

İsəbni Məryəm əleyhis-salamın döşəməsi torpaq çırağı ay idi. Peyğəmbər qadınlarının hücrələrindən birinə gələndə üstündə rəngarəng şəkildə olan bir pərdə gördü, o pərdəni hücrənin qapısına asmışdılar. Həzrət buyurdu: "Bu pərdəni götürün, mən onu ".görməklə dünya fikrinə düşürəm

Mərhum Məclisi "Biharul-ənvarda" nəql etmişdir ki, Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm hər vaxt səfərdən qayıdanda əvvəlcə Həzrət Zəhra əleyha salam-ın mənzilinə gedirdi. Bir gün

səfərdən qayıdanda Həzrəti Zəhra əleyha salam-ın evinə daxil oldu, gördü ki, qızının boynunda boyunbağı, əllərində bilərzik, qulaqlarında sırğa var və hücrənin qapısına bir pərdə asılıbdır. Rəsuli Əkrəm dərhal o evdən çölə qayıtdı. Həzrət Zəhra əleyha salam onun qayıtmasının səbəbini başa düşdü, Həzrət Həsən və Hüseyn əleyhis-salamı çağırıb bəzək əşyalarını Peyğəmbərin yanına göndərib dedi: "Babanıza deyin ki, bunları Allah yolunda sərf etsin." Rəsul Əkrəm səlləllahu əleyhi və alihi və səlləm üç dəfə buyurdu: "Atası ona qurban olsun!" Həsən və Hüseyn əleyhiməs-salam-a buyurdu ki, Ali-Mühəmmədin dünya malı ilə nə işi! Əgər dünyanın milçəyin qanadı qədər dəyəri .olsaydı, Allah yanında ondan düzələn su şərbətini kafirə verməzdi

## DÜNYA EVSİZLƏRİN EVİDİR

Peyğəmbərlər axirət aləmini görürdülər, məhz buna görə də dünyaya heç əhəmiyyət vermirdilər. Evi olmayan hər kəs dünyada löbər salmışdır. Necə ki, Rəsuli Əkrəm :səlləllahu əleyhi və alihi və səlləm buyurur

Dünya əbədi evi olmayanların evidir, həqiqi sərmayəsi olmayanların malıdır;" əqlsizlərdən başqası dünyada bina tikməz, ona ürək bağlamaz."(Axirəti unudaraq (.əbədi şəkildə dünyada qalmaq niyyətilə bina salanalar red

Əzəmətli peyğəmbərlər dünyaya tamah salmaqdan çox-çox uzaqdırlar. Amma xums və zəkat məsələsinə gəldikdə isə, qeyd etmək lazımdır ki, bunlar bütün dinlərdə vacib olmuşdur. Amma peyğəmbərlərə heç bir dəxaləti yoxdur. Çünki, zəkat və xums, ümumiyyətlə, fəqirlər üçün olub onlara xərclənir. Peyğəmbər övladlarına isə zəkat haramdır. Zəkatın özü isə malın pak olmasına səbəbdir. Həzrət Zəhra əleyha salam :"Fədək" xütbəsində buyurur

".Allah-Taala zəkatı malın artıb inkişaf etməsi üçün qərar vermişdir"

Digər tərəfdən isə, məgər zəkatın miqdarı nə qədərdir ki? Qızıl və gümüşün zəkatı sikkəli olan halda qırxdan birdir, belə ki, əgər bir kəsin qırx misqal qızılı olsa, onun bir misqalı zəkatdır. Taxılın zəkatı iyirmidə bir; əgər yağış suyu ilə suvarılsa, onda birdir. Xumsa gəldikdə isə, əgər illik xərclərdən bir şey artıq qalarsa, onun beşdən

biri Həzrət Zəhra əleyha salam-ın övladlarına verilir. İl boyu da xərclənənlərin xumsu .yoxdur

## XUMS ÖZÜ DƏ BİZİM XEYRİMİZƏDİR

Biharül-ənvar" kitabının ۱۱-ci cildində İmam Sadiq əleyhis-salamın kəramətli" işlərindən biri qeyd olunmuşdur. Şiələrdən biri bir qədər malı xums kimi İmamın hüzuruna gətirdi. öz-özünə fikirləşərək onu çox hesab edirdi. Sonra İmam qulamına buyurdu ki, evin küncündə olan teşti gətirsin. Elə ki, gətirdi, İmam bir neçə kəlmə oxudu, sonra buyurdu ki, teşti boşaltsın. Teşti boşaldanda o qədər dinar töküldü ki, qulam ilə o kişinin arasında fasilə saldı. İmam buyurdu: Sənin fikrincə, bizim sizin əlinizdə olanlara ehtiyacımız vardırmı? (Yəni Allahın bizə əta etdiyi bu qədər qüdrətlə :belə!) Sonra buyurdu

".Sizdən aldıqlarımız sadəcə olaraq sizin özünüzün paklanmağınız üçündür"

Bu şərif ayədən məlum olur ki, Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm dünya əhlindən heç nə istəməmişdir. Əli əleyhis-salam buyurur: "Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm dünyadan gedəndə heç bir kərpici də kərpic üstünə qoymamışdı. Yəni heç nə özünə düzəltməmişdi Peyğəmbərin evi xurma ağacının yarpaq və budaqlarından tikilmişdi. Alimlərdən bəziləri demişlər ki, yaxşı olardı ki, müsəlmanların sonrakı əsrlərdə o Həzrətin evinin necə olduğunu görsünlər deyə, o evi olduğu kimi saxlayardılar. Sonrakı əsrin müsəlmanları Peyğəmbər səlləllahu əleyhi və .alihi və səlləm-in necə ağır vəziyyətdə yaşadığını görsünlər

## MÜSAFİRLƏR KİMİ YAŞAYIN

Salman Farsinin (rəhmətullahi əleyh) malik olduğu kəramətlər, xariqül-adə işlər hamı arasında məhşur olduğuna görə onu tanıtdırmağa lüzum yoxdur. Amma o, ölüm ayağında ağlayırdı. Soruşdular ki, nə üçün ağlayırsan? Dedi: Qorxuram ki, Rəsuli Xuda ilə öz əhdimə vəfa etmədiyim halda görüşüm. Dedilər, sənin kimi insan da bu qədər ah-nalə edər. Salman dedi: Həccətül-vidada Rəsuli Əkrəm Kəbənin həlqəsindən :yapışıb buyurdu

Dünyada süvari yol gedən adamlar kimi yaşayın. İnsafla danışın, yaşayış tərzi bu olan “ Peyğəmbər Salmana necə buyurur: tovhid əhli olun, öz aqibətiniz üçün azuqə ”.hazırlayın. Dünyaya ürək bağlamaq pisdir. Həsəd, paxıllıq, tamah, çirkin sifətlərdəndir

Bunların hamısı Peyğəmbərin nəsihətlərindəndir. O, camaatdan heç nə istəmirdi. Ümumiyyətlə, onun muzdunu Allahdan başqa kim verə bilər? Belə ki, o buyurur: “Qulu la ilahə illəllah tuflihu-”la ilahə illəllah deyib nicat tapın” Camaatın qarşısında ona .töhmət vururlar, daş-qalaq edirlər və s

Məgər onların yanındadır Lövhi-məhfuz ki, onlar yazırlar: Peyğəmbərin məbdə və məad haqqında verdiyi xəbərlər səhih deyil. Yaxud, ondan kitabət edib xəbər versinlər .ki, Peyğəmbər öləcək və onun də”vəti batil olacaq

Onlar istəyirlər ki, sənin barəndə məkr və hiylə etsinlər?” Səni aradan aparmaq üçün“ və sənin də”vətini söndürmək üçün. Kafir olanlar özlərinə qarşı məkr olunub. Yəni, onların məkr və hiylələrinin bəlası özlərinə qayıdır. Necə ki, Bədr döyüşündə öldürüldülər, bütpərəstlik Məkkədən yığışdırıldı. Bu şərif ayədə müşriklərin məkr və hiylələri barəsində bəzi müfəssirlər buyurmuşlar ki, məqsəd Rəsuli Əkrəmə vurulan iftira və töhmətlərdir. Ona şair, məcnun, kahin deyirdilər. Bu iftira və töhmətlərdən məqsədləri bu idi ki, camaat ona tərəf yaxınlaşmasın, sözlərinə qulaq asmasın və nəticədə onun də”vəti camaata çatmasın, Allahın nurunu söndürsünlər. Amma, bu məkr və hiylələrin bəlası özlərinə qayıtdı. Çünki, əvvəla o Həzrətin də”vətinin yayılmasının qarşısını ala bilmədilər. İkincisi, özləri bədbəxtlik və məhrumiyyətə düçar, əbədi səadətə çatmaqdan məhrum oldular. Onların məkrləri müqabilində Allah onlara .tövfiq vermədi, qəlblərini möhürlədi

Təfsirçilərdən bəziləri demişlər ki, bu ayədəki „ÓÍÚœ-məkr kəlməsi müşriklərin ictimasına, “Darün-nədvə”də yığışdıqları toplantıya işarədir ki, bu toplantıda Peyğəmbəri qətlə yetirməyi qərara almışdılar. Allah da onların məkrlərini özlərinə qaytardı. Sonradan öz Peyğəmbərinə hicrət etməsini əmr etdi. Bədr müharibəsinə qədər müşriklərin hamısı öldürüldü. “Darün-nədvə” məsələsi icma şəkildə bundan ibarətdir ki, müşriklər şura təşkil edib dedilər ki, Rəsuli Əkrəm Mədinəyə getsə camaat onun ətrafına yığışacaq, işimiz daha

da ağırlaşacaq. Sonra, darülnəqvə deyilən bir yerə yığışdılar, şeytan da qoca bir kişi surətində onların içinə daxil oldu. Sözə ilk dəfə başlayan Əbu Cəhl idi. O dedi: Mühəmməd bizim işlərimizi korlamışdır. Bizim başımızı alçaltmışdır. Biz bir neçə nəfərə pul verib göndərməliyik ki, gözlənilmədən hücum edib Mühəmmədi öldürsünlər. Şeytan dedi: Bu olan iş deyil. Çünki, onun öldürülməsi asan deyil. Bəni Haşim də əl çəkən deyillər. Üməyyə və Əbu Süfyan dedilər: Mühəmmmədi zəncirləyib zindana salmalıyıq və zindanda bir baca yeri qoymalıyıq ki, ölməsin. Şeytan yenə dedi: Bu olan iş deyil. Əvvəla, Bəni Haşim bu işin baş verməsinə mane olacaqlar, əgər gücləri də çatmasa Həcc vaxtı başqalarından kömək istəyəcəklər. Və ona nicat verəcəklər. Dedilər, Mühəmmədi əhilləşməmiş dəvənin üstünə mindirib çöllərə buraxaq ki, ölsün. Şeytan yenə dedi: Bu da qeyri-mümkündür. Çünki, Mühəmməd özünün fəsahətli kəlamları ilə camaatı cəzb edəcək, camaat da onun ölməsinin qarşısını alacaq. Şeytan bu sözlərlə məclis əhlinin nəzərini özünə cəlb etdi. Camaat onu məclisin baş tərəfinə keçirtdilər. O məl"un rə"y verdi ki, gərək hər qəbilədən, hətta Bəni Haşim qəbiləsindən də bir nəfər seçilib birlikdə Mühəmmədi öldürsünlər. Belə olan halda Bəni Haşimin bütün qəbilələrə gücü çatmayacaq. Bu rə"y qəbul olundu. Hamı qərara aldı ki, həmin gecə Peyğəmbəri öldürsünlər. Cəbrail Peyğəmbərə nazil oldu və ərz etdi ki, indi sənin Mədinəyə hicrət etməyinin vaxtı çatıbdır. Allah əmr edir ki, öz evindən çıx və Əlini öz yerəndə qoy. Peyğəmbərin getməsi qeyri-mümkün idi. Çünki Həzrət camaat arasında əmanətdarlığı ilə məşhur idi və yanında çoxlu əmanət qoyulmuşdu. Digər tərəfdən arvadı və qızı Həzrət Fatimə orada idi. Xülasə, qərara alındı ki, Əli əleyhis-salam qalıb Peyğəmbərin ailəsinə başçılıq etsin və əmanətləri çatdırsın. Xülasə Əli, Peyğəmbərin yerində yatdı. Müşriklər güman etdilər ki, Peyğəmbərin özüdür. Bəziləri dedi ki, elə bu gecə onu öldürək. Əbu Ləhəb onlara mane olub dedi, evdə qadın vardır, gözləyin, sübh .öldürərik

səh:۱۰۷

## ALLAHIN ƏLİ əleyhis–salam İLƏ İFTİXAR ETMƏSİ

Sünnü və şiə alimləri tərəfindən belə bir rəvayət nəql olunmuşdur: Höccətül-İslam Ğəzzali də "Ehyaül-ülum" kitabında qeyd etmişdir ki, Cəbrail və Mikailə nida çatdı ki, siz iki nəfəri bir-birilə qardaş etdim və birinin ömrünü o birisindən artıq etdim. Sizlərdən hansı az ömrü götürüb, çoxu o biri qardaşına vermək istəyir? Hər ikisi susub qaldı. ölümə ikrah hissi ilə yanaşdılar. Nida gəldi ki, nə üçün Məhəmməd və Əli kimi olmadınız? Hansı ki, onların arasında qardaşlıq əhdi bağladım, Əli öz canını .Peyğəmbərin canına fəda etdi

Başqa bir rəvayətdə də gəlmişdir ki, Peyğəmbər Əliyə canının sağ qalması barədə arxayınlıq vermədi və Əli ciddi olaraq Peyğəmbərin yolunda ölümə hazır oldu. Seyyid ibni Tavus "İqbal" kitabında Həzrət Əli əleyhis-salamın şə"nində müfəssəl şəkildə yazmışdır. İşin xülasəsi belə oldu ki, Cəbrail və Mikailə əmr olundu ki, Yer üzünə gedib, mənim dostum Əli ibni Əbu Talibə keşikçi olun! Cəbrail o Həzrətin başının tərəfində, .Mikail isə ayaq tərəfində qərarlaşıb, "bəh-bəh, ya Əli!" dedilər

Sünnü hədisçilərin çoxu üçün də aşkar bir məsələdir ki, Əli əleyhis-salam Rəsuləllahın yolunda necə fədakarlıq edibdir. Allah da onun üçün mələkut aləmində iftixar etmişdir. Sübh olanda Peyğəmbərin evinə töküldülər və Onu tapmayıb yerində Əlini gördülər. Əbu Cəhl dedi: Mühəmmədi hara göndərdin? Əli əleyhis-salam buyurdu: Məgər Mühəmmədi mənə tapşırmışdınızmı? Onlardan biri dedi ki, indi ki Mühəmməd gedibdir, onun yerinə Əlini öldürək. Əbu Cəhl dedi: Bu cavanın ağlı düz işləmir. Əli buyurdu: Allah mənə o qədər əql mərhəmət edib ki, əgər bütün aləmə bölsələr və paylasalar heç kəs dəli qalmaz və mənə elə bir qüvvə əta etmişdir ki, əgər bütün camaat arasında paylansa, aləmdə zəif insan qalmaz. Bu yerdə Əbul Bəxtəri adlı bir nəfər qılıncını siyirib Həzrəti öldürmək istədi. Əmirəl-Möminin Əli əleyhis-salam onun sağ əlini tutub sıxdı, qılınc əlindən düşdü və özü də titrəməyə başladı. Sonra yerə yıxıldı. Sonra o məl"unu .çiyinlərində götürüb evdən çölə apardılar

## PEYĞƏMBƏR səlləllahu əleyhi və alihi və səlləm–İN AYAQ İZLƏRİNİ AXTARIRLAR

Münadi car çəkib dedi ki, hər kəs Mühəmmədi tapsa, yaxud ondan bir xəbər gətirsə, ona yüz dəvə veriləcəkdir. Ərəblərin arasında bir nəfər var idi ki, ayaq izlərini gözəl şəkildə tanıyırdı. O şəxs gəlib dedi ki, bu Peyğəmbərin ayaq izidir ki, İbrahimin qədəmlərinə oxşayır. Bu izi tutub gedin. Müşriklər həmin işi gördülər. Nəhayət, "Sur" dağına çatdılar. O dağda bir mağara var idi. (Peyğəmbər bu mağaraya gedəndə Əbu Bəkri də yolda özü ilə götürmüşdü.) Müşriklər mağaranın ağzına qədər gəlib çatdılar. Əbu Bəkr dedi, ya Mühəmməd, indicə gələcəklər və bizi tutacaqlar. Peyğəmbər buyurdu: "Nigaran olma, iki nəfər hər yerdə olsa, üçüncüsü Allah-Taaladır." Rəsuli Əkrəm ağaca işarə etdi, ağac gəlib mağaranın ağzında qərarlaşdı. Hörümçək də orada tor çəkdi və göyərçinlər də orada gəlib yuva qurdu və yumurta qoydular. Müşriklər mağaranın ١٠ metrinə qədər gəldilər. Sonra ayaq izlərini tanıyan şəxs dedi: Buraya qədər Mühəmmədin ayaq izləri var. Amma, bundan o yana yerə girdiyini, yaxud göyə çıxdığını bilmirəm. Bəziləri mağaranın içinə girmək istədilər, lakin başqaları dedi ki, bu hörümçək toru, göyərçin yumurtaları göstərir ki, uzun müddətdir ki, bu mağaraya heç kəs gəlməyib. Bunu deyib qayıtdılar və belə fikirləşdilər ki, mağarada heç kəs yoxdur. Allah bunların məkr və hiylələrinin müqabilində məkr etdi. Nəhayət, məkr sözü ilə gətirilən ibarə eynilə cəzalandırmaq mənasındadır. Yəni, pisliyin əvəzi pislik kimidir. Əvvəlcədən, heç nə olmadan, məkr işlətmək əqlən qəbahətli şər"ən isə haramdır. .Amma, edilən məkrin müqabilində məkr etmək əqlən bəyənilmiş, şər"ən də caizdir

Onlar yanıldılar. Hörümçəyin toru və göyərçinləri Allah iznilə o mağaranın ağzında qərar verdi. Əbu Bəkrin ürəyi o mağarada bərk döyünürdü. Amma Peyğəmbər, qəlbinin qüvvəti ilə orada idi. Müşriklər qayıtdı. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm Əli əleyhis-salam üçün xəbər göndərdi ki, sən amandasan, özünü mənə çatdır, mən Mədinəyə tərəf hərəkət edirəm. Hər vaxt mənim borclarımı və əmanətlərimi təhvil verdin, Fatimələri yəni, Fatimeyi Zəhra əleyha salam, Fatimə Binti Əsəd və Fatimə Binti Zübeyri bir neçə zəif müsəlmanlarla birlikdə özün ilə Mədinəyə gətir. Həzrət Əli əleyhis-salam da bu işi yerinə yetirdi. Müşriklərin yolda maneçilik

törətmələrinə baxmayaraq Həzrət Əli əleyhis-salamın qılıncı ilə öz yerlərində .oturduldu

## YOLDAKI HADİSƏLƏR

Peyğəmbər və Əbu Bəkr Mədinəyə doğru hərəkət etdilər. Müşriklər Həzrəti tutmaq üçün yüz dəvə mükafat təyin etmişdilər. Həmçinin, hər kəs Peyğəmbərdən bir xəbər gətirsəydi də eyni qayda ilə. Süraqə ibni Malik bu mükafatı əldə etmək məqsədilə o Həzrətə doğru hərəkət etdi. Peyğəmbər buyurdu: İlahi, məni Süraqənin şərrindən xilas et! Və bu zaman Süraqənin atının ayaqları yerə batdı və atdan yerə yıxıldı. Peyğəmbərin yanına qaçıb dedi: Ey Mühəmməd, bildim ki, bu bəla sənin tərəfindən mənə çatdı. Dua et bu işdən xilas olum, and içirəm ki, ömür boyu məndən sənə heç bir pislik çatmayacaq. Peyğəmbər dua etdi, at xilas oldu. Elə ki, ata mindi yenidən o Həzrəti təqib etməyə başladı. Yenə də atı yerə batdı. Yenə də Peyğəmbərə yalvardı, Peyğəmbər dua etdi. Xülasə, xilas oldu. Bu iş üç dəfə təkrar olandan sonra üçüncü dəfə xilas olandan sonra dedi: Ey Mühəmməd, mənim dəvələrimi, qulamlarımı və oxumu götür. Hər yerdə istəsən istifadə et! Mən heç kəsi qoymaram ki, səni təqib .etsin. Peyğəmbər buyurdu: Mənim sənin malına ehtiyacım yoxdur

Yolda bir nəfər Peyğəmbərin qabağını saxladı. Peyğəmbər onun adını soruşdu. Ərz etdi ki, adım Büreydədir. Peyğəmbər buyurdu: Bərədə əmruna-yəni, bizim işimiz asan və yaxşı oldu. Sonra buyurdu ki, hansı qəbilədənsən? Dedi: Bəni Əsləm qəbiləsindənəm. Həzrət buyurdu: Salamatçılıqla qurtardıq. Bir qədər danışdıqdan sonra ona buyurdu, İslamı qəbul et! Peyğəmbərin təsirli kəlamı səbəbilə o və onun ətrafında olan ٧٠ nəfər müsəlman oldu. Büreydə Rəsuli Əkrəmə ərz etdi ki, Mədinəyə bu cür getməyin. İcazə verin mən sizin ələmdarınız olum. Həzrət buyurdu: özün necə istəyirsənsə eləcə də et! Büreydə Rəsuli Əkrəmin və Əli əleyhis-salamın yaxın .dostlarından oldu və Həzrətin vəfatından sonra Əbu Bəkr və ömər ilə bey”ət etmədi

Büreydə öz əmmaməsini bayraq etdi. Peyğəmbər ١٢-١٣ gün yolda oldu. Sonra Mədinəyə çatdı. Yol əsnasında Ümmu Məbəd adlı bir qadının xeyməsinə çatdı. Həzrət soruşdu: Nəyin var? O dedi: Arıqlıqdan çölə getməyən bir qoyunum var. Qoyunun süd ?verirmi

Dedi: Yox. Peyğəmbər buyurdu: İcazə ver onu sağım. Rəsuli Əkrəm öz əlini qoyunun .döşünə vurdu. Elə bu anda süd onun döşlərindən axmağa başladı

.Hamısı içdi. Bu qoyun ١٧ il diri qaldı və ömərin xilafəti dövründə düşüb öldü

Başqa bir rəvayətə görə Peyğəmbər xurmanı yeyib dənəsini həmin torpaqda əkdi. Xurma göyərdi. Başqa bir rəvayətdə var ki, o tikanlı ağac idi ki, Peyğəmbər onun yanında dəstəmaz aldı, ağzının suyunu və dəstəmazın suyunu o ağacın dibinə tökdü, ağac böyük bir yaşıl ağaca çevrildi. Meyvələrindən xəstə yeyirdisə, dərhal şəfa tapırdı. .Hər ac və susuz insan ondan yeyirdisə susuzluqdan və aclıqdan doyurdu

Peyğəmbər vəfat edən vaxt onun meyvələri naqis oldu. Əli əleyhis-salam dünyadan gedəndə daha meyvə vermədi, Hüseyn əleyhis-salam şəhid olandan sonra o ağacdan qan axmağa başladı və quruyub aradan getdi. Rəsuli Əkrəm gedəndən sonra Ümmü Məbədin əri gəlib vəziyyəti başqa cür gördü. Məsələni soruşdu, özü və onun qəbiləsi .hamısı müsəlman oldular

Həzrəti Peyğəmbər Quba məhəlləsinə çatıb ١٧ gün orada qaldı və buyurdu: Nə qədər ki, əmim oğlu Əli gəlməyibdir buradan hərəkət etməyəcəyik. Nəhayət, Əli və onunla birlikdə gələnlər gəlib çatdılar və oradan Mədinəyə yola düşdülər. Peyğəmbərin Məkkədən hərəkəti rəbiül-əvvəlin ١-i, Mədinəyə çatması isə ١٢-ci günü oldu. Mədinə əhlinin hər biri Peyğəmbəri öz evinə aparmaq istəyirdi. Həzrət buyurdu: “Mən ixtiyarı dəvəmin öhdəsinə qoydum. Hər yerdə dayansa, o yerdə mənzil edəcəyəm.” Bunu deyib, dəvənin yüyənini buraxdı, dəvə gəlib Əbu Əyyub Ənsarinin evinin müqabilində dayandı. Peyğəmbər altı (başqa rəvayətə görə səkkiz) ay orada qaldıqdan sonra yerini .dəyişdi

Bu sonuncu sual daha mühümdür. Məkkə müşriklərinə xitabən deyilməsinə baxmayaraq, ümumi bir sualdır Qiyamətə qədər. “Məgər özləri üçün aləmlərin Pərvərdigarından başqa bir ilahi, məbud, tək olan Allahdan başqa bir məbud seçirlərmi ki, ona pərəstiş etsinlər, bəlalarda ona pənah aparsınlar və öz istəklərini də ondan .istəsinlər. Allah Ona qoşulan şirkdən çox-çox uzaqdır

İlah–fial, kitab vəznində olan bir məsdərdir, ələhə, ilahən, məbud mənasında olandır. Məbud–yəni, pərəstiş olunan. Şəkk yoxdur ki, həqiqi məbud o şəxsdir ki, həqiqi ne"mət verən olsun. Məlumdur ki, bütün ne"mətlər Allahındır. Hər bəşərin varlığının əksi, onun etdiyi bütün istifadələrin hamısı tamamilə Allah tərəfindəndir. Deməli, yaxşı layiqlidir ki, ibadətə layiqli olan Odur, vəssəlam. İbadət–yəni, pənah aparmaq, sığınmaq, zəlil, xaşe", xaze" olmaq, bəndəçiliyin axırıncı həddinə çatmaq. Hər nəyin müqabilində olursa–olsun. Bəzilərinin məbudu bütdür. özləri canlı olmasına baxmayaraq, cansız şeylərə pərəstiş edirlər. Bəziləri, yeddi yüz milyondan artıq insan bütə pərəstiş edir. Çində, Hindistanda, Yaponiyada və s. kimi ölkələrdə. Dostlarımdan bəzisi nəql edir ki, Hindistanın bütxanalarında bir hindu şəxs yeddi saat öz əllərini biz qunut tutduğumuz kimi bütün qarşısında əllərini göyə açıb dayanır. Biz nə üçün Allahın qabağında belə etmirik? Rəvayətdə var ki, hər kəsin bu dünyada qunutu uzun olsa, Qiyamətdə hesabı daha rahat olacaqdır.

Başqa bir dəstə isə qəsr, saray və s. kimi şeylərə pərəstiş edirlər. Onu gözəlləşdirmək üçün çalışırlar. Qadınlar qızıla, paltara, bər–bəzəkli şeylərə daha çox meyl edirlər. Başqa bir dəstə ağaca pərəstiş edir. Hindistanda iki növ ağac vardır ki, pərəstiş olunur. Onlardan birinin yarpaqları mütəhərrikdir, başqasının isə üç yarpağı var ki, ortadakı yarpağı hərəkətdədir. Başqa bir qrup isə inəyə sitayiş edir. İnəyə pərəstiş edənlərdən daha pisi, bir qadını görəndə hər şeyini ona qurban verən, malını, canını, bədənini, qəlbini ona təslim edib, onun müqabilində zəlil olan insanlardır. Ümumiyyətlə, həqiqi ne"mət verənin–aləmlərin Pərvərdigarının qarşısında zəlil olmaq yerinə öz şəhvətlərinin qulu olurlar. Belə olan vaxtda, Möminləri də məsxərəyə qoyurlar, "sizlər köhnəpərəstsiniz" deyirlər. Bəziləri isə günəşə, aya pərəstiş edirlər. Məsələn, çoxları Zöhrə ulduzuna sitayiş edirlər. Başqa bir dəstə isə öz növündən olan bəşər müqabilində zəlillik, bəndəçilik edirlər.

Fəxri Nazimin "Ləvamiül–bəyyinat" kitabında İmran ibni Hüseyndən nəql olunur ki, Peyğəmbər bir gün mənə buyurdu: "Bu gün neçə dənə ilaha sitayiş etmisən?" Cavabda dedim ki, altı, ya yeddi olar. Altısı yerdə, biri asimanda. Çünki, ərəb qəbilələrində çoxlu bütlər var idi, hər kəs bir və ya bir neçəsinə pərəstiş edirdi.

:Peyğəmbər buyurdu

?Onlardan hansına öz arzularına çatmaq üçün pərəstiş edirsən

.Dedim: Asimanların Xaliqinə

Peyğəmbər buyurdu: Elə bu sənin üçün bəsdir. Sənin bütün istək və arzularını asimanların Allahı təmin edir. Daha bütlərə heç bir ehtiyacın yoxdur. Onların da əlindən heç bir iş gəlmir. Sonra buyurdu: Əgər müsəlman olsan, sənə iki kəlmə öyrədərəm ki, onlardan istifadə edib faydalanasan. Sonra İmran müsəlman oldu və o iki kəlməni :Peyğəmbərdən öyrənmək istədi. Peyğəmbər buyurdu: Bu duanı et

”.Allahummə əlhimni rüşdi və əizni min şərri nəfsi“

İlahi, mənə ilham et düz yolu-hidayət yolunu, nicat və səadət yolunu mənə anlat. İlahi“ ”.mənə öz nəfsimin şərrindən pənah ver

Doğrusu Peyğəmbərin buyurduğu bu cümlə necə də mühümdür. Bilmək lazımdır ki, şirklərin ən pisi həvayi-nəfsə pərəstiş etmək, hətta bütün batil pərəstişlərin həqiqəti həvayi nəfsə pərəstişə qayıdır. Yəni, “mən” pərəstlik, gözəllik pərəstlik, qadın pərəstlik, məqam pərəstlik və s. kimi şeylər. Hətta, bütpərəstliyin özü də nəfsin meyli üzündən olmadığına görə həvayi-nəfsə pərəstişdir. Allah bizi öz nəfsimizin şərrindən saxlasın! !Bizi tövhid və Allahpərəstlərdən etsin

## ALLAHDAN BAŞQA HEÇ KƏS PƏRƏSTİŞƏ LAYİQ DEYİL

İndi ki, ilahin mənası aydın oldu, zikr olunan ayənin mənası məlum olur ki, Qiyamətə qədər bu xitab ümumidir: məgər özünüz üçün məbudlarınız qərar verdiyiniz bunlarda bir şey varmıdır ki, onun xatirinə ibadət edirsiniz. Ey mənpərəstlər, ey inəkpərəstlər, ey qadınpərəstlər, ey cəh-cəlalpərəstlər. Məgər bunların ibadət olunmağa, pərəstiş olunmağa ləyaqətləri varmı? Nə üçün özünüz kimi, yaxud özünüzdən də alçaq olan məxluqların müqabilində zəlil olursunuz? Məgər bilmirsiniz ki, Allah sənin işini ona-buna yalvarışla və yaltaqlanmaq olmadan düzəldə bilər. Həmçinin, Allahdan başqa özünə məbud seçdiyin şeylərin sənə nə kimi şərafəti vardır? Onun malik olduğu əql, göz, qulaq və s. əzalar səndə də vardır; əgər onlar sənin hər hansı bir müşkülünə nicat

vermək üçün, bağışlanmaq üçün vasitə olsalar, onların da hamısı öz növbəsində Allaha qayıdır. Yəni, əgər Allah istəsə, hər hansı bir məxluqun

vasitəsi ilə sənin işini düzəldəcəkdir. Yox, əgər istəməsə, ən güclü fərdlər belə bu işi yerinə yetirməkdə aciz qalacaqlar. Bütün bu işlərin hamısı Allahdandır ki, məxluqatın .vasitəsi ilə icra olunur

## XƏLİFƏ BAĞDAD KöRPÜSÜNÜN YANINDA

Abbasi xəlifələrinin biri Bağdad körpüsünün yanından keçəndə zahirdə sultan oğluna oxşayan bir dilənçini gördü. Amma onun paltarları dilənçi paltarlarına oxşamırdı. Bu barədə maraqlandıqdan sonra məlum oldu ki, əvvəlki xəlifənin oğludur. Onun halından riqqətə gəldi və yüz qızıl əşrəfi pulu ona verib dedi ki, bu sərmayəni götür və daha dilənçilik etmə! Qayıdanda yenidən gördü ki, həmin şəxs orada oturmuş, dilənçilik edir. Soruşdu: Məgər sənə yüz əşrəfi vermədim? Dedi: Əşrəfiləri cibimə qoymaq istəyəndə çaya düşdü. Xəlifə elə oradaca iqrar etdi ki, Allahın istəmədiyi bir iş heç vaxt baş .tutmaz. Yəni fəqir olmasını istədiyi bir şəxsi sultan da zəngin edə bilməz

Alimlərdən biri can üstündə olanda dövrün xəlifəsi ona baş çəkməyə gedir. Bu böyük alimin yatağının kənarında oturanda deyir ki, neçə övladın varsa, icazənlə onları mənə həvalə et. Yəni onların həyatının idarə olunmasının başçılığı mənim öhdəmdə olsun. Bu böyük şəxsiyyətli alim sükut edib heç nə demir. Üç kərə təkrar etdikdən sonra alim deyir ki, mən öz Allahımdan xəcalət çəkirəm ki, öz övladlarımı Ondan başqasına tapşırım. Sultan da onun bəndələrindən biridir. Gərək övladı elə şəxsə tapşırasan ki, əbədi olaraq qalsın. Əgər Allah öz lütf nəzərini bir kəsdən kəssə, hətta ona verdiyi pul da heç bir ehtiyacını təmin etməz və yarasını sağaltmaz. Ola bilsin ki, çox varlı-dövlətli .olan şəxslər əlacı olmayan xəstəliklərə düçar olub acından ölsünlər

## BU AYƏLƏRİN ƏVVƏLKİ AYƏLƏRLƏ ƏLAQƏSİ

Bu surədəki ۱۵-ci sual ilzami sual, yəni cavabı hər aqil şəxsin yanında Allah Taalanın sözünü təsdiq etməkdən ibarətdir. Birinci ayədən axırıncı ayəyə qədər. Amma bu bədbəxt və ürəkləri qəsavət bağlamış camaat bu Allahın kəlamını qəbul etmək .istəmədilər. Hədisdə var ki, Qiyamətdə Əbu Cəhl bir quyuda olacaqdır

Peyğəmbəri Əkrəmin gəlişinin xəbərini ona verəndə, deyəcək ki, mənim üstümə bir daş salın ki, gözüm onu görməsin. Deyirlər, Peyğəmbər şəfaət etmək istəyəcək, Əbu Cəhl cavab verəcək ki, istəmirəm. Müşriklərin Peyğəmbərlə o qədər inadlı kinləri var idi ki, əvvəllər Peyğəmbərə deyirdilər ki, əgər düz deyirsənsə, elə et ki, asimandan bir daş :parçası düşsün və bizi həlak etsin. Allah buyurur

Əgər asimandan bir daş parçasının gəldiyini görsəydilər, deyəcəkdilər ki, buludlar" ".sıxlaşıb bu hala düşmüşdür

Səhifeyi-Səccadiyyənin şərhində nəql olunub ki, bir nəfərə ölüm ölüm ayağında" "Ədilə" duası oxuyurdular. O isə dua oxumaq yerinə "indi hava soyuqdur və istilik getmişdir" və s. kimi səfeh sözlər deyirdi və bu sözlərlə dünyadan getdi. Xülasə, zahiri səbəblərə diqqət yetirmək olmaz. Bu xəstəliklər ölüm əlamətləridir. İnsan öz fikrini bir .yerə yığıb cəm etməlidir

Haqq olan mətləbi qəbul etməyən bir şəxsi öldürsən də, yenə də qəbul etməyəcəkdir. İnadkar uşağa hər nə etsəndə mədrəsəyə getməyəcək. Namazı tərk edən adama "namaz qıl" deyəndə, sanki "get o dağı kökündən qopart", deyirsən. Xülasə, bu ikiayaqlı heyvan o qədər inadkardır ki, heç kəsə tabe olmaq istəmir. Belə olan halda onu gərək öz halına boşlayasan. Vay olsun o xəstənin halına ki, həkim onu boşlaya. Peyğəmbər Allahın vəlisidir. Belə bir vəli camaatı boşlasa, görəsən onlar nə edər? Allah !buyurur: onları boşla

**QİYAMƏT SAİQƏSİ**

səh:۱۱۵

Yüs”əqunə” kəlməsinin mənasını iki cür təfsir etmişlər. ١-ci budur ki, Qiyamət“ gününün saiqəsi-zəlzələsi hər inadkar və boynuyoğunu kiçildib zəlil edər. Hər zərrə möhkəmləşər. Qiyamət, ilahi qəzəbin, qəhrin zühur yeridir. Çox vəhşətlidir. Od kürəsi kimi qızmar, hərarətlidir. Qiyamətin torpağı Möminin ayaqları altında sərin, kafirin ayaqları altında od yaradır. Qiyamətin torpağının şüuru vardır. Möminlə kafir arasında fərq qoyur. Necə ki, Nil çayından Bəni İsrail tayfası içəndə su idi. Amma, fironçular üçün qan. Bəzi vaxtlar fir”onçular Bəni İsrailin yanına gəlib onlara su verməsini .istəyirdilər. Elə ki, su verirdilər, yenidən qana dönürdü

Rəvayətdə var ki, Qiyamət torpağının hərarəti nəticəsində insanların beyni yanar. Başlarının üstündəki ulduzlar bir-birinə qarışar... Qiyamətin səhnəsi, qəribə bir .səhnədir. Qəlblər qorxunun şiddətindən boğazlara gəlib çıxar və boğazlar tutular

Deyirlər, bir nəfər Sultan Mahmud Qəznəvini yuxuda görür və ona deyir: Sən ki, dünyada yaxşı kişi idin. De görüm Allah səninlə necə rəftar etdi? O cavabında dedi: Məni yer üzündə olan ləqəb və ünvanlarla çağırma. Çünki. bu ləqəblər və ünvanlar burada mənasızdır. Mən elə güman edirdim ki, sultanam. (Necə ki, bəzi adamlara rəis, sədr, başçı hacı, məşhədi, şeyxül-islam və s. deyirlər.) Qiyamət günü Allah buyurar: Mən bir nisbət qərar verdim, siz də başqa bir nisbət qərar verdiniz. Siz mənim :nisbətimi kənara qoyub özünüz üçün nisbətlər düzəltdiniz. Mən dedim ki

Allah yanında ən əziz şəxs-ən təqvalı şəxsdir. Və kimdir bu göstərişə əməl edən. Məqsəd Qiyamətdir. İnadkarlar zəlil və başıaşağı olarlar. Quran aşkar şəkildə buyurur :ki

”.Əgər o vaxt günahkarları görsən, öz Allahlarının yanında başları aşağıdır“

.Bu qədər söz-söhbətlər hamısı sırf sükuta çevrilər

”.Səslər zəifləşər Allah üçün, həm-həmədən başqa bir şey eşitməzsən“

”.Pərvərdigarın izni olmadan heç kəsin danışmağa cür”əti olmaz“

Biharul-ənvar” kitabında Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləmin“ sərgüzəştlərindən rəvayət olunmuşdur ki, hər vaxt güclü qırmızı və sarı küləklər

Soruşurdular ki, bu nə haldır səndə baş verir. Buyurardı: Qorxuram ki, Allah tərəfindən .bəla nazil olsun

## ÜÇ TAYFA BAŞQALARINA SIĞINACAQDIRLAR

Üç tayfa vardır ki, onların vasitəsi ilə Allah bəlanın qabağını alar. Biri, ٧٠-٨٠ il "ya Allah!" deyib Allaha ibadət edən ahıl qocaman kişilər. Xüsusilə, əgər ٩٠ yaşına çatsalar. Xəbərlərdə var ki, nida yetişər "Ey torpaqda əsir olan bir şəxs, səni bağışladıq." Bu cür fərdlərin vücudları, hər şəhərdə, kənddə, hər məhəllədə olsa, ora üçün ne"mət və bərəkətdir. İkincisi, öz şəhvətlərindən üz döndərib Allah qarşısında təslim olan cavanlar. Hansı ki, onların yaşıdları eyş-işrətə və s. şeylərə məşğuldurlar. Üçüncüsü .isə, südəmər uşaqlardır

## BƏDR" GÜNÜNDƏ ONLARIN MƏKRLƏRİ FAYDA VERMƏDİ"

Bu şərif ayə üçün başqa bir məna da "Bədr" müharibəsi ilə əlaqədardır. Yəni ey Peyğəmbər, indi ki, sən müşriklərin iman gətirmələrindən məyus oldun, onları öz hallarına burax, həlak olsunlar, onların məkrlərinin fayda vermədiyi bir gündə. Məqsəd "Bədr" müharibəsinin baş verdiyi gündür. Bu müharibədə müşriklərin müsəlmanlardan hər bir cəhətdən hazırlıqlı olmalarına baxmayaraq, ağır məğlubiyyətlərə uğradılar: onlardan yetmiş nəfərdən çoxu müsəlmanların əli ilə öldürülüb, başqa yetmiş nəfəri isə əsir düşdü. Allah-Taala beş min mələyi müsəlmanlara kömək üçün göndərdi. Daha yaxşı məna da Qiyamət gününə təfsir olunur ki, müşriklərin məkrlərinin heç bir faydası .olmayacaq

:Mərhum Şeyx Müfidin "İrşad" kitabında deyilir

Əmr ibni Mədi Kərəb ərəblər arasında igid cəngavərlərdən biri idi. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-in hüzuruna müşərrəf olanda, Həzrət buyurdu: Ey Əmr, İslamı qəbul et, Allah səni böyük günün əzabından amanda saxlasın! Əmr dedi: Ya Mühəmməd, böyük günün əzabı hansıdır? Mən elə bir kişiyəm ki, mənim heç nədən qorxum yoxdur. Həzrət buyurdu: Heç də sənin güman etdiyin kimi deyildir. Həqiqətən camaatın üstünə elə bir nə"rə çəkiləcək ki, heç kəs ölü halda qalmaz, hamısı dirilər. Sonra sıralara düzülərlər; asimanlar yarılar, dağlar yerindən silkələnər. Cəhənnəm

parçası ayrılıb dağlar kimi səpələnər. Sonra heç bir böyük ruhiyyəli insan tapılmaz ki, qəlbi yerindən oynamasın, günahlarını yad etməsin. Hardasan, nə fikirdəsən, ey Əmr? .Sonra Əmr dedi: Böyük bir məsələni eşidirəm

.Elə həmin vaxt özü və onun qəbiləsi iman gətirib İslam dinini qəbul etdilər

Həqiqətən özlərinə zülm edən, Allahı, Onun peyğəmbərini, Qiyamət gününü inkar“ edən şəxslər üçün deyilən axirət əzabından başqa bir əzab da vardır. Yəni axirət əzabından başqa bir əzab da onları gözləyir. Amma, onların əksəriyyəti bundan qafildirlər. Bu cümlədə işarə olunur ki, onlardan az bir qismi bu məsələni bilirdilər, ancaq öz elmlərinə əməl etmirdilər. Yəni, bilə-bilə, agahlıq üzündən öz küfrlərində israr edirdilər. Qiyamət əzabından əvvəldə olacaq əzab barəsində iki nəzəriyyə vardır: Birincisi, müşriklərin başına gələn “Bədr” müharibəsi kimi böyük bəla, əsir olunub qətlə yetirilmələri, ikincisi isə budur ki, həmin əzabdan məqsəd qəbir əzabı, qəbir sıxıntısı, bərzəx aləminin əzablarıdır ki, bunlar da Qiyamətdən əvvəl baş verir. Sonuncu məna bu məqam və bu məna ilə daha münasibdir. Çünki, onun məzmunu daha geniş olub Qiyamətə kimi olan bütün kafir və müşriklərə şamildir. Yəni bütün kafirlər və facirlər Qiyamət əzabından öncə, qəbir və bərzəx aləmində də əzaba düçar olacaqdır. Necə ki, :Fir”onun qövmü barəsində buyurulur

Fir”onçular qərq olandan sonra sübh və axşam (bərzəxdə) onlara od nazil olub onları“ ”.yandırırdı

Elə ki, Qiyamət başlanar əzab mələklərinə əmr olunar ki, fir”onçuları ən ağır əzablara daxil edin. Bu bərzəx əzabı təkcə kafirə deyil, günahkar, günah edib tövbəsiz ölən Möminlərə də şamildir. Bəzən elə olur ki, bərzəx əzabı səbəbi ilə Möminin günahı paklanır və günahsız halda məhşərə daxil olurlar. Bu mətləbin dəlili gəlib çatan çoxlu rəvayətlərdir. O cümlədən, “Kafi” kitabında nəql olunub ki, Əmr ibni Zeyd İmam Sadiq əleyhis-salama ərz edib dedi: Mən sizdən eşitmişəm ki, sizin şiələr nə qədər günah :etmiş olsalar da, behiştə gedəcəklər. Həzrət buyurdu

.Düz demişəm, and olsun Allaha ki, onların hamısı Cənnətə gedəcəklər

Əmr dedi: Canım sənə fəda olsun, günahlarımız həddindən çoxdur. Onların arasında .kəbirə günahlar da vardır

:İmam əleyhis-salam buyurdu

Amma Qiyamətə gəldikdə isə, onların hamısı Cənnətdədir. Rəsuli Əkrəm səlləllahu“ əleyhi və alihi və səlləm, yaxud onun vəsisinin şəfaəti vasitəsi ilə. Allaha and olsun ki, ”.mən sizin hamınız üçün bərzəx aləminin əzabından qorxuram

?Əmr dedi: Bəzrəx nədir

.Buyurdu: Qəbir aləmidir. ölüm anından başlayaraq Qiyamətə qədər davam edir

Bu hədisdən aydın olur ki, bu dünyadan imanla gedən Möminlər üçün şəfaət məsələsi qəti olaraq Qiyamətdədir. ölümlə Qiyamət arasında olan bərzəx aləmi üçün qəti :deyildir. Məhz bu səbəbdən də Əmirəl-Möminin əleyhis-salam buyurur

”Tövbədən yaxşı qəbul olunan, nüfuzlu şəfaət yoxdur“

Çünki əgər insan öz günahlarından sidq-qəlbdən tövbə etsə, elə həmin vaxt paklanır, ilahi əzabdan xilas olur. Deməli bu ayə təkcə müşriklərə deyil, həm də zalım olan günah edən və tövbəsiz dünyadan gedən hər bir şəxsə bu əzaba aiddir. Bu mətləbin .şahidi “Biharül-ənvar” kitabında daha çox gözə dəyir

Həzrəti Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurdu: “Besətdən qabaq əmim Əbutalibin qoyunlarını otarırdım. Bəzən görürdüm ki, qoyunlar dayanır və otlamır. Peyğəmbərliyə seçiləndən sonra bu işin səbəbini Cəbrəildən soruşdum. Dedi ki, bu, meyyitə qəbirdə verilən əzabın səsidir. Elə ki, meyyitə qəbirdə əzab verilir, insan ”.və cinlərdən başqa bütün mövcudat onun nalə səslərini eşidir

Bir nəfər Salmanın hüzuruna gəlib dedi: Mənə hədis de! Salman üzünü döndərdi. O kişi yenidən qayıdıb gəldi və dedi: Salman, bildiklərini mənim üçün de! Yenidən Salman üzünü döndərdi. Üçüncü dəfə həmin şəxs “Bəqərə” surəsinin ۱۵۷-ci ayəsini Salman :üçün oxudu

Ayənin mənası budur ki, Allahın Quranda nazil etdiyi ayələr və aydın dəlillərdən sonra

onları gizlədənlərə Allah və bütün lə”nət edənlər, lə”nət edir. (Sonra Salman buyurdu:) Əgər arxayın olduğum bir şəxs tapsaydım, onun üçün hədis deyərdim. Lakin Nəkir və Münkərin sualı

üçün Peyğəmbər barəsində səndən soruşanda şəkk etsən, yaxud şübhəyə düşsən, .atəş zərbələri ilə sənə elə vurarlar ki, külə dönərsən

## ƏLİ VƏ ƏLİ ÖVLADLARI İLƏ DOSTLUQ HƏR YERDƏ RAHATLIQDIR

Şiə və sünnülər arasında mö"təbər sayılan bir hədisdə Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm buyurdu: "Əgər bütün insanlar Əliyyibni Əbutalib əleyhis-salamın ".dostluğu barədə fikir birliyində olsaydılar, Allah Cəhənnəmi xəlq etməzdi

Məalimi zülfa" kitabında Həzrəti Sadiq əleyhis-salamdan rəvayət olunmuşdur ki," Həzrət buyurdu: "Günlərin birində cəddim Rəsuli Xuda oturmuşdu. Zənci bir qulamın cənazəsini dörd nəfər zənci aparırdı. Həzrət işarə etdi cənazəni gətirdilər. Elə ki, cənazəni gətirdilər, Həzrət onun üzünü açıb buyurdu: "Bu ribahdır. Həzrət Əmirəl-Möminin onu görən kimi ərz etdi: Hər vaxt bu qulam məni görsəydi, şad olardı və ".deyərdi, mən səni sevirəm. Çox istəyirəm

Rəsuli Əkrəm bunu eşidən kimi ayağa qalxdı və əmr etdi ki, ona qüsl versinlər. öz paltarlarından onu kəfənə bükdü və onun cənazəsinin dəfn olunması üçün hamı gəldi. Asimandan qəribə səs eşidildi. Həzrət buyurdu: "Bu məlaikələrin nazil olmasının səsidir. ".Hər qəbildə yetmiş min mələk vardır. Hamısı bu qulamı dəfn etmək üçün gəlmişlər

Sonra Həzrətin özü qəbrə girdi, qulamın üstünə torpaq tökdü və ləhəd daşlarını qoyanda azacıq dayandı üzünü qəbirdən çevirdi, sonra kərpicləri ora düzdü. Qəbri doldurandan sonra ondan soruşdular ki, nə üçün arada dayandın? O buyurdu: Çünki, bu Allah dostu öləndə susuz idi. Hurilər onun üçün Cənnət şərabı gətirdilər. Allahın dostu qeyrətli olduğuna görə istəmədim ki, onun zövcəsinə nəzər edim. Ona görə də üzümü döndərdim. Sonra buyurdu: Ya Əli! Bu şəxsin bu məqama çatması, Sənə .məhəbbətdəndir

## İNKAR ETDİYİNİ DADDI

Biharul-ənvar"ın ٣-cü cildində "Kafi" kitabında nəqlən yazmışlar ki, Həzrət Əliyyibnil" Hüseyn əleyhis-salam buyurdu: Bilmirəm camaata necə hədis deyim; O şeyləri ki, Peyğəmbərdən eşitmişəm, Onları deyəndə gülürlər, deməyəndə də höccət .tamamlanmamış olur

!Zümrə ibni Məbəd dedi: Mənim üçün Rəsulullahdan hədis de

İmam əleyhis-salam buyurdu: Bilirsənmi ki, Allah düşməninin cənazəsini qəbrə sarı aparanda nə deyir? Cavab verdi ki, bilmirəm. İmam buyurdu: Cənazəni aparanlara deyir ki, mən sizə şikayət edirəm məni aldadan düşmənimdən ki, məni fəlakət vadisinə atdı. Və mənim dadıma çatmadı; mən şikayət edirəm sizə, məni tək qoyub gedən dost və rifqlərimdən; mən sizə şikayət edirəm, öz malımla, zəhmət və xərcimlə düzəltdiyim evdən ki, hal-hazırda başqası onu tutubdur. Mənimlə mehribançılıq edin, məni qəbrə tərəf aparmaqda tələsməyin." Zəmrə dedi: Əgər meyyit belə sözləri deyirsə, az qalar ki, cənazəni aparanların çiynindən yerə düşüb qaçsın. İmam əleyhis-salam buyurdu: İlahi, əgər Zəmrə Rəsuli Əkrəmin hədisini məsxərəyə qoyursa, onu ağır əzabla tut. Qırx gün o bədbəxt diri qaldı və sonra öldü. İmamın dostlarından biri onun dəfnində iştirak etdi. Sonra Həzrətin hüzuruna gəldi. Həzrət buyurdu: Harada idin? Dedi: Zəmrənin cənazəsini dəfn edirdim. Elə ki, onu qəbrə qoydum. özüm də qəbrə girdim. :Allaha and olsun ki, bir nida eşitdim ki, deyirdi

Vay olsun sənə ey Zəmrə! Bu gün dostların səni boşlamış. Sənin əbədi yerin" Cəhənnəmdir." İmam əleyhis-salam buyurdu: Allahdan afiyət və salamatlıq arzu edirəm. Rəsuli Əkrəmin hədisini məsxərəyə qoyan şəxsin cəzası bundan artıq ola .bilməz

## BƏRZƏX BARƏSİNDƏ ŞÜBHƏLƏR

Bərzəx aləmi barəsində dinsizlər şübhə yaratmışlar. Bu şübhələr bu günlərdə də eşidilməkdədir. Amma bu məsələnin əsli Peyğəmbər dövrünə gedib çatır. Nəkir və Münkərin sualı barəsində deyirlər ki, əgər meyyitin ağzına bir şey qoysaq və sonradan həmin qəbri açsaq, həmin şeyi meyyitin ağzında görərik. Əgər ölüdən sual etmiş olsalar ki, onun ağzı tərpənməli, o şey onun ağzından yerə düşməlidir. Yaxud, misal üçün, deyirlər ki, qəbirdən qalxıb oturmasının əsər-əlamətini ölüdə görmürük. Bu cür ...nümunələr və s

Yaxud deyirlər ki, bəşər dəfn olunduqdan sonra torpağın altında çürüyüb aradan gedir. Bəs, Bərzəx aləmi Qiyamətə qədər olan xəbərlər hansıdır? Digər tərəfdən inkar olunmaz xəbərlərdə deyilir: Qəbirdə Möminə deyilir ki, nəzər et yetmiş zira boyunda.

yetmiş illik yol boyunda Bərzəx aləmi onun üçün genişlənir. Qurani Məcidin aşkar ayələri də Bərzəx aləminə dair bəzi xəbərlər vermişdir ki, bu şübhələrlə birlikdə nə etməliyik? Cavab budur ki, əgər insan rəvayət və xəbərlərin istilahları ilə tanış olsa, bu məsələ onun üçün həll olacaqdır. Həzrət Sadiq əleyhis-salam Bərzəx aləminin əzabını bəyan edərək buyuranda Ravi soruşdu ki, Bərzəx hansıdır? Buyurur: ölüm anından başlayaraq Qiyamətə qədərdir ki, qəbir çuxuru Bərzəx aləmi və onun ruhunun .mənzillərindən biridir. Nəinki bədənin çürüməsi ilə Bərzəx aləmi tamam olur

Mərhum Məclisi (r.ə) buyurur: Qəbrin adı zikr olunan xəbər və rəvayətlərdə məqsəd cismani qəbir deyil, Bərzəx aləmidir. Əgər, rəvayətlərdə "Allah Möminlərin qəbirlərini genişləndirir" deyilirsə, məqsəd ruhani Bərzəx aləmidir. Cismani qəbrin işıqlı, nurani və :ya zülmət olması deyil. Kaş cismani olaydı

".Ağlayıram öz əməllərimin qaranlıq olması üçün"

Bir nəfər məsumların birindən dara asılmış adamın qəbir sıxıntısı barəsində soruşur ki, :bu insan uzun illər dar ağacında asılı qalmışdı. Cavabda buyurulur

Yerin sahibi havaya da sahibdir və Allah əmr edir ki, hava onu sıxsın. Və bu sıxma qəbir .(sıxıntısından da daha şiddətlidir (əgər bir kəs, qəbir sıxıntısına layiq olarsa

Mühəqqiqlərdən biri buyurur ki, əgər bir şəxs Allaha, Onun Peyğəmbərinə və vəhyə .iman gətirsə bu mətləbin qəbul olunması onun üçün daha asan olar

## YUXU–BƏRZƏX ALƏMİNİN KİÇİK NÜMUNƏSİ

Bərzəx aləminin nümunəsi bu dünyada yuxu görməkdir. İnsan yuxuda çoxlu qəribəlikləri müşahidə edir. Bəzən yuxuda görür ki, bir od çalasında yanır. Fəryad edir, "məni qurtarın!", deyə qışqırır. Oyandıqdan sonra ətrafındakılara deyir ki, mənim səsimi eşitmədinizmi? Deyirlər ki, yox. Halbuki onun özü təsəvvür edirdi ki, boğazı fəryad etmək nəticəsində az qalır ki, deşilsin. Yaxud, yuxuda görür ki, zəncirə çəkilmişdir və zəncirin göstərdiyi təzyiq nəticəsində boğulmaq ərəfəsindədir. Nə qədər fəryad edirsə bir kəs onun dadına çatmır. İndi Allah daha yaxşı bilir ki, ölülər necə də fəryad çəkirlər

amma biz eşitmirik. Bəli, ora başqa bir yerdir. Bəzi vaxtlar batini işlər zahirə də sirayət edir. "Kafi" kitabında Həzrət Cəfər ibni Mühəmməd Sadiq əleyhis-salamdan belə rəvayət edilib: Yuxu görmək xilqətin əvvəllərində yox idi. Peyğəmbərlərin birinin zəmanəsində Qiyamət barəsində söhbət etdi, camaat isə suallar verirdilər. Məsələn, ölü necə dirilə bilər? Həmin gecə yatdıqda müxtəlif yuxular gördülər. Sabahkı gün isə həmin yuxuları bir-birinə nəql etdilər. Həmçinin, həmin peyğəmbərə də dedilər. Peyğəmbər buyurdu: Allahın höccəti sizin üçün tamam oldu. Çünki, yuxuda .gördükləriniz öldükdən sonra görməli olacaqlarınızın kiçik bir nümunəsidir

Bəzən batini işlər zahirdə də təsir qoyur. Bizə deyiləndə ki, qəbirstanın ziyarətinə gedin, "Fatihə" oxuyun, belə bir sual yarana bilər ki, ölünün ruhu bu nöqtədə deyil, əksinə, Allah bilir ki, onun ruhu haradadır. Amma onun cəsədi bu yerdə dəfn olunduğuna görə həmin məkanla əlaqəsi vardır. Rəvayətdə qeyd olunur ki, Möminin ruhu "Vadiyüs-səlam"da, Həzrət Əli əleyhis-salamın qonşuluğunda, kafirin ruhu isə ."Bərəhut" səhrasındadır

ölümdən sonra bədən bərzəxi bir bədəndir; dünyadakı bədən kimi maddiyyatla əlaqəli olan çirkin bədən deyil, kölgəsi yoxdur. O qədər lətifdir ki, ruhlardan bəziləri (əgər, .məhbus olmazsa) bütün aləmə əhatə tapa bilərlər

Mərhum Şeyx Mahmud Əraqi "Darüs-səlam" kitabının axırında nəql edir ki, Əl cəlil, böyük arif olan Seyyid Məhəmməd Əli Əraqi (onun adı Həzrəti İmam Zaman əleyhis-salamı görənlər sırasında qeyd olunub) buyurur: Uşaqlıq çağlarında öz əsl vətənimdə (İraqın kəndlərindən biri olan Kərimrub kəndi) idim. Adını və nəsəbini tanıdığım bir şəxs vəfat etdi. Onu gətirib bizim evlə üzbəüz olan məqbərədə dəfn etdilər. ۴۰ gün müddətinə qədər hər vaxt məğrib olanda onun qəbrindən qalxan atəşin, alovun əlamətləri görünürdü. Bu qəbirdən can yandıran nalə və ahu-fəğan eşidirdim. Gecənin əvvəllərində o qədər ahu-nalə şiddətlənirdi ki, mən qorxub, təlaş hissi keçirirdim. öz-özümə əsməyə başlayırdım. Huşdan getmə adəti məndə baş vermişdi. Qohumlarım bu məsələdən agah olub məni götürüb öz evlərinə apardılar. Bir müddətdən sonra özümə .gəlib o meyyiti görməklə məndə yaranan bu halətdən təəccübdə qaldım

Çünki, onun həyatının haləti ona köməyi yox idi. Sonradan məlum oldu ki, o kişi, bir müddət hökumət divanxanasında qazi işləyirmiş. Bir seyyiddən ağır məbləğdə vergi istəyib və o seyyid o məbləği verə bilməyib. Bu şəxs o seyyidi həbs etdirmiş və bir .müddət zindanın tavanından asılı halda saxlamışdı

Kitabın müəllifi mərhum Əraqi deyir: Mən o ölən şəxsi görmüşdüm, ancaq rüsvay olmasın deyə, adını nəsəbini demirəm. (Sonra deyir:) Bu seyyid nəql edir ki, Tehranın ətraf məntəqələrindən birində yerləşən İmamzadə Həsən əleyhis-salamın ziyarətinə getdik. Yoldaşlardan biri qəbrin yanında zikr deməyə, ziyarət etməyə məşğul idi. Gün batan çağı gözlənilmədən o qəbirdən şiddətli hərarət qalxmağa başladı. Sanki onun daxilində dəmir əridilən sobalar qızdırılmışdı. O qəbrin ətrafında yaşamaq mümkün deyildi. Oradakı camaat da bu hadisəni müşahidə edirdilər. Elə ki, qəbrin daşını oxuyanda gördüm ki, bir qadının adı yazılıb. Mətləbin qısası budur ki, bəzi vaxtlarda əzabın şiddətindən ruh bərzəx aləmində həmin cəsədə də təsir qoyur. Məsələn, Yəzid ibni Müaviyənin (Allah ona lə"nət etsin) misal göstərmək olar. Belə ki, Bəni Abbas dövründə Bəni Üməyyədən olanların qəbirlərini açır, cəsədlərini yandırırdılar. Yezidin qəbrini açanda, cəsədin yanıb külə dönməsini göstərən nazik bir xətdən başqa bir şey tapmadılar. Bu mətləbin şahidləri olduqca çoxdur, qeyd olunanlarla kifayətlənirik. Belə ki, ruh bərzəx aləmində sevincdə, yüksək əhval-ruhiyyədədirsə, onun cəsədi də həyatın müəyyən mərhələsindən bəhrələnir. Bəlkə də bu mətləb də çoxdur. Baş .vermiş bir neçə halı qeyd etməklə kifayətlənirik

Səfinətul-bihar" kitabının ٢-ci cildinin ٥۶٢-ci səhifəsində nəql olunur ki, Müaviyənin" zamanında o məl"unun köstərişi ilə "Ühüd" dağını kəhriz çəkmək üçün qazırdılar. Həzrət Həmzənin barmağına külüng dəyir və qan axmağa başlayır. Əmr ibni Cəmu və Əbdüllah ibni Əmr–hər ikisi "Ühüd" şəhidlərindən idi. Amma kəhrizin yolu üstündə olduqlarına görə pak cəsədləri çölə çıxmışdı. Halbuki tər-təzə idi. Bir qəbir qazıb onları yenidən orada dəfn edirlər. O böyük şəxsiyyətlərin dəfn olunduğu vaxtdan Müaviyənin .hakimiyyətə gəldiyi vaxta qədər ۴٠ il keçmişdi

Rovzatul-cənnat" kitabında nəql olunub ki, Bağdad hakimlərindən bəzisi camaaatın" Həzrəti Musəbni Cə"fər əleyhis-salamın qəbrini çox

ziyarət etdiyini görəndə, şərif qəbri dağıtmaq qərarına gəldilər. Dedilər ki, gəlin qəbri açaq. Əgər cəsəd təzə olsa, ziyarətinə icazə verərik; yox əgər təzə olmasa, icazə vermərik. Onlardan biri dedi ki, şiələrin öz alimləri barəsində olan əqidələri, elə həmin əqidədir. Yaxınlıqda, çayın kənarında şiələrin böyük alimlərindən biri olan Məhəmməd ibni Kuleyninin qəbri yerləşir. Şiələrin əqidələrinin doğruluğunu bilmək üçün yaxşı olar ki, əvvəlcə onun qəbrini açaq. Sonra mərhum Kuleyninin qəbrini açırlar və cəsədinin sanki təzəcə dəfn olunmuş kimi təzə-tər, çürüməmiş görürlər. Cəsədinin kənarında bir uşaq da dəfn edilmişdi. Deyəsən, onun övladlarından imiş. Bağdadın hakimi əmr edir ki, o böyük alimin qəbrini təmir edib üstündə böyük bir məqbərə düzəltsinlər. Bundan sonra həmin qəbir böyük ziyarətgah kimi məşhurlaşır. Həmin kitabda Şeyx Səduq Məhəmməd ibni Babəveyhin kəramətlərindən də qeyd olunub (O, Rey şəhərində, Həzrəti Əbdül-Əzim əleyhis-salamın qəbrinin yanında dəfn olunub). Bu kəramətlərdən bəzisi bizim zəmanəmizdə də zahir olmuşdur. Camaatdan çoxları bu hadisəni müşahidə etmişlər. Belə ki, o böyük alimin cəsədi dəfnindən min il keçməsinə baxmayaaq, çürüməmiş, sağlam qalmışdı. Məsələ belə olmuşdu: Güclü sel nəticəsində qəbir yarılmışdı. Onu təmir etmək istəyəndə, cəsədi, qoyulduğu sərdabədə salamat görürlər. Bu məsələ Tehranda ildırım sürətilə yayılır və dövrün şahı Fətəli Şaha çatır. Şah deyir ki, bu kəraməti yaxından görmək istəyirəm. öz vəzir-vəkillərindən və bir neçə alimlə birlikdə həmin yerə gəlirlər. Alimlər şahın oraya girməsini məsləhət görmürlər. Sonra şahın əmri ilə alimlər və vəzirlər sərdabəyə daxil olurlar. Cəsədi olduğu kimi görüb nəql edirlər. Şah əmr edir ki, o şərif qəbrin üstündə əzəmətli bir bina .düzəltsinlər. Bu bina hal-hazırda da böyük ziyarətgahlardan biridir

İbni Babəveyhin vəfat tarixi ۳۸۵-ci hicri qəməri ili, qəbrinin açılması hadisəsi isə ۱۳۳۸-ci hicri qəməri ilinə təsadüf edir. Deməli, onun vəfatından qəbrinin açılmasına qədərki .vaxt ۸۵۵ ildir

Qısa şəkildə demək olar ki, bərzəx aləminə etiqad insan ruhunun ölümdən Qiyamətə qədər bərzəx aləmindəki verdiyi xəbərlər ilahi vəhydir ki, Quranda və rəvayətlərdə Peyğəmbərdən mütəvatir şəkildə bizə gəlib çatmışdır. Qeyd olunduğu kimi, məlaikə, ,Qiyamət, Sirat, Cənnət, Cəhənnəm, Mizan və s. kimi məsələlərə iman gətirmək kimi

bunların hamısı qeyb aləminə imandır. Və bunun da səbəbi ilahi vəhylərdir. Burada belə məsələlərin baş verməsinin çox qəribə olmasını, bərzəx aləminin münkirlərin yaratdığı şübhələrə cavab verilməsi, ruhların necə savabda, yaxud əzabda olmaları barədəki şübhələrin cavablarından biri, yaxşı və pis yuxulardır. Yuxuda insan səs-küy, həyəcanlı səhnələri görür, ancaq onun yanında olanlar eşitmir. Bəzən yuxu aləmində ölmüş insanları yaxşı və xoşhal halda; yaxud pis və ağır vəziyyətdə görürük. Yuxunu görən o yuxunu işin həqiqətindən, vaqe olmasından bir xəbər kimi hesab etməməlidir. Çünki, yuxulardan çoxu, insanın vəhm qüvvəsinin yaratdığı şeylərdir. Onlardan çoxu mürəkkəb olub təbirə ehtiyacı var. Amma onlardan bəziləri sadiq yuxular olub həqiqətdən söz açırlar. Bilmək lazımdır ki, sadiq yuxularda da əgər bir kəs ölən bir şəxsi yaxşı halda görsə, onun həmişə bu halda olmasını hökm etmək olmaz. Çünki, ehtimal verilir ki, ölən insan həmin halda itaət və xeyir əməl etdiyi saatlar müqabilində müəyyən ne"mətlərdən bəhrələnir, başqa saatlarda isə, layiqsiz, yaramaz və pis əməllərinin saatlarında isə ruhi əzablara mübtəla olur. Bunun əksi də mümkündür: əgər meyyiti pis halda, xəstəlik halında görsələr, bu onun həmişə belə halda olmasına dəlalət etmir. Çünki, bu, onun etdiyi günahlar müqabilində olan saatı ola bilər və .sonradan yaxşı işlərinin müqabilində yaxşı ne"mətlərdən bəhrələnə bilər

Bütün bunları qeyd etməkdə məqsədimiz budur ki, əgər bir kəs ölmüş bir şəxsi yuxuda pis halda görsə, heç də məyus olmasın və ehtimal versin ki, sonradan o, yaxşı halda olacaqdır. Onun barəsində dua etmək, onun əvəzindən sədəqə vermək, saleh əməllər görməklə ona nicat versin. Əgər meyyiti yaxşı halda görsə, həmişə bu halda olmasına yəqin etməsin və deməsin ki, daha diri şəxslərin onun dadına yetişməsinə ehtiyac yoxdur. Sözün uzadılmasında məqsədimizdən biri də budur ki, biz öləndən sonra bərzəx aləmində olan xəbərlər çox az adamlara aşkar olur. Fərzən əgər məlum da olsa, haradan bizim üçün ürəyi yananlıq etməsi məlum olar? Deməli, yaxşı olar ki, nə qədər ki, diriyik, özümüzün fikrində olaq. Yəni, öz keçmiş əməllərimizi dəqiq şəkildə araşdıraq; əgər hər hansı vacib bir əməli fövtə vermiş olsaq, yerinə yetirək, ,günahlarımızdan tövbə edək

bacardığımız qədər saleh, yaxşı əməlləri görməyə çalışaq. Xüsusilə, müstəhəb və .vacib ehsanlar etməklə axirət səfərinə tədarük görək

## ÖLÜM ƏLAQƏLƏRİ KƏSİR

Diqqət yetirilməli mühüm məsələlərdən biri də budur ki, bərzəx aləminin çətinliklərindən bir qismi dünyada əlaqə bağladığı şeylərdən ayrılıq nəticəsində fəraq oduna yanmaqdır. Yəni əgər hər hansı bir şəxs bir şeyə əlaqə və məhəbbət bağlasa, ondan ayırlanda nə qədər zəhmətə düşür. Məsələn, əgər kişinin gözəl bir arvadı olsa, öləndən sonra (bu dünyada sağ qalan arvadı üçün) nə qədər təəssüflənir. Bəzən bu cür hadisələr camaatdan bəzilərinin hətta dəli olmasına gətirib çıxarır. Bizim qohumlardan birinin (Allah ona rəhmət eləsin) ٢٠ yaşlı övladı ağır xəstəliyə tutulub can vermə halına düşdü. Oğlunu bu halda görən ata dəstəmaz alıb sidq-qəlbdən dedi: "İlahi, əgər oğlumu almaq istəyirsənsə, əvvəlcə məni apar." Onun duası qəbul oldu: ata .öldü, oğul isə diri qaldı

## ÖLÜMÜN MƏNASI

ölüm nə deməkdir? ölüm–yəni, fəraq, hicran, ayrılıq. Bəzilərini görürsən ki, arvad-uşağının, ailəsinin, sərvətinin fərağında yanır. Bu özü bərzəx aləminin ruhi əzablarından biridir ki, onun nümunəsi bu dünyada da mövcuddur. Amma bu dünyada insanlar özlərini tiryək, nə"şə, siqaret, qəzet oxumaq və s. ilə başını qatır, amma bərzəx aləmində bu cür baş qatmalar mövcud deyil. Məqsəd budur ki, insan bütün .əlaqələrini bu dünya ilə kəsməlidir. Təki, bərzəxdə onların hicranında yanmasın

Qeys ibni Asim Bəni Təmim qəbiləsindən olan bir dəstə ilə Mədinəyə, Həzrət Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm-in hüzuruna getdi. Həzrətin hüzuruna çatanda, ondan hərtərəfli xeyri olan bir möv"izə istədilər. (Qeys islamdan qabaq böyük alimlərdən və həkimlərdən sayılırdı.) Həzrət buyurdu: Hər izzətin müqabilində bir zillət vardır. Həyatdan sonra ölüm var, hər əməlin əcri, əvəzi var. Bu kəlamın mənası budur ki, baxma ki, bu halda ürəyin istədiyi işləri görürsən, amma bütün işlərin hesab-kitabı .vardır

Bərzəx aləmində insanın köməyi olan şey, onunla birlikdə olan və onu amanda saxlayan saleh, gözəl əməllərdir. Əgər əməl pis olsa, sahibinin dadına çatmır, onu tək buraxır. Həzrət Əli əleyhis-salam buyurur: "ölüm halında olan bir şəxs üzünü öz malına tutub deyir ki, mən səni əldə etmək üçün çoxlu zəhmətlərə, əzab-əziyyətlərə qatlaşmışam. Mal-dövləti cavabında deyir: Bir kəfəndən başqa məndən heç nə götürə bilməzsən. Üzünü övladlarına tutub deyir, onlar da cavab verirlər ki, biz səninlə yalnız qəbrin başına qədər gələcəyik. Əməlinə üz tutub deyəndə, əməl deyir: "Mən həmişə ".səninləyəm

"Ey Peyğəmbər öz Rəbbinin hökmünə səbr et! Həqiqətən sən, Bizim nəzərimizdəsən"

Burada hökmdən məqsəd, müşriklərə möhlət verilməsi, Peyğəmbərin onları islama də"vət etməsi, onların verdikləri əzab-əziyyətlərə dözməkdir. Allah "Müşriklərin əzab-əziyyətlərinə döz" demədi, əksinə buyurdu ki, Bizim hökmümüzə səbr et. Halbuki, bunların hər ikisinin nəticəsi birdir. Səbrin Həzrətə asan olması üçün belə buyurdu. Çünki, Həzrət Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm Allahın müt"i və mütləq bəndəsi, Onu sidq ürəklə sevəndir. Məbudu ona "Bizim hökmümüz müqabilində səbr et" deyə əmr edəndə, yəni "Mən belə hökm etdim ki, müşriklərə möhlət verib onlara əzab verməyəm. Sən də öz də"vətindən əl çəkmə, əzab-əziyyətə sinə gər. Belə olanda səbr etmək Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-ə asan olur. Xüsusilə də "ə"yünina" kəlməsi ilə. Sözün qısası budur ki, Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm on üç il müddətində Allah üçün Məkkədə qalmalı, əzab-əziyyət görməli, cəfa .çəkməlidir ki, "Bədr" müharibəsində onlardan intiqam alsın

Çünki, möhlət vermədən təkzib edənlərə əzab verilməsi qərara alınsa və həlak olsalar Allahın də"vəti nəticəsiz qalacaqdır. Üstəlik bir müddət verilməlidir ki, onlardan bəziləri iman gətirsin, küfrlərində israr edənlər üçün isə höccət tamam olsun. İlahi qanun bütün peyğəmbərlərin barəsində bu cür olmuşdur. Hətta bütün günahkarlar barəsində .də bu cür olmuşdur ki, onlara möhlət verilsin

Rəvayətdə var ki, Həzrəti Musa əleyhis-salam Fir”on barəsində lə”nət və qarğış etdi firon”çuların həlak olması qırx il çəkdi. Möhləti Allah verir, amma bu möhlətdən özlərini .islah etmək üçün çox az insanlar istifadə edir

## SƏBRLƏ İMANIN ƏLAQƏSİ BAŞLA BƏDƏNİN ƏLAQƏSİ KİMİDİR

:Səbr çox mühüm bir məsələdir. Həzrət Sadiq əleyhis-salam buyurur

Səbrlə imanın münasibəti, başla bədənin münasibəti kimidir.” Əgər başı bədəndən“ ayırsalar, bədən cansız cəsəddən başqa bir şey deyildir. İmam əleyhis-salam buyurur: “Dinin başı səbrdir.” Səbr nəfsi həbs etmək, həvayi-nəfsin qarşısını almaq, onu şəriət və əqlin tələbinə uyğun olaraq əməl etməsinə vadar etməkdir. Məsələn, səbrin bir növü baş verən müsibətlərdə səbr etməkdir. Əgər bir şəxsin əzizi əlindən getsə, gərək .səbr etsin

Bir nəfərin oğlu ölmüşdü, çox ahü-fəğan edirdi. Həzrət Riza əleyhis-salam ona bir məktubda yazdı: “Sənin oğlunun ölümündə səbirsizlik etməyinin səbəbi budur ki, özün axirət səfərinə getməyi fikrinə gətirmirsən. Sənin ahü-nalə etməyin, axirət səfəri üçün ”.bir şey tədarük görməməyin, oğlunun ölümündəki müsibətdən daha böyükdür

Sümaət ibni Mehran Mədinədə Həzrət İmam Musəbni Cə”fər əleyhis-salamın hüzuruna gəldi. Həzrət buyurdu: “Nə oldu ki, həccə getmədin? Əzr etdi ki, mal-dövlətim əlimdən getmiş, borclarım həddindən ziyadə çoxalmışdır. Əgər dostlarım mənim zəhmətimi çəkməsəydilər, bu səfərə gələ bilməzdim. Həzrət buyurdu: Səbr et ki, qurtuluş hasil olsun. Əgər səbr etməsən, Allah tərəfindən müqəddər olunan şeylər (”baş verəcəkdir. (“Üsuli-kafi

## HARAM İŞLƏRİ TƏRK ETMƏKDƏKİ SƏBR

Səbrin bir növü də haram işləri tərk etməkdə olan səbrdir. Məsələn, cavan insanda şəhvət qüvvəsi çox güclüdür, amma bununla belə, heç bir maneə olmadan əcnəbi qadınla rastlaşdıqda ona baxmır. Yaxud fəqir bir şəxs, camaatın onun yanında əmanət qoyduğu şeylərə xəyanət etmir. Qısası budur ki, insan öz inadkar, tüğyançı nəfsinin

.qarşısını alır ki, harama düşməsin. Bu səbrə “haram işi tərk etməkdə səbir” deyilir

Böyük şəxsiyyətlərdən, imanlı bir şəxsin həyatında yazıblar ki, günlərin birində küçədən keçəndə bir nəfər damın üstündən onun başına kül tökür. Həmin şəxs dedi: “Şükür olsun Allaha! Mən günahkar bir şəxsəm. Layiq idi ki, mənim başıma daş düşsün. ”.Allaha şükr olsun ki, başıma daş deyil, kül tökdülər

Məqsəd budur ki, o Mömin kişi bu işin müqabilində səbr edib əsəbiləşmədi və nalayiq .sözlər danışmadı

:Əbu Bəsir İmam Cə”fər Sadiq əleyhis-salamdan belə nəql edir

Həzrət buyururdu: Doğrudan da azad insan hər bir halda azaddır. Əgər onun üçün bir çətinlik baş versə, onun müqabilində səbr edəcək. Əgər ona müsibət üz versə, hətta əsir olsa və ya zahirdə məğlub olsa da, ağır təzyiqlərə məruz qalsa da. Necə ki, Yusif əleyhis-salam belə oldu: onu özlərinə qul etdilər, əsir etdilər, amma öz azadlığını əldən vermədi. Quyuya atıldığı zaman quyunun vəhşəti, qaranlığı ona heç bir ziyan çatdırmadı, nəhayət Allah ona minnət qoyub zülmkar və inadkar padşahı ona qul etdi. Həzrət Yusif əleyhis-salam onun maliki olandan sonra Allah onu öz Rəsulu etdi. Onun vasitəsilə bir ümmətə rəhm etdi. Həmçinin, səbrin ardınca çoxlu xeyirlər də gəlir. Siz də .səbr edin, savab qazanın

İmam Sadiq əleyhis-salamın buyurduqlarının şərhi bundan ibarətdir ki, azad insan (yəni, nəfsdən, nəfsani ehtirasların tələbindən azad olmaq, cismani ləzzətlərin əsiri olmamaq) o şəxsdir ki, nəfsi və şeytan onu təfritə və ifrata vadar edə bilməsin. Əllamə Məclisi (r.ə) bu hədisin şərhində buyurur: İmamın buyurduğu “Yusifə ağalıq edən zülmkar malik onun qulu oldu” kəlamının mənası budur ki, həmin padşah Həzrət Yusif əleyhis-salama müt”i, onun əmrlərinə tabe oldu. Sonra Sə”ləbədən və s. şəxslərdən nəql edir ki, Misirin məliki, padşahının adı Rəyyan ibni Vəlid idi. Yusif əleyhis-salamı pulla alan şəxs Misirin əzizi və onun vəziri idi. Adı da Qətfir idi. Həzrəti Yusif əleyhis-salam padşahın yuxusunu yozandan sonra Qətfiri vəzirlikdən çıxardıb, Həzrəti Yusifi onun yerinə təyin edərək Misir hökumətini ona verdi, xilafət tacını onun başına qoydu. Sonra padşahlıq taxtına keçirtdi. öz üzüyünü ona verdi. Qətfir də həmin vaxtlarda dünyadan getdi. Sonra padşah Züleyxanı Yusif peyğəmbərə ərə verdi. Bu

evlənmədən iki oğlan uşağı dünyaya gəldi. Birinin adı Fəraim, o birinin adı isə Mişa idi. Misirlilərin qəhətliyə düçar olduqları yeddi ildən birinci ilinin başlanğıcında Yusif əleyhis-salam taxılı samanı ilə birlikdə ehtiyat edərək anbara yığmışdı. Birinci il misirlilər gəldilər və nəqd pul ilə onları aldılar. Nəqd pulları qurtarandan sonra ikinci il öz lə"l-cəvahiratlarını, zinət əşyalarını gətirdilər. Əvəzində isə yeyinti məhsulları alırdılar. Elə ki, bəzək əşyaları da qurtardı, üçüncü ildə öz mal-heyvanlarını gətirib verir, əvəzində isə çörək alırdılar. Bunlar da qurtardıqdan sonra dördüncü ildə öz qulamlarını və kənizlərini verir, yemək alırdılar. Bunlar da qurtarandan sonra beşinci il evlərini, torpaqlarını və qalan mal-dövlətlərini verdilər, özləri üçün heç nə qalmadı. ۶-cı il övladlarını qul kimi onlara satdılar. Xülasə, yeddinci ildə özlərini qul kimi Yusifə pulla satdılar. Misir ölkəsində olan əhalinin hamısı bir nəfər kimi Yusif peyğəmbərin qulamı oldular. Sonra Həzrəti Yusif hamısını azad etdi, mal-dövlətlərini özlərinə qaytardı. Sonra aydın oldu ki, Allah Yusifi, onların Yusif peyğəmbəri öz mülkləri və qulam etdikləri işlər müqabilində bütün misirlilərin və onların mal-dövlətlərinin maliki qərar vermişdir. Səbrin səmərəsi budur. Allaha itaət və bəndəçiliyin səmərəsi budur. İmam əleyhis-salamın "Allah Yusifin səbri vasitəsilə bir ümmətə rəhm etdi" deməsində məqsəd budur ki, onu öz rəsulu seçib onları imana də"vət etdi. Sonra onları əbədi fəlakətdən xilas etdi. Həmçinin, o Həzrətin tədbirli işləri vasitəsilə (buğda və arpanı yeddi il müddətində qoruyub saxlaması kimi) misirlilərə qəhətlik bəlasından nicat verdi. :Nəql olunub ki, Züleyxa Yusif peyğəmbərin yanına çatanda dedi

Həmd olsun Allaha ki, bəndələri itaət səbəbi ilə padşah, padşahları isə günah və" məsiyət səbəbi ilə qul edir." Həmçinin, nəql olunur ki, Züleyxa o Həzrətlə yoldaş olmaq bərəkətinə, ibadət və ilahi mərifətlərinə görə öz dövranının qadınlarından fəzilətli oldu. Deməli, səbr öz ardınca çoxlu fəzilətlər, gözəl nəticələr, bərəkətlər və çoxlu savab gətirir. Qeyd olunanlar Allah-Taalanın bu ayədə öz peyğəmbərinə buyurduğu "müşriklərin sənə etdikləri əzab-əziyyətlər və müsibətlər qarşısında səbrli ol", .kəlamının mənasını başa düşməyə kifayət edər

Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-in səbri həqiqətən mö"cüzə idi. Allahın peyğəmbərə səbrli olmasını əmr etməsi

nəticəsində Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm səbr etdi. Onun səbri bir növ mö"cüzə idi. Müşriklər o Həzrətə qarşı olduqca çox əziyyətlər rəva görürdülər: başına kül tökürdülər, Məkkənin quldur başçıları ۱۰-۱۵ yaşında uşaqları vadar edirdilər ki, o Həzrəti məsxərə etsinlər. Əbu Talib və Xədicə əleyhis-salam vəfat edəndən sonra Peyğəmbərin əmisi olan Əbu Ləhəb (bütün düşmənlərdən çox düşmənçilik edirdi) müşriklərin köməyi ilə O Həzrətə o qədər əzab-əziyyət etdi ki, Həzrət məcbur olurdu ki, evdən çölə az-az çıxsın. Onların etdikləri əzab-əziyyətlər o yerə çatdı ki, Əbu Ləhəb özünün inadkarlığı ilə belə dedi ki, "Mühəmməd məndəndir!" və qohumluq qeyrəti cuşa .gəldi

## ÜMMÜ ƏQİL–SƏBRLİ QADINLAR NÜMUNƏSİ

Ümmu Əqil səhrada yaşayan bir qadın idi. Bir gün onlara bir neçə qonaq gəlirdi. Həmin vaxt oğlu Əqil və onun qoyunlarını, dəvələrini otaran çoban heyvanları otarmağa aparmışdılar. Çoban dəvələrlə birlikdə qayıdır. Qadına xəbər verir ki, dəvələr su içəndə bir-birinə hücum çəkdilər və Əqil quyuya düşüb öldü. Qadın çobana "qonaqlara xəbər vermə, bir qoyun kəs və qonaqlar üçün hazırla", dedi. Qonaqlar məsələni başa düşəndən sonra o qadının səbrindən təəccüb etdilər. Xörək yeyəndən sonra ona başsağlığı verdilər. Qadın dedi: Mən sizin bu məsələdən xəbərdar olmağınızı istəmirdim. İndi ki, belə oldu sizin aranızda Quran tilavət edə bilən bir şəxs varmı? Bir nəfər dedi: Mən bu işi edə bilərəm. Dedi, oxu! O şəxs də bu işlə əlaqədar olaraq "Bəqərə" surəsinin ۱۵۵-ci ayəsini oxudu

Qadın dedi, bəsdir. Sonra qalxıb bir neçə rəkət namaz qıldı və belə dua etdi: "İlahi Sən məni səbr etməyə əmr etmisən. Mən də səbr etdim. Sən də səbrlilərə verdiyin və"dəyə vəfa et! (Sonra dedi:) Əgər bu dünyada bir kəs başqası üçün qalsaydı Həzrəti ".Mühəmməd öz ümmməti üçün qalardı

Yəni, Peyğəmbərin öz ümmətinə qarşı bu qədər məhəbbətli olmasına baxmayaraq, .onların əlindən gedirsə, onda bir övladın ölümü mənim üçün asan olur

Əyyun" eyn kəlməsinin cəmidir. "Eyn" göz deməkdir. Allah cisim və cisimlikdən uzaq" olduğuna görə, gözün, qulağın və s. kimi

ə”zaların yaradanı olduğuna görə, görməlilərə və eşitməlilərə elm tapmaq üçün görmə və eşitmə orqanlarına ehtiyacı yoxdur. Biz insanlar və heyvanların məhz bu orqanlara ehtiyacı var. Allah da onu bizlərdə yaratmışdır. Deməli, göz kəlməsində məqsəd məcazi mənada olub qoruqçu, keşikçi deməkdir. Necə ki, ərəblər hər vaxt bir şəxs bir yerə gedəndə onun barəsində dua edib deyirdilər ki, “ə”yunullahi əleykə” yəni, Allahın amanında ol. Deməli, ayənin mənası belə olur ki, ey Mühəmməd, Allahın hökmünün müqabilində səbr et. Çünki, sən Bizim inayət nəzərimizdəsən. Bu ayənin incəliklərindən biri budur ki, Həzrəti Musa əleyhis-salam barəsində “eyn” kəlməsini tək halda işlətmişdir (və litəsnəə əla əyni) yəni mənim keşiçikliyim, nəzarətim altında. Amma Həzrəti Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm barəsində buyurur: Bizim gözətçilərimiz. Bu iki kəlmənin Həzrəti Musa və Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm barəsində müxtəlif cür işlədilməsinin müəyyən səbəbləri vardır. O cümlədən onların Allah tərəfindən qorunmasının çoxluğu və keyfiyyəti ilə əlaqədardır. Məsələn: .Musa əleyhis-salamın düşməni təkcə Fir”on idi ki, Həzrəti öldürmək istəyirdi

Allah da onu Fir”onun şərrindən hifz etdi, nəhayət Fir”onu məhv etdi. Fir”ondan başqa Musa Peyğəmbəri məhv etmək istəyən bir kəs yox idi. Amma Həzrət Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm dünyaya gəldiyi vaxtdan, dünyadan gedən vaxta qədər həmişə fir”onçular var idi ki, o Həzrəti məhv etmək qərarına gəlmişdilər. Bütün müşriklər, yəhudilər, məsihilər, daxildəki münafiqlər və düşmənlər, o cümlədən, təhlükələri o sair düşmənlərdən artıq olan münafiqlər hamılıqla o Həzrəti məhv etmək .qərarına gəlmişdilər. Allah, Peyğəmbəri onların şərrindən hifz etdi

Bu Həzrətin barəsində ilahi qoruq və keşiyin nə qədər olması barəsində ətraflı məlumat almaq üçün “Biharül-ənvar”ın altıncı, “Həyatul-qulub”un ikinci cildinə (hər ikisi .Əllamə Məclisinin kitabıdır) müraciət edə bilərsiniz

Doğrudan da Allah tərəfindən qorunduğu müxtəlif sahələr özü Allahın qəhr .mö”cüzəsidir ki, onu bəsirət əhli bilər

Həyatul-qülub” kitabında nəql olunur ki, Rəsuli Əkrəmin iştirak etdiyi müharibələr“ (qəzvələr) ۲۶ dənə idi. Hər birində o Həzrət üçün müxtəlif təhlükələr var idi. Əgər Allah tərəfindən hifz və qoruq

olmasaydı, o diri qalmazdı. O cümlədən, rəvayətdə gəlib ki, Peyğəmbər ərəblərdən bir qrupu ilə müharibəyə getmişdi. “Zi-əmr” adlanan yerdə düşmənlərin hamısı qaçıb dağların başına sığındılar. Həzrət bir yerdə mənzil salıb onları nəzarət altına aldı. Sonra qəzayi-hacət üçün öz ləşgərindən aralandı. Yağış yağdığına görə paltarları islandı, paltarlarını çıxarıb ağacın üzərinə sərdi və həmin ağacın altında uzandı. Ərəblər Peyğəmbəri görürdülər. Onların başçılarından Də”şur ibni Haris gəlib qılıncını siyirdi və Peyğəmbərin başının üstündə durub dedi: Səni mənim əlimdən qurtaran kimdir? Həzrət buyurdu: Allah. Sonra Cəbrail onun sinəsinə elə bir zərbə vurdu ki, qılıncı əlindən yerə düşdü. Peyğəmbər cəld ayağa qalxdı qılıncı götürdü və onun başının .üstündə dayanıb dedi: Kim səni mənim əlimdən qurtara bilər? Dedi: Heç kim

Həmin halda “la ilahə illəllah” deyib öz qəbiləsini də İslama də”vət etdi. Sonra öz tayfasına dedi ki, uzun qamətli ağ bir kişini gördüm ki, mənim sinəmə zərbə ilə vurdu .mən də yıxıldım, bildim ki, mələkdir

Həmçinin rəvayət olunub ki, Əbu Cəhl, Vəlid ibni Müğeyrə Bəni-məxzum qəbiləsindən olan bir dəstə ilə sözləşdilər ki, Peyğəmbər məscidə daxil olanda onu öldürsünlər. Həzrət məscidə gəlib namaz qılmağa başlayanda Vəlidi göndərdilər ki, onu qətlə yetirsin. Peyğəmbərin namaz qıldığı yerə çatanda Həzrətin səsini eşidib özünü isə görmürdü, sonra qayıtdı və vəziyyəti onlara danışdı. Onların heç biri inanmadı. Hamısı birlikdə gəlib o Həzrətin yaxınlığında durdular. O Həzrətin səsini eşidib amma özünü görmürdülər. Hara gedirdilərsə, Peyğəmbərin səsini arxa tərəfdən eşidirdilər. Arxaya dönəndə yenə dübarə arxa tərəfdən səs gəlirdi. Nəticədə məyus olub qayıtdılar. Həmçinin Əbu Ləhəbin arvadı Peyğəmbərə əzab və əziyyət vermək üçün gələndə :Peyğəmbəri görmədi. Bu ayədə bu məsələyə işarə olunur

Sən Quran oxuyanda səninlə axirətə iman gətirməyənlərin arasında hicab qərar“ ”.verərik

Qısa şəkildə Allah tərəfindən göndərilən qoruq və keşik o Həzrəti qan içən fir”onçuların şərrindən xilas edirdi. Elə kəslərdən ki, adam öldürmək onlar üçün heç də çətin bir iş deyildi. Heç nəyin hörmətini saxlamırdılar. Biz qeyd etdiyimiz nümunələrlə .kifayətlənirik

Bir dəfə Əbu Cəhl bir daşı qaldırıb Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-in başına çırpmaq istədi. Həzrət namaz halında idi. Bu halda daş Əbu Cəhlin bədəninə yapışdı. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-i köməyə çağırdı. Dua etdi və daş onun əlindən çıxıb yerə düşdü. Dərhal dedi. Qəribə sehrdir. Yenidən başqa bir daşı götürüb başına qoydu ki, Peyğəmbəri öldürsün. Daş deşilib onun boynuna keçdi. Yenə də ağır bir daşı götürüb Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-ə tərəf gəldi ki, onu qətlə yetirsin. O Həzrətə çatanda bədəni titrəməyə başladı və geri qayıtdı. Ondan bunun səbəbini soruşanda dedi:-"Bir neçə kişini gördüm ki, Həzrətin ətrafını "tutmuşdular. Əgər bir az qabağa hərəkət etsəydim məni məhv edərdilər

Bəzən Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-i fiziki cəhətdən məhv etmək üçün sehrkarlardan və kahinlərdən istifadə edirdilər. Cəbrail gəlib həmin şeyi ona xəbər verirdi. Əmirəl-möminin əleyhis-salam onların tilsimlərini batil edirdi. Bədnəzərləri gətirirdilər ki, Peyğəmbəri öldürsünlər. Bəzən də zəhərlə onu həlak etmək istəyirdilər. "Ühüd" müharibəsində müşriklərin qılınc vuran cəngavərləri Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-ə hücum etdilər. Həzrət yaralandı və .daşın üstünə düşdü. Allah-Taala onu hifz etdi

Biə"yünina" cümləsində daha bir incəlik məlum olur. O da bundan ibarətdir ki, səbrin" Peyğəmbər üçün asan olması Həzrətin Allaha olan məhəbbətinin artıq olmasından irəli gəlirdi. Yəni, Allah-Taala buyurur ki, ey Mühəmməd, Bizim təyin etdiyimiz müqəddərat qarşısında səbr etməlisən. Çünki, sən Bizim nəzarətimiz altındasan. Sən bizim sevimlimiz və məhbubumuzsan. Hər mühibb (sevən), məhbubun yolunda bütün cəfalara, rəva görülən zülmlərə dözməlidir. Tam qüvvətlə, cani-dildən səbrli olmalıdır. Çünki, məhəbbətin xüsusiyyətindən biri budur ki, əgər bir şəxs müəyyən bir şeyə məhəbbət göstərsə, onun yolunda hər müsibət asan olar. Məsələn, görün ana öz .övladı yolunda nə qədər əzab-əziyyətlərə qatlaşır

səh:۱۳۶

Yaxud, pulu sevən, pulpərəst insanlar onu əldə etmək yolunda nə qədər müşküllərə, .əzab-əziyyətə qatlaşırlar

Böyük alimlərdən biri deyir: “Bir yerdən keçəndə gördüm ki, bir nəfəri uzadıb şallaq vururlar. O da heç nə demir. Fəryad etmir. Sonradan bu işin səbəbini soruşanda dedi: Həmin vaxt gözüm dostuma düşdü. Dostla görüş o qədər məni cəzb etdi ki, vurulan ”.şallaqların əziyyətini, ağrısını hiss etmirdim

”.Təsbih de öz Allahına, Rəbbinə, ayaq üstə olduğun halda“

Bəndənin işi həm Pərvərdigarına həmd-səna demək, ne”mətlərinin şükrünü yerinə yetirməkdir. Allahın işi isə öz bəndəsini tərbiyə etmək, ruzusini vermək, onun işlərini idarə edib, qorumaqdır. Deməli, təsbih və təmhidin mənası burada aydınlaşdırılmalıdır. “Sübhanəllah”ın mənası budur ki, Pərvərdigarı hər eyb və nöqsandan, zati və sifət fe”llərində bütün nöqsanlardan pak və münəzzəh bilirəm. Yəni, Onun Müqəddəs Zatı əzəli və əbədidir. Onun varlığı zatının eynidir. Bütün varlıqlara varlıq bağışlayandır. Həmçinin, bir neçə şeydən tərkib tapıb mürəkkəb olmamışdır. Cisim deyil. Elə bu səbəbdən də gözlə görünmür. Şəriki yoxdur. Yerə, məkana ehtiyacı yoxdur. Heç bir varlığa ehtiyacı yoxdur. Əksinə, bütün varlıqlar ona ehtiyaclıdır. Sifətlərində təsbih demək bundan ibarətdir ki, hamısı elm və qüdrətə qayıdan bütün kamal sifətlərinin həddi-hüdudu yoxdur, sonsuzdur. Bu sonsuz elm və bacarıq onun zavala uğramayan eyni ilə eyniyyət təşkil edir. Yəni, Onun zatına artırılmış deyil. Bu sifətləri heç kəs Ona .verməmiş, əksinə o bütün kainata varlıq və elm bağışlayandır

”.La hövlə və la qüvvətə illa billah“

Amma, Allahın fe”llərində təqdis etmək bu deməkdir ki, bütün yaranışlar Allahın hikməti ilə əhatə olunmuşdur, Allahın məqsədyönlü əməlləridir. Heç nə boş, əbəs yerə yaradılmayıb. Həmçinin, Onun müqəddəs zatı və sifətləri həddindən artıq pak və uca məqamlıdır. Heç vaxt məxluqatın dərk və düşüncə qüvvəsi onu dərk etməyə, .qavramağa çatmaz

Haqq-Taalanı həqiqətdə olduğu kimi təsbih və münəzzəh bilmək ən bilikli fərdlərin :öhdəsindən gəlməz. Buna görə də deyilməlidir ki

Təhmid-yəni, bütün xeyirləri və ne"mətləri Allahdan bilib, Allahı mədh və sə"naya, ,tərifə layiq olan yeganə şəxs kimi bilməliyik. Hətta

.bəzi məxluqların vasitəsilə zahir olan xeyir işlər də yenə Allaha qayıdır

Sizə çatan hər bir ne”mət Allah tərəfindəndir. Onun camalı, xeyir və ne”mətləri“ həddindən artıq çox olduğuna görə, Allahı həmd və mədh etməkdə məxluqatlar içində ən bilikli və ən bacarıqlı fərdlərin öhdəsindən xaricdir. Rəsuli Əkrəm Allaha dua edərək :ərz edir ki

İlahi, Pərvərdigara mən Sənin həmd və sənanı sayıb qurtara bilmərəm. Amma Sən“ ”.onları saymısan

:Doğrudan da demək lazımdır ki

Bilmək lazımdır ki, Allahı təsbih və həmd etmək bəzi vaxtlarda bəyənilən və müstəhəb, bəzi hallarada isə vacib olur. Vacib olan hal, namazın səcdə və rukusundadır. “Hiynə təqumu” cümləsində də məqsəd bu ola bilər. Yəni, sən namaza qalxanda Allaha təsbih və həmd et! Daha çox təkid olunmuş müstəhəb yer də bu ayənin işarə etdiyi kimi, bir neçə yerdə ola bilər ki, çoxlu xüsusiyyətlərə malikdir. Bu barədə də Həzrəti Mühəmməd səlləllahu əleyhi və alihi və səlləm-ə iqtida etmək lazımdır. O cümlədən də gecə namazı üçün yuxudan oyananda da həmd etmək. Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm hər vaxt yuxudan ayılanda on dəfə “Allahu əkbər”, on dəfə “sübhanəllah”, on dəfə “ia ilahə illəllah”, on dəfə “əlhəmdülillah”, on dəfə “əstəğfirullah” deyərdi. Çünki, insan yatanda sanki ölür, oyananda isə yenidən həyata qayıdır. Çox hallar olmuşdur ki, insanlar yuxu halında canlarını tapşırmışlar. Qurani-Məcid :buyurmuşdur

Bir kəsin əcəli yuxuda müqəddər olunubsa, canı elə həmin halda alınır. Amma ölüm vaxtı gəlib çatmayanların canı bədənlərinə yenidən qaytarılır. Buradan məlum olur ki, Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm hər vaxt gecə yuxudan ayılanda səcdə :edir və bu duanı oxuyurdu

Həmd olsun Allaha ki, məni öldükdən sonra yenidən diriltdi. Məxluqatın qayıdışı ona“ tərəfdir. Həmd olsun O Allaha ki, mənim ruhumu bədənimə qaytardı ki, Ona həmd ”.edim və ona pərəstiş edim

Şeyx Bəhai "Miftahül-fəlah" kitabında buyurur: Bu duanı yuxudan durandan sonra ".oxumaq müstəhəbdir. İstər səcdədə olsun, istərsə də başqa hallarda

Əmr olunmuş təsbih və təmhidin başqa bir növü də bəlkə də şərif ayənin işarə etdiyi kimi, namaza başlamamışdan əvvəldir. Namazdan

:qabaq oxunmalı olan və təsbihə şamil olan dualar çoxdur. O cümlədən aşağıdakı dua

Hiynə təqumu” cümləsinin bir mənası da insanın oturduğu yerdən qalxan zaman“ təsbih və həmd deməsidir. İstər o məclis Allahın zikr olunduğu məclis olsun, istərsə də .zikr olunmadan başqa sözlərlə məşğul olan məclis

## FÜZEYL VƏ QONAQLARIN SöHBƏTİ

Füzeyl ibni Əyazın həyatından yazıblar ki, Möminlərdən biri onun görüşünə gedir. Bir saat onunla birlikdə oturur. Bu bir saatda bir neçə müxtəlif hekayə danışırlar. Getmək istəyəndə deyir: “Allaha şükür olsun ki, xoş bir məclis oldu.” Füzeyl deyir: “Yox, məclis əsla xoş deyildi! Bu bir saatlıq məclisdə sən çalışırdın ki, mənim xoşuma gələn sözlər danışasan, mən də çalışırdım ki, sənin xoşuna gələn sözlər danışım. Heç fikrimizə ”?gətirdikmi ki, Allah hazır və nazirdir, elə bir iş görək ki, Allah bizdən razı olsun

Hər vaxt bir şəxs Füzeylin yanına gəlirdisə, vəhşət hissi keçirirdi. İmam Sadiq əleyhis-:salam buyurur

Hər məclisdə ki, yaxşı və pis insanlar bir yerə yığışıb Allahın zikrini deməsələr,“ Peyğəmbərə salavat göndərməsələr, hökmən o məclis Qiyamət günü onlar üçün ”.həsrət və bəla olacaqdır

Həzrət Rəsul səlləllahu əleyhi və alihi və səlləm-dən rəvayət olunub ki: “Hər kəsin məclisi uzun olsa, (əlbəttə, qeybət, töhmət, artıq danışıq olmayan, başqalarının hörmətinin aradan getməsinə səbəb olmayan) məclisdən qalxıb dağılışanda “subhanəllahi, Allahummə bi həmdikə. Əşhədu ənla ilahə illəllah, əstəğfirukə və ətubu iləyk” desə, bu təsbih həmin məclisin kəffarəsidir. Başqa bir rəvayətdə gəlib ki, :məclisdən qalxanda bu zikri oxusunlar

bu halda əgər məclis xeyir məclisi olmuşsa, onda savabı daha da artacaqdır; yox əgər şər məclisi olmuşsa, həmin təsbih onun kəffarəsi olacaq. Başqa bir rəvayətdə gəlib ki, mübarək “Saffat” surəsinin axırıncı üç ayəsini oxusalar, həmin məclisin kəffarəsi .olacaqdır

Üddətüd-dai” kitabında rəvayət olunub ki, Rəsuli Əkrəm bağda xurma əkən bir kişinin“ yanından keçəndə buyurdu: “İstəyirsənmi səni kökü sair bütün ağaclardan daha davamlı və daha möhkəm, meyvəsi sair ağacların meyvələrindən daha pak və pakizə, başqa ağaclardan daha tez yetişən və onlardan daha çox əbədi qalan bir ağaca tərəf hidayət edim?” Kişi “Bəli ya Rəsuləllah” deyə cavab verdi. Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurdu: “Hər sübh və axşam

Həmin kitabda nəql olunub ki, Allah-Taala Süleyman peyğəmbəri insanların və cinlərin hakimi etmişdi. Cinlər onun üçün ipəkdən eni və uzunu ٢ fərsəx olan bir xalça toxumuşdular. Süleyman peyğəmbərin minbərinin ətrafında altı yüz min kürsü qurulmuşdu ki, onların üstündə peyğəmbərlər və alimlər əyləşirdi. Onların arxasında insanlar, onların da arxasında cinlər əyləşirdi. Quşlar öz qanadları ilə onların üstünə kölgə salırdı. Səba yeli o həzrətin taxt-tacını yerdən qaldırırdı. Bir aylıq yolu bir gündə keçirdilər. Allah küləyə əmr etmişdi ki, bütün səsləri onun qulağına çatdırsın. Günlərin birində külək Süleyman peyğəmbərin səltənət taxtını havada hərəkət etdirəndə bir kəndli bunu görüb dedi: Allah Davudun oğluna (yəni Süleyman peyğəmbərə) mülk əta etmişdir. Külək bu sözü Süleyman peyğəmbərin qulağına çatdırdı. O, elə oradaca yerə enib kəndliyə tərəf getdi və buyurdu: Sənin yanına gəlmişəm ki, qüdrətin çatmadığı şeyi arzu edəsən. Sonra buyurdu: Allahın qəbul etdiyi bir təsbih Davudun oğluna verdiyindən qat-qat yaxşıdır. Çünki təsbihin savabı əbədi olaraq qalır, bu mülk isə fani olub gedir... Bəli, həmin səbəbə görə də Süleyman peyğəmbər öz qəsrinin damında əsaya söykənən halda öz mülkünə tamaşa edirdi. Birdən ölüm mələyi Əzrail gəlib onun aşağıya düşməsinə möhlət vermədən canını aldı. Uzunu müddət bədəni elə əsaya söykənmiş halda qaldı. İnsanlar və cinlər onun diri olduğunu güman edərək yaxınlaşmağa cür”ət etmədilər. Nəhayət qurdlar əsanını iç tərəfdən yedilər. Onun cansız bədəni yerə düşdü. Süleyman peyğəmbərin padşahlığının axırı budur. Deməli aqil insan

əbədi, qalarlı həyatın fikrində olmalıdır. Ona da çatmağın yeganə yolu iman və saleh .əməldir

Həmçinin, "İddətud-dai" kitabında Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm-dən nəql olunubdur ki, həzrət səhabələrə buyurdu: "Sizə dildə tələffüzü asan, əməl mizanında dəyərli, Rəhman Allahı xoşhal edən, şeytanı uzaqlaşdıran, behiştin xəzinələri olan beş kəlməni öyrədimmi?" Dedilər: "Əlbəttə, ya Rəsuləllah!" Həzrət :buyurdu

Subhanəllahi vəl-həmdu lillahi və la ilahə illəllahu vəllahu əkbər və la hovlə və la" ."qüvvətə illa billahil-əliyyil-əzim

Başqa bir rəvayətdə Həzrət Peyğəmbər səlləllahu əleyhi və alihi və səlləm buyurur: "Me"rac gecəsi bir behiştə daxil oldum, orada müşkdən olan bir səhra gördüm. Məlaikələr orada imarətlər tikirdilər. Kərpicləri qızıl-gümüşdən idi. Arada bəzən dayanırdılar. Mən onlardan soruşdum ki, "siz nə üçün arada bəzən dayanır və sonra işi davam etdirirsiniz?" Dedilər ki, biz nəfəqə gözləyirik. Dedim ki, nəfəqə nə deməkdir? Dedilər ki, Möminin "Subhanəllahi vəlhəmdu lillahi və la ilahə illəllahu vəllahu əkbər" deməsidir. Bunların əsli və kökü yerdə, budaqları isə asimanlardadır. Bu kəlmələr insanı asimani bəlalardan, ağır ölümdən, uçurumun altında qalmaqdan qoruyub hifz .edirlər. Bu kəlmələr insanın həmişəlik qalan saleh əməlləridir

Diqqət yetirilməlidir ki, bu kəlmələrin savabını əldə edib onlardan faydalanmaq o halda mümkün ola bilər ki, gələcəkdə Allahın və Peyğəmbərin əmrindən boyun qaçırmasın, günah etməklə onları puça çıxartmasın. Peyğəmbərdən rəvayət olunub ki, hər kəs bir dəfə "subhanəllah" desə, cənnətdə onun üçün bir ağac əkilir. Hər kəs "əlhəmdu lillah" desə, onun üçün cənnətdə bir ağac əkilir. Hər kəs "la ilahə illəllah" desə, onun üçün cənnətdə bir ağac əkilir. Hər kəs "Allahu əkbər" desə, onun üçün cənnətdə bir ağac əkilir." Qüreyşdən bir kişi dedi: "Onda bizim behiştdəki ağaclarımız nə çoxdur!" Həzrət buyurdu: "Bəli, amma ehtiyatlı olun ki, od parçası göndərib onları yandırmayasınız. Bu :həmin Allahın kəlamıdır ki, buyurur

Ey iman gətirənlər, Allaha itaət edin, Onun Rəsuluna itaət edin və (Allahın əmrlərindən" ".boyun qaçırmaqla) öz əməllərinizi batil (puç) etməyin

Gecənin bir qismində Ona (Allaha) təsbih de və namaz qıl, Allahı yad et, ulduzların“
”.qayıtdığı vaxt, fəcrin açıldığı zaman–gündüz olanda

Bu ayədə Allahı zikr etməyin mühüm olan və buna da əmr olunan iki yeri bəyan edir və buyurur ki, birincisi gecənin bir qismidir. Həzrət İmam Baqir və İmam Sadiq əleyhissalam-dan nəql olunub ki, səhər vaxtı dedikdə, məqsəd gecənin axırıncı üçdə bir hissəsi nəzərdə tutulur. Həmin vaxtda təsbih deməkdən məqsəd, on bir rəkətdən ibarət olan gecə namazıdır. Onlardan dörd dənə iki rəkətli namaz gecə namazı, iki rəkəti şəf” və bir rəkəti vətr namazı niyyəti ilə qılınmalıdır. Ayədəki “İdbarənnəhar”dan məqsəd sübhün iki rəkət nafiləsi və iki rəkət sübh namazının özüdür. Bəzi müfəssirlər də demişlər ki, bu şərif ayə zikrin davamlı olmasına işarədir. Yəni yuxudan ayılandan gecə yatan vaxta qədər hər bir halda və zamanda Allahı yad et. Çünki Allah bir an belə
səndən qafil qalmır və daimi olaraq sənin keşikçindir. Və bəlkə də

ayəsi məhz həmin mənaya dəlalət edir. Lakin bu ayənin zahiri Allah zikrinin zikr olunduğu vaxtlardakı xüsusiyyətlərinə işarədir. Xüsusilə sair ayələrin də işarə etdiyi
...kimi, səhər çağlarında istiğfar edənlər

Rəsuli Əkrəmin Besətinin əvvəllərində gecə namazı qılmaq onun əhəmiyyətinə görə bütün müsəlmanlara vacib idi. Sonradan müsəlmanlara asan olsun deyə, müstəhəb edildi və “Müzzəmmil” surəsində bəyan olunduğu kimi, yalnız Rəsuli Əkrəm səlləllahu əleyhi və alihi və səlləm-ə vacib oldu. Hər hansı çətinlikdə, məşəqqətdə olmayan hər bir müsəlmana layiqdir ki, gecə namazını tərk etməsin və özünü bu böyük səadətdən məhrum etməsin. Məhz bu səbəbdən də bəzi rəvayətlərdə Əli əleyhissalam-ın şiələri
.olmağın əlaməti gecə namazına durmaq kimi təbir olunmuşdur

### ƏLİ əleyhissalam–IN BƏYANINDA ŞİƏLƏRİN NİŞANƏLƏRİ

Əmirəl-Möminin Əliyyibni Əbitalib əleyhissalam Əhnəf ibni Qeys üçün öz şiələrinin əlamətlərini bəyan edərək buyurdu ki, “...onların qədəmləri gecə namazına duran, rüku və səcdə halında əyilənlərdir; Quran oxuyurlar, onların Allahın xovfundan
”...etdikləri ah-nalələri ucalar

Burada bir hədislə kifayətlənirik: Əli əleyhissalam bir aylı gecədə camat namazını qılıb qurtarandan sonra məsciddən çölə çıxdı. Səhabələrindən bir dəstəsi onun ardınca gəlirdilər. Həzrət soruşdu ki, siz kimsiniz? Ərz etdilər ki, biz sənin şiələrinik. Buyurdu: “Mən şiələrin əlamətlərini sizlərdə görmürəm.” Ərz etdilər ki, şiələrin əlamətləri hansılardır? Buyurdu: “Bizim şiələrimiz o kəslərdir ki, gecələr oyaq qalmaq nəticəsində üzləri saralar, zəifləyər, ağlamaq nəticəsində gözlərinin nuru azalar, qarınları oruc tutmaq nəticəsində arxaya çəkilmiş, kürəkləri rüku və səcdə etməkdən əyilmiş olar, ağızları çox dua oxumaq nəticəsində qurumuşdur. Budur Əhli-beyt əleyhissalam-ın ”!şiələrinin sifətləri

## GECƏ NAMAZI QILMAĞIN DÜNYƏVİ FAYDALARI

İmam Həsən Əsgəri əleyhissalam İbni Babəveyh Qumiyə yazdığı bir məktubda ona üç .(dəfə gecə namazı qılmağı tövsiyə edir. (Ələykə bisəlatilləyli

İndi isə nümunə üçün gecə namazının bir neçə dünyəvi və bir neçə axirət faydalarını :qeyd edirik

Gecənin axır vaxtlarında yuxudan durub gecə namazı qılmaq cismi sağlamlığa səbəb olur. Həzrət Əli əleyhissalam-dan rəvayət olunub ki, “Hər kəs çox yatsa, xüsusilə də ”.sübh vaxtı, bədənində ağırlıq və kəsalət olar

Gecə namazı gözün nurunu artırır, ruzini bol edir, məhəbbətə səbəb olur. Bir hədisdə buyurulur ki, bir qadın Həzrət İmam Sadiq əleyhissalam-ın yanına gəlib dedi: Ey Peyğəmbərin övladı, ərim məni çox istəmir, mən nə edim? Həzrət buyurdu: Get gecə namazı qıl. O qadın bir müddətdən sonra yenidən həzrətin hüzuruna gəlib təşəkkür .edərək dedi ki, o vaxtdan bəri ərim məni istədiyi qədər heç kəsi istəmir

Həzrət buyurdu ki, Allah rəhmət eləsin o qadına ki, gecə namazına durub ərini də namaza oyatsın, həmçinin, Allah rəhmət eləsin o kişiyə ki, özü gecə namazına qalxıb .arvadını da namaz üçün oyatsın

## GECƏ NAMAZININ AXİRƏT FAYDALARI

Allah taala gecə namazı qılan şəxslərlə iftixar edir. Gecə namazı qəbirdə, Siratda,

namazı qılanlardan razıdır, onları elə bir məqama çatdırar ki, bu əməli yerinə yetirmədən bir kəs həmin məqama çata bilməz. Zəhmət çəkmədən xəzinə tapmaq .olmaz, sə"y edib çalışanlar muzd ala bilər

## MƏRHUM MÜQƏDDƏS ƏRDƏBİLİNİN ÇATDIĞI YÜKSƏK MƏQAMLAR GECƏ NAMIZININ BƏRƏKƏTİNDƏN İDİ

Müqəddəs Ərdəbili Həzrət İmam Zaman əleyhissalam-ın hüzuruna dəfələrlə çatmışdı, həzrət İmam Əli əleyhissalam-ın qəbri üzərində o həzrətlə danışırdı. Onun özündən bu yüksək mənəvi dərəcələrə çatmağın səbəbi barədə nəql olunub ki, təhsilinin əvvəllərində bir tələbə ilə bir hücrədə qalırdım. Onunla sözləşib əhd bağladıq ki, bizim üçün hər nə baş versə, bir kəsə açıb deməyək. Nəhayət bir zaman oldu ki, heç nəyimiz olmadı, dostum aclıq nəticəsində çox zəiflədi, əhd bağladığımız üçün bunu heç kəsə açıb demirdi. Bir gün bir nəfər mədrəsəyə gəlib dostumun zəifləməsinin səbəbini (mən orada olmadığım halda) onun özündən soruşub. O, əvvəldə heç nə deməmişdi, amma onu and verdikdən sonra işin həqiqətini açır və deyir ki, aclığın və yoxsulluğun .şiddətindən mən və dostum belə arıqlayıb zəifləmişik

O şəxs dərhal hər ikisi üçün təam gətirib bir kisə də pul verir. Molla Əhməd (Müqəddəs Ərdəbili) gələndə hal-əhvaldan xəbərdar olur və dostuna e"tiraz edir ki, nə üçün açıb demisən, məgər əhd bağlamamışdıq? Xülasə, yeməyi bir yerdə yeyib pulları da yarıya .bölürlər

Müqəddəs Ərdəbili yatıb gecə yarısı oyanır görür ki, boynuna qusul düşmüşdür. Hamama gedir ki, qüsl etsin. Hamamçı qapını içəridən bağlayıb açmır. Müqəddəs Ərdəbili nə qədər israr edirsə hamamçı qapını açmır ki, açmır. Deyir ki, pulunu iki qat artıqlaması ilə verəcəyəm. Yenə də açmır, nəhayət pullarının hamısını verməyə .razılaşır ki, təki qusl alıb gecə namazını əldən verməsin

Həmin gecədən Allah taala ona xas bir lütf inayət edir və ondan cürbəcür kəramətlər .görünməyə başlayır

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ٩

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ٢٠٠۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.١

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.٢ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .٣ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.١

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik


:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹